**HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR**
**HUMANITIES AND SOCIAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2789-6919/45/8-10

**Həcər Hüseynova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
filologiya üzrə elmlər doktoru
https://orcid.org/0000-0002-3223-427X
hacerhuseynova@mail.ru

# Sifətin dərəcələri tarixi inkişafda

**Xülasə**

Dilin tarixi xalqın tarixidir. Bir xalqın tarixini, uzaq keçmişini öyrənmək üçün mütləq onun dilinə, qədim şifahi və yazılı abidələrinə müraciət etmək lazım gəlir. Azərbaycan dilinin də tarixi onun yazılarında daşlaşmış sözlərdə yaşayır. Azərbaycan dili zəngin leksik, morfoloji, sintaktik quruluşa malikdir. Sifətlərin tarixi inkişafı, dərəcələrin tarixən keçdiyi yol, dəyişmələr dilimizdə tarixən sifətlərin, onun dərəcələrinin zəginliyindən xəbər verir. Sifətin tarixi inkişafını izləyərkən müşahidə edirik ki, qədim türk dilində rəng anlamlı bir sıra sözlər, həm də cəhət mənasında işlənmişdir: ağ və sarı cənub; qara şimal; qızıl (qırmızı) qərb; göy şərq. Qara, qırmızı, göy, ağ, sarı türk mənşəli bəzi sifətlər ilkin mənasını itirərək yeni məna qazanmışdır. Məsələn, qızıl sözü yazılı abidələrimizdə daha çox qırmızı mənasında işlənmişdir.

Bunu biz bir neçə dilçi-alimin müqayisələrində müşahidə edə bilərik. Məqalədə Ə.Dəmirçizadənin, M.Şirəliyevin, H.Mirzəzadənin, S.Cəfərovun, M.Hüseynzadənin, B.Xəlilovun və b. fikirlərinə, əsərlərinə müraciət edilmiş, müqayisələr aparılmışdır.

***Açar sözlər:*** *dil, xalq, dəyər, tarix, inkişaf, müqayisə*

**Hajar Huseynova**
Azerbaijan State Pedagogical University
Doctor of Philology
https://orcid.org/0000-0002-3223-427X
hacerhuseynova@mail.ru

# Degrees of Adjectives in Historical Development

**Abstract**

The history of language is the history of the people. In order to study the history and distant past of a people, it is necessary to turn to its language, ancient oral and written monuments. The history of the Azerbaijani language also lives in the words that have become fossilized in its writings. The Azerbaijani language has a rich lexical, morphological, and syntactic structure. The historical development of adjectives, the path that degrees have historically taken, and the changes that have occurred in our language indicate the historical richness of adjectives and their degrees. While following the historical development of the adjective, we observe that in the ancient Turkic language, a number of words with color meaning were used, as well as in the sense of aspect: white and yellow south; black north; gold (red) west; blue east. Some adjectives of Turkish origin, black, red, blue, white, yellow, have lost their original meaning and gained new meanings. For example, the word gold is used more often in the sense of red in our written monuments.

 

We can observe this in the comparisons of several linguists-scholars. The article refers to the ideas and works of A.Demirchizadeh, M.Shiraliyev, H.Mirzazadeh, S.Jafarov, M.Huseynzadeh B.Khalilov, etc., and makes comparisons.

***Keywords:*** *language, people, value, history, development, comparison*

## Giriş

Sifətin tarixi inkişafını izləyərkən müşahidə edirik ki, qədim türk dilində rəng anlamlı bir sıra sözlər, həm də cəhət mənasında işlənmişdir: ağ və sarı cənub; qara şimal; qızıl (qırmızı) qərb; göy şərq.

Qara, qırmızı, göy, ağ, sarı türk mənşəli bəzi sifətlər ilkin mənasını itirərək yeni məna qazanmışdır. Məsələn, qızıl sözü yazılı abidələrimizdə daha çox qırmızı mənasında işlənmişdir: Bir yerə ağ otağ, bir yerə qızıl otağ, bir yerə qara otağ qurdırmışdı (Kitabi Dədə-Qorqud dastanı).

Müasir ədəbi dilimizdə isə "qızıl" sözü "qiymətli metal, altun" mənasındadır. Yəni qırmızı anlamlı qızıl sözü müasir dilimizdə yalnız bəzi söz və ifadələrin daxilində mühafizə olunur: Qızıl meydan, qızılgül, qızıləhmədi (alma növü).

Müasir türk dillərində isə qırmızı mənasında məhz "qızıl" sözü işlənir. Bəzi sifətlərin ilkin mənalarından uzaqlaşaraq tam mənfi mənalı sözlərə çevrilməsi müşahidə olunur. Məsələn: tarixən igid mənasında işlənən dəli və qoçu sözləri müasir dilimizdə mənfi mənadadır: dəli- ruhi xəstə; qoçu- yol kəsən qoluzorlu (Kaşğari, 2006).

**Tədqiqat**

Azərbaycan dilçiliyində sifətin dərəcələri ilə bağlı müxtəlif fikirlərə rast gəlinir: 1920-ci ilə qədər müqayisə, kiçiltmə, üstünlük; Ə.Dəmirçizadə "adi, kiçiltmə, müqayisə, şiddətləndirmə" (Dəmirçizadə, 1947); S.Cəfərov, O.Abbasov "adi, kiçiltmə, müqayisə, üstünlük, şiddətləndirmə" (Azərbaycan dilinin qrammatikası, 1945); Dəmirçizadə "adi, azaltma, çoxaltma" (Dəmirçizadə, 1947); M.Hüseynzadə "adi, müqayisə, üstünlük, şiddətləndirmə, kiçiltmə, çoxaltma" (Hüseynzadə, 2007); S.Cəfərov "adi, azaltma, çoxaltma" (Cəfərov, 1963); Y.Seyidov "adi, azaltma, çoxaltma" (Seyidov, 2006) dərəcələrini qeyd etmişlər.

Ə.Tanrıverdi isə Azərbaycan dilinin tarixi qrammatikası kitabında bildirmişdir ki, əlamət və keyfiyyət normal dərəcədə, yəni adi halda, eləcə də normadan az və normadan çox ola bilər (Tanrıverdi, 2017). Bu mənada sifətin adi, azaltma və çoxaltma dərəcələrindən bəhs etmək daha doğrudur.

Həmçinin, B.Xəlilov Müasir Azərbaycan dilinin morfologiyası kitabında sifətin dərəcələri haqqında aşağıdakı bölgülərin olduğunu vurğulamışdı. 1924-cü ildə çıxan qrammatika kitablarında sifətin dərəcələri ərəb dilində olan terminlərlə verilmiş və yeddi növə bölünmüşdür (Dəmirçizadə, 1965).

1938-ci ildə nəşr edilmiş məktəb qrammatikalarında beş dərəcəsi (adi, kiçiltmə, müqayisə, üstünlük, şiddətləndirmə); 1945-ci ildə bəzi dəyişikliklərlə yenə beş dərəcəsi (adi, kiçiltmə, müqayisə, üstünlük, şiddətləndirmə) göstərilmişdir.

1948-ci ilə qədər yazılmış dərsliklərdə sifətin beş dərəcəsi verilmişdir 1) adi, 2) kiçiltmə, 3) müqayisə, 4) üstünlük, 5) şiddətləndirici.

Çoxaltma dərəcəsində əlamət adi dərəcədən üstün, çox olur. Bu dərəcə üstünlük və şiddətləndirmə növlərini özündə birləşdirir. 1) Üstünlük növü analitik yolla formalaşır. Buna sintaktik üsulla sifətin dərəcəsinin yaranması da deyilir. Burada ən, lap, çox olduqca, daha sözlərindən istifadə olunur. Məs.: ən gözəl, lap gözəl, çox gözəl, daha gözəl və s.

2) Şiddətləndirmə növünü bildirmək üçün m, p, r, s samitlərində biri sifətin ilk hecasındakı saitin sonuna əlavə olunur. Məs: qıpqırmızı, gömgöy, qapqara, tərtəmiz, dopdoğma, yamyaşıl, dosdoğma və s. Sifətin çoxaltma dərəcəsinin yaranması üsullarından biri də eyni sifətin təkrarı və sifətlə müvafiq əşyanın müqayisə olunmasıdır. Bu belə qaydalar üzrə özünü göstərir:

a) təkrar olunan sifətlərdən birincisi ismin çıxışlıq halında olur: ucadan uca, gözəldən gözəl, yaxşıdan yaxşı və s.

b) eyni sifətin təkrar ilə: uca-uca (dağlar), böyük-böyük (dərd), dərin-dərin (dərələr), sərin- sərin (bulaqlar) və s.

c) birinci tərəf çıxışlıq halında olan isimdən, ikinci tərəf sadə sifətdən ibarət olur: süddən ağ, lalədən qırmızı, dəmirdən möhkəm, bıçaqdan iti və s.

Sifətin azaltma dərəcəsi əlamətin adi dərəcədən az olduğunu bildirir. Azaltma dərəcəsi iki yolla yaranır: 1) Sintetik yol 2) Analitik yol.

Qeyd:Analitik yolla yaranan sifətlərin qaydasında sifətin sonuna məzə sözünün artırılması:turşməzə (Dəmirçizadə, 1965).

M.Şirəliyev Azərbaycan dialektologiyasının əsasları kitabında sifətin dörd dərəcəsini göstərmişdir: adi, kiçiltmə, müqayisə, üstünlük. Müqayisə dərəcəsi şəkilçisi olan -rax // -rağ, -rək // -rax` (Tanrıverdi, 2017).

Dədə Qorqud dastanlarından başlamış, XX əsrin əvvəllərinə kimi ədəbi dilimizdə işlənmişdir. Müqayisə dərəcəsinin – rax, -rək şəkilçisi daha çox qərb dialekt və şivələrində saxlanılmışdır. Burada rax, rəx' şəkilçiləri ilə yanaşı, - tarax, - tərəx' şəkilçiləri də işlənir. Məs: qararax, sarırax, köhnərəx', şirinrəx' və s. (Qazax). Müasir ədəbi dilimizdə iki sözdə müqayisə dərəcəsinin şəkilçisini görmək olar: yaxşıraq, gödərək. Ədəbi dilimizdə müqayisə dərəcəsi əsasən sintaktik yolla ifadə olunur. Belə hallarda müqayisə olunan əşya ismin çıxışlıq halında, sifət isə adi dərəcədə olur; məs: Bu dağ dağdan ucadır. H.Mirzəzadənin fikrincə, -şın, -ımtıl, -sov morfoloji əlamətlərə yazılı abidələrimizin dilində rast gəlinmir, həm də nisbətən sonralar normalaşmışdır. Müəllifin ehtimalları -şın şəkilçisinə aid edilə bilməz (Mirzəzadə, 1990). Çünki M.Kaşğarinin "Divan"ında (-şin) morfoloji əlamətinə rast gəlinir: kökşin nənq – göyümsov nəsnə. Yeri gəlmişkən, müasir Azərbaycan dilində bu şəkilçi işlənir. Müasir ədəbi dilimizdə işlənən dümağ, tünd-yaşıl, zil qara kimi sifətlər çoxaltma dərəcəsindədir. H.Mirzəzadəyə görə, düm və tünd kimi sözlər XIX əsrə qədərki yazılı abidələrimizin dilində " hələlik" nəzərə çarpmır. Qeyd edək ki, müasir ədəbi dilimizdəki "düm" morfemi M.Kaşğarinin "Divan"ında "tüm" şəklindədir: tüm kara at - dümqara, yəni zil qara at və s.

**Ədəbiyyat**

1. *Azərbaycan dilinin qrammatikası.* (1938). I hissə, EA nəşri.
2. *Azərbaycan dilinin qrammatikası.* (1945). I hissə, EA nəşri.
3. Cəfərov, S. (1963). *Azərbaycan dilinin qrammatikası*.
4. Dəmirçizadə, Ə. (1947). *Azərbaycan dilinə aid tədqiqlər*.
5. Dəmirçizadə, Ə. (1965). *Dilin lüğət tərkibi və qrammatik quruluşu*.
6. Fərəcov, Ə. (1967). *Qrammatik məfhumların mənimsənilməsi*. Maarif.
7. Hüseynzadə, M. (2007). *Müasir Azərbaycan dili. Morfologiya*.
8. Xəlilov, B. (2000). *Müasir Azərbaycan dilinin morfologiyası.*
9. Kaşğari, M. (2006). *Divanü lüğat-it-türk. Dörd clddə, IV cild*. Ozan.
10. Mirzəzadə, H. (1990). *Azərbaycan dilinin tarixi qrammatikası*
11. Seyidov, Y. (2006). *Azərbaycan dilinin qrammatikası. Morfologiya.*
12. Şirəliyev, M. (1962). *Azərbaycan dilinin dialektologiyası.*
13. Tanrıverdi, Ə. (2017). *Azərbaycan dilinin tarixi qrammatikası.*

Daxil oldu: 05.02.2025
Qəbul edildi: 14.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/11-16

**Sahil Hüseynov**
Milli Aviasiya Akademiyası
hüquq üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0003-0732-7110
sahilhuseynov@naa.edu.az

# Dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının yaşayış məntəqələrinin idarə olunması üzrə qarşılıqlı münasibətlərinin hüquqi əsasları

## Xülasə

Məqalə yaşayış məntəqələrinin idarə olunması səlahiyyətlərinin həvalə olunduğu dövlət hakimiyyət orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı münasibətlərinin hüquqi əsaslarının qiymətləndirilməsi məsələlərinə həsr olunmuşdur. Dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin hüquqi əsaslarının tədqiqi göstərir ki, yaşayış məntəqələrinin idarə olunması üzrə dövlət hakimiyyəti orqanlarının və yerli icra hakimiyyətlərinin səlahiyyət sahələri fərqləndirilməlidir. Dövlət hakimiyyət orqanları ölkənin bütün ərazisində əhalinin həyat fəaliyyətinin təmin edilməsi üzrə ümumdövlət tədbirlərini həyata keçirirlər. Yerli icra hakimiyyətləri isə inzibati ərazidə yerli əhəmiyyətli məsələlərin həlli sahəsində idarəetmə funksiyalarını yerinə yetirirlər. Yerli hakimiyyət səlahiyyətlərinin müəyyən hissəsinin bələdiyyələrə həvalə olunmasının hüquqi cəhətdən əsaslandırılmasına ehtiyac vardır.

***Açar sözlər:*** *hakimiyyət, orqan, özünüidarə, konstitusiya, qanun, hüquq, norma, əsas*

**Sahil Huseynov**
National Aviation Academy
PhD in Law
https://orcid.org/0009-0003-0732-7110
sahilhuseynov@naa.edu.az

# Legal Basis of the Interrelations of State Authority Bodies and Local Self-government Bodies on the Management of Residential Areas

## Abstract

The article is devoted to the issues of assessing the legal basis of the mutual relations between state authorities and local self-government bodies, which are entrusted with the authority to manage settlements. The study of the legal basis of the mutual activities of state authorities and local self-government bodies shows that the areas of authority of state authorities and local executive authorities for the management of settlements should be differentiated. State authorities implement state-wide measures to ensure the vital activity of the population throughout the country. Local executive authorities, on the other hand, perform management functions in the field of resolving issues of local importance in the administrative territory. There is a need for legal justification for the delegation of a certain part of the powers of local authorities to municipalities.

***Keywords:*** *authority, organ , self-government, constitution, law, right, norm, basis*

## Giriş

Azərbaycan Respublikasında dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin tənzimlənməsi probleminin tədqiqinin Konstitusiyanın hakimiyyətin mənbəyi və xalqın suverenliyinə dair normaları əsasında aparılmasının məqsədəuyğunluğu qəbul

edilməlidir. Əsas Qanunun 1-ci maddəsinin I hissəsinə görə Azərbaycan Respublikasında dövlət hakimiyyətinin yeganə mənbəyinin Azərbaycan xalqı olması və 2-ci maddəsinin II hissəsində isə Azərbaycan xalqının suveren hüququnun bilavasitə ümumxalq səsverməsi – referendum və ümumi, bərabər və birbaşa seçki hüququ əsasında sərbəst, gizli və şəxsi səsvermə yolu ilə seçilmiş nümayəndələri vasitəsilə həyata keçirilməsini tənzimləyən normalar təsbit edilmişdir. Bu normaların məzmununun struktur təhlili əsasında Azərbaycan xalqının hakimiyyətinin birbaşa (referendum və seçkilər), dövlət hakimiyyəti orqanları və yerli özünüidarə orqanları vasitəsilə həyata keçirilməsini zənn etmək mümkündür.

Konstitusiyaya uyğun olaraq ölkənin idarə olunmasında real gücə malik olan dövlət hakimiyyəti orqanları və yerli özünüidarə orqanları xalqın və hər bir vətəndaşın rifahının yüksəldilməsi, onun sosial müdafiəsi, mədəniyyətin, təhsilin, səhiyyənin, elmin, incəsənətin inkişafının təmin edilməsi, təbiətin, xalqın tarixi, maddi və mənəvi irsinin qorunması üzrə ictimai-zəruri vəzifələri birlikdə yerinə yetirirlər. Göründüyü kimi, ölkənin idarə olunmasını təmin edən hakimiyyətin yeganə mənbəyi xalqdır və onun hakimiyyəti dövlətin suveren ərazisində dövlət hakimiyyəti orqanları və yerli özünüidarə orqanları tərəfindən həyata keçirilir. Belə olan halda ölkənin idarə olunması qarşısında dayanan ümummilli vəzifələrin və problemlərin Azərbaycan Respublikasının bütün ərazisində həllini təmin edən dövlət hakimiyyəti orqanları ilə yerli özünüidarə orqanları arasında qarşılıqlı fəaliyyətin tənzimlənməsinin konseptual əsaslarının yaradılması zərurətinin mövcudluğunu dərk etmək lazımdır.

**Tədqiqat**

Dövlət hakimiyyəti orqanları və yerli özünüidarə orqanları arasında qarşılıqlı fəaliyyət dedikdə, əhalinin həyat fəaliyyətinin təmin edilməsi üzrə ümumdövlət və yerli məsələlərin birgə həllinə yönəldilən təşkilati-hüquqi xarakterli tədbirlərin məcmusu nəzərdə tutulur. Qarşılıqlı fəaliyyət bütünlükdə ölkə üzrə deyil, inzibati ərazi vahidləri hüdudlarında həyata keçirilir. Bu fəaliyyətin tənzimlənməsi zəruriliyi 1995-ci ildə qəbul edilmiş müstəqil Azərbaycan Respublikasının Konstitusiyasının yerli özünüidarənin bələdiyyələr tərəfindən həyata keçirilməsinə dair müddəalarının reallaşdırılması ilə əlaqədardır. Sovet hakimiyyəti illərində dövlət və yerli hakimiyyəti orqanlarının qarşılıqlı fəaliyyətinin tənzimlənməsi məsələsi həll edilmirdi, çünki yerli hakimiyyəti həyata keçirən sovetlər dövlət orqanlarının statusuna malik idilər.

Beləliklə, yerli səviyyədə idarəetmənin təşkili və həyata keçirilməsi üzrə vəzifələrin icrası prosesində dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin tənzimlənməsinin ilkin səbəbi 90-cı illərdən başlanan keçid dövründə Azərbaycan Respublikasının hüquq sistemində yerli özünüidarə institutunun bərqərar olmasından ibarətdir.

Dövlət hakimiyyət orqanları ilə yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin tənzimlənməsi konsepsiyasının əsaslandırılması qarşısında qoyulan başlıca məqsəd dövlət orqanlarının tərkibinin və vəzifələrinin müəyyən edilməsi, yerli özünüidarə orqanlarının strukturunun və vəzifələrinin təsdiq edilməsi, dövlət orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin həyata keçirilməsi şərtlərinin əsaslandırılması, dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının yerli əhəmiyyətli məsələlərin həlli üzrə səlahiyyətlərinin müəyyən edilməsi, dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin təşkilati-hüquqi formalarının əsaslandırılması yolu ilə inzibati ərazidə effektiv idarəetmə qaydalarının tətbiq edilməsini təmin etməkdir.

Azərbaycan Respublikasında yerli özünüidarənin həyata keçirilməsi prosesində dövlət hakimiyyəti orqanları ilə yerli özünüidarə orqanları arasında qarşılıqlı əlaqələrin tənzimlənməsi üçün bazis hüquq normaları ölkə Konstitusiyasının 13, 29, 94, 109, 142-146-cı maddələrində təsbit edilmişdir. Əsas Qanunun 13-cü maddəsinə uyğun olaraq ölkənin ümumi sərvətləri hesab olunan daşınar və daşınmaz əmlakı üzərində üç subyektin: dövlətin, vətəndaşların və bələdiyyənin mülkiyyət hüququnun həyata keçirilməsinin qanunuliyi təmin olunmuşdu. Bələdiyyənin mülkiyyət hüququna dair konstitusion norma bələdiyyənin dövlət əmlakının özəlləşdirilməsi nəticəsində əldə etdiyi əmlaka sahib olmaq, əmlakdan istifadə etmək və onun barəsində sərəncam vermək hüquqlarının ölkənin bütün yaşayış məntəqələrində həyata keçirilməsini nəzərdə tutur.

Yerli özünüidarə sisteminin formalaşmasında Azərbaycan Respublikasının Milli Məclisi tərəfindən bələdiyyələrə seçkilərin keçirilməsi, referendum təyin edilməsi və bələdiyyələrin statusunu

müəyyən edilməsi ilə bağlı məsələlərə dair Konstitusiya qanunlarının, qanunların və qərarların qəbul edilməsi mühüm rol oynayır (Azərbaycan Respublikasının Konstitusiyası, 1995). Konstitusiyanın 109-cu maddəsinə uyğun olaraq mərkəzi və yerli icra hakimiyyəti orqanları ilə yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyəti Azərbaycan Respublikasının Prezidentinin imzaladığı və dərc etdiyi qanunlar, fərmanlar, sərəncamlar və qərarlar əsasında həyata keçirilir.

Konstitusiyanın "Yerli özünüidarəetmə" adlanan dördüncü bölməsində təsbit edilmiş normaların tətbiqi aşağıdakı məsələlərin tənzimlənməsini təmin edir:

- yerlərdə özünüidarənin təşkili;
- yerli özünüidarə üzrə fəaliyyətin təşkili;
- bələdiyyələrin səlahiyyətlərinin müəyyən edilməsi;
- bələdiyyələrin qərarlarının qəbul edilməsi;
- bələdiyyələrin müstəqilliyinin təmin edilməsi;
- bələdiyyələrin məsuliyyət daşıması.

Yerli özünüidarənin həyata keçirilməsi üzrə fəaliyyətin tənzimlənməsini təmin edən Konstitusiya normaları yerli hakimiyyətin bütövlükdə deyil, onun məhdud hissəsinin realizə edilməsini təmin edir. Nəzərə almaq lazımdır ki, yerli özünüidarənin tətbiq edildiyi yaşayış məntəqələrində əhalinin həyat fəaliyyətinin təmin edilməsi ilə bağlı vəzifələrin əsas hissəsi mərkəzi və yerli icra hakimiyyəti orqanları tərəfindən yerinə yetirilir. Bununla əlaqədar olaraq Konstitusiyada bələdiyyələrlə dövlət hakimiyyəti orqanları arasında qarşılıqlı fəaliyyətin tənzimlənməsini təmin edən aşağıdakı normalar təsbit edilmişdir:

- dövlətin bələdiyyələrin fəaliyyətinə nəzarət etməsi;
- bələdiyyələrə dövlət hakimiyyət orqanları tərəfindən əlavə səlahiyyətlərin və müvafiq maliyyə vəsaitinin verilməsi ilə əlaqədar olaraq belə səlahiyyətlərin həyata keçirilməsinə dövlət nəzarətinin aparılması;
- bələdiyyələrin öz səlahiyyətləri barəsində Azərbaycan Respublikasının Milli Məclisinə hesabat təqdim etməsi;
- bələdiyyələrin məhkəmə tərəfindən müdafiəsinə, dövlət orqanlarının qərarları nəticəsində yaranan əlavə xərclərinin ödənilməsinə təminat verilməsi (Azərbaycan Respublikasının Konstitusiyası, 1995).

Dövlət hakimiyyəti orqanları ilə yerli özünüidarə orqanları arasında qarşılıqlı fəaliyyətin hüquqi əsaslarının inkişafının 1999-2020-ci illəri əhatə edən mərhələsində Azərbaycan Respublikası Konstitusiyasının və Yerli özünüidarə haqqında Avropa Xartiyasının yerli hakimiyyətin təşkili ilə bağlı müddəalarının konkretləşdirilməsini təmin edən bələdiyyələrin statusu haqqında, bələdiyyə qulluğu haqqında, bələdiyyənin maliyyəsinin əsasları haqqında, bələdiyyə mülkiyyətinə əmlakın verilməsi haqqında, bələdiyyə torpaqlarının idarə edilməsi haqqında, yerli (bələdiyyə) vergilər və ödənişlər haqqında Azərbaycan Respublikasının qanunları qəbul olunmuş və eləcə də bələdiyyələrin fəaliyyətinin ayrı-ayrı sahələrini tənzimləyən hüquqi normalar Azərbaycan Respublikasının Mülki Məcəlləsində, Torpaq Məcəlləsində, Vergi Məcəlləsində, "Büdcə sistemi haqqında" qanunda və digər qanunvericilik aktlarında təsbit olunmuşdur. Yuxarıda sadalanan normaların konstitusion-hüquqi qiymətləndirilməsinin nəticələri nəzərə alınmaqla, dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin tənzimlənməsi sahəsində mövcud vəziyyətin maliyyələşdirilməsi məqsədəuyğundur. Əvvəlcə qeyd etmək lazımdır ki, dövlət-bələdiyyə münasibətlərində tənzimetmə funksiyasını yerinə yetirən Azərbaycan Respublikasının Milli Məclisi və Azərbaycan Respublikasının Prezidenti ilə bələdiyyələr arasında qarşılıqlı əlaqə, əsasən, yerli əhəmiyyətli məsələlərin həllinə aid qanunların, fərmanların, qərarların qəbul edilməsi və tətbiqi ilə əlaqədar olaraq həyata keçirilir. Konstitusiyanın 149-cu (Normativ-hüquqi aktlar) maddəsi referendumla qəbul olunmuş aktların və qanunların tətbiqi və icrasının bələdiyyələr üçün məcburiliyini təsdiq etsə də, Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarlarının, mərkəzi və yerli icra hakimiyyəti orqanlarının aktlarının icrasının bələdiyyələr üçün məcburiliyinin müəyyən edilməsi ilə bağlı məsələnin konstitusion – hüquqi cəhətdən həll edilməsi zəruridir.

Dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyəti, bir qayda olaraq, həmin orqanların yerli əhəmiyyətli məsələlərin həlli üzrə səlahiyyətlərinin icrası yolu ilə

həyata keçirilir (Yerli Özünüidarə haqqında Avropa Xartiyası, 2002). Orqanlardan hər biri inzibati ərazinin sosial-iqtisadi inkişafı və ekoloji problemlərini həll etmək üçün konstitusiya və qanunlarla təsdiq edilmiş hüquqlardan istifadə edir, öhdəlikləri yerinə yetirir və fəaliyyətin nəticələrindən asılı olaraq məhkəmədə cavabdeh və ya iddiaçı qismində çıxış edir. İnzibati ərazi üzrə idarəetmə fəaliyyətinin iki orqan tərəfindən həyata keçirilməsinin hansı nəticələrlə yekunlaşmasının qiymətləndirilməsi üçün həmin orqanların qanunvericiliklə nəzərdə tutulmuş vəzifə və səlahiyyətlərinin müqayisəli hüquqi təhlilinin aparılmasının zəruriliyini etiraf etmək lazımdır.

Azərbaycan Respublikasının Konstitusiyasının 124-cü maddəsinin I hissəsinə uyğun olaraq, yerlərdə icra hakimiyyətini yerli icra hakimiyyətlərinin başçıları həyata keçirirlər. Yerli icra hakimiyyəti orqanının vəzifə və səlahiyyətləri "Yerli icra hakimiyyəti haqqında" Əsasnamə (Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 6 iyun tarixli Fərmanı ilə təsdiq edilmişdir) ilə tənzimlənir. Yerli icra hakimiyyətinin başçıları öz fəaliyyətində müvafiq ərazidə fəaliyyət göstərən mərkəzi icra hakimiyyəti orqanlarının yerli qurumları və digər dövlət qurumları ilə, habelə bələdiyyələrlə, qeyri-hökumət təşkilatları ilə və digər təşkilatlarla yerli icra hakimiyyətinin qarşılıqlı fəaliyyətini təmin....... Əsasnamənin 3.2-ci bəndinə uyğun olaraq, yerli icra hakimiyyətinin başçısı ərazinin sosial-iqtisadi inkişafı sahəsində aşağıdakı vəzifələri yerinə yetirir:

- mərkəzi icra hakimiyyəti orqanlarının, dövlətə məxsus olan səhmdar cəmiyyətlərinin müvafiq ərazidə yerləşən qurumları ilə, habelə bələdiyyələr və digər təşkilatlarla birlikdə şəhərin, rayonun, şəhər rayonunun sosial-iqtisadi vəziyyətini təhlil edir, inkişaf meyillərinin müəyyənləşdirilməsi, sosial-iqtisadi inkişafın proqnozlaşdırılması və planlaşdırılması, əhalinin sosial əhəmiyyətli sifarişlərinin öyrənilməsi işini təşkil edir, ərazinin sosial-iqtisadi inkişafına dair təkliflər hazırlayır və aidiyyəti mərkəzi icra hakimiyyəti orqanlarına təqdim edir;
- regionların sosial-iqtisadi inkişafı ilə bağlı dövlət proqramı və konsepsiyalarının hazırlanmasına dair təkliflər verir, müvafiq ərazidə onların həyata keçirilməsini təmin edir;
- müvafiq ərazinin sosial-iqtisadi inkişafına dair göstəriciləri əks etdirən məlumat bazasının formalaşmasını və yeniləşdirilməsini təmin edir.

"Yerli icra hakimiyyətləri haqqında" Əsasnamənin 4.2-ci bəndinə əsasən yerli icra hakimiyyəti başçısı ərazinin sosial-iqtisadi inkişafı sahəsində aşağıdakı səlahiyyətləri həyata keçirir:

- müvafiq ərazinin sosial-iqtisadi inkişafının monitorinqini və qiymətləndirilməsini həyata keçirmək, monitorinqin və qiymətləndirmənin nəticələri barədə aidiyyəti dövlət hakimiyyət orqanlarına məlumat vermək;
- şəhərin, rayonun və şəhər rayonunun yerli sosial-iqtisadi inkişafı proqramlarının hazırlanmasını təşkil etmək və onları təsdiq etmək;
- müvafiq icra hakimiyyəti orqanları, habelə aidiyyəti təşkilatlar və bələdiyyələr qarşısında ərazinin inkişafına dair məsələlər qaldırmaq, təkliflər vermək;
- iqtisadi və sosial inkişaf üçün zəruri olan maliyyə, əmək ehtiyatları, əhalinin gəlirləri və torpaq balanslarının, habelə digər balansların hazırlanmasını təşkil etmək;
- şəhərin, rayonun sosial-iqtisadi və mədəni inkişafını təmin etmək məqsədilə ayrılan büdcə və digər maliyyə vəsaitinin sərəncamçısı olmaq, bank hesabları açmaq, büdcə vəsaitindən və digər vəsaitdən təyinatı üzrə səmərəli istifadə olunmasına nəzarəti həyata keçirmək;
- müvafiq ərazinin kompleks sosial-iqtisadi inkişafında istehsal və sosial infrastrukturun, təbiəti mühafizə tədbirlərinin (obyektlərinin) maliyyələşdirilməsi, tikintisi, təmiri və saxlanılmasında iştirak edən fiziki və hüquqi şəxslərin qarşılıqlı fəaliyyətini əlaqələndirmək;
- müvafiq ərazidə hüquqi və fiziki şəxslər tərəfindən sərmayə qoyuluşu üçün şərait yaratmaq;
- müvafiq ərazidə sosial və istehsal infrastuktur obyektlərinin tikintisini və təmirini təşkil etmək.

Yuxarıda sadalanan müddəaların müqayisəsi yerli icra hakimiyyəti başçısının Əsasnamə ilə təsbit edilmiş vəzifələri və səlahiyyətlərinin məzmununda fərqli cəhətlərin olub-olmamasını tam aydınlaşdırmağa imkan vermir. Belə ki, Əsasnaməyə görə, icra hakimiyyətinin başçısının "işi təşkil edir", "sosial-iqtisadi vəziyyəti təhlil edir", "proqnozlaşdırma və planlaşdırma, sifarişlərin öyrənilməsi məsələlərini həll edir", "məlumatları hazırlayır və aidiyyəti orqanlara təqdim edir" və s. bu kimi feilin indiki zaman formasında qeyd olunan fəaliyyətləri onun vəzifələrinə aid edilirsə, həmin vəzifələr feilin məsdər formasında ifadə edilərək icra başçısının səlahiyyətləri kimi qiymətləndirilir.

Fikrimizcə, "vəzifə" və "səlahiyyət" anlayışlarının fərqləndirilməsi üçün yerli icra hakimiyyəti başçısı tərəfindən həll edilən məsələlər onun vəzifələrinə, həmin məsələlərin həllini təmin edən hüquqlar və öhdəliklərin isə səlahiyyətlərinə aid edilməsini qəbul etmək məqsədəuyğundur.

Yuxarıda qeyd olunduğu kimi, yaşayış məntəqələri hesab olunan şəhərlərdə, şəhər rayonlarında, rayonlarda, qəsəbələrdə və kəndlərdə yerli icra hakimiyyəti orqanı ilə yanaşı yerli özünüidarəni həyata keçirən bələdiyyələr də fəaliyyət göstərirlər (Yerli İcra Hakimiyyətləri haqqında Əsasnamə, 2012). "Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikası Qanununun (2 iyul 1999-cu il) 2-ci maddəsinə uyğun olaraq bələdiyyə Azərbaycan Respublikasının Konstitusiyası ilə və bu Qanunla səlahiyyətlərinə aid edilmiş yerli əhəmiyyətli məsələləri müstəqil surətdə həll edir. Qanun yerli əhəmiyyətli məsələlərə bələdiyyə əhalisinin həyat fəaliyyətinin bilavasitə təmin edilməsi ilə bağlı Azərbaycan Respublikasının Konstitusiyası və qanunları ilə müəyyənləşdirilən məsələləri aid edir.

Bələdiyyələr tərəfindən həyata keçirilən səlahiyyətlərin məzmunu və tərkibini müəyyənləşdirən bölmənin və ya maddənin "Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanununda nəzərdə tutulmaması diqqəti cəlb edir (Azərbaycan Respublikasında iqtisadi rayonların yeni bölgüsü haqqında, 2021). Bu qanunun 17-ci maddəsində bələdiyyənin daimi və başqa komissiyalarının əsas vəzifələrinə aşağıdakılar aid edilir:

- yerli əhəmiyyətli sosial müdafiə və sosial inkişaf, ekologiya, iqtisadi inkişaf, yerli xidmət üzrə proqramlar hazırlayıb, bələdiyyənin iclasına və ya bələdiyyənin qərarına əsasən yerli əhalinin müzakirəsinə çıxarmaq;
- yerli əhəmiyyətli məsələləri müzakirə etmək, bələdiyyə iclaslarında müzakirə üçün proqramlar, arayışlar, qərar layihələri və başqa materiallar hazırlamaq;
- bələdiyyə və onun icra aparatı üçün təkliflər hazırlamaq;
- seçicilərin tapşırıqlarının yerinə yetirilməsinin təşkilinə və yoxlanılmasına kömək etmək.

Nəzərdən keçirilən səlahiyyətlərin məhdud dairəsi bələdiyyənin daimi və başqa komissiyalarının qərarların layihələrinin tərtib edilməsi və onların icrasının təmin edilməsi sahəsində fəaliyyətinin tənzimlənməsini və qiymətləndirilməsini əhatə edir (Krugman, 2012; Mishkin, 2019). Lakin qəbul etmək lazımdır ki, komissiyanın fəaliyyəti bələdiyyə qurumunun ümumi fəaliyyətinin tərkib hissəsi olduğuna görə, onun səlahiyyətlərini bütünlükdə bələdiyyənin səlahiyyətləri kimi nəzərdən keçirmək olmaz.

Tədqiqatın məqsədinə uyğun olaraq "Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanununun müddəaları əsasında bələdiyyələrin ərazinin sosial-iqtisadi inkişafı sahəsində səlahiyyətlərini nəzərdən keçirək. Qanunun 2-ci maddəsinə görə, bələdiyyə orqanları – səlahiyyətləri çərçivəsində yerli əhəmiyyətli məsələləri həll edirlər. Nəzərə almaq lazımdır ki, bələdiyyələr tərəfindən həll edilən yerli əhəmiyyətli məsələlər daimi komissiyalar tərəfindən proqramlaşdırılır. Bələdiyyə əhalisinin həyat fəaliyyətinin bilavasitə təmin edilməsi məqsədilə hazırlanan proqramlara aşağıdakılar aid edilir:

- yerli sosial müdafiə və sosial inkişaf proqramları;
- yerli iqtisadi inkişaf proqramları;
- yerli ekoloji proqramlar.

Yerli özünüidarəetməni təşkil etmək üçün bələdiyyələr tərəfindən qəbul edilən proqramların məqsədi dövlətin həyata keçirdiyi inkişaf proqramlarında nəzərdə tutulmayan və ya onlara əlavə olaraq yerli əhəmiyyətli sosial, iqtisadi və ekoloji məsələləri həll etməkdir (Friedman, 1968; Keynes, 1936). Dövlət hakimiyyəti orqanlarının və yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətinin təşkili üzrə bu orqanların səlahiyyətlərinin müqayisəli təhlilinin aparılması üçün bələdiyyələrin sosial-iqtisadi inkişaf proqramlarının müddəalarını nəzərə almaq kifayətdir.

"Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanununun 4-cü ("Yerli sosial müdafiə və sosial inkişaf proqramları") və 5-ci ("Yerli iqtisadi inkişaf proqramları") maddələri ilə təsbit edilmiş yerli əhəmiyyətli məsələlərin həlli üzrə bələdiyyələrin səlahiyyətlərinə aşağıdakıları aid etmək olar:

- ərazidə təhsil, səhiyyə, mədəniyyət, yaşayış və qeyri-yaşayış binalarının saxlanılması və istifadəsini təmin etmək;
- sanitariya müəssisələrinin təşkili və inkişafına şərait yaratmaq;

- mənzil-kommunal təsərrüfatının təşkili və inkişafını təmin etmək;
- yerli nəqliyyat, rabitə və informasiya xidmətinin təşkilinə şərait yaratmaq;
- sakinlərin sosial ehtiyaclarının, əhalinin məşğulluğunun, gənclərin sosial-hüquqi müdafiəsinin təmin edilməsinə şərait yaratmaq;
- qəbiristanlıqların salınması və idarə olunmasını təmin etmək;
- yerli əhəmiyyətli iqtisadi inkişaf məsələlərini həll etmək;
- bələdiyyələrin mülkiyyətində olan daşınar və daşınmaz əmlakdan səmərəli istifadə edilməsinə nəzarət etmək və s.

## Nəticə

"Bələdiyyələrin statusu haqqında" qanunun və "Yerli icra hakimiyyətləri haqqında" əsasnamənin sosial-iqtisadi inkişaf sahəsində müvafiq orqanların səlahiyyətləri çərçivəsində həll edilən yerli əhəmiyyətli məsələlərə dair müddəalarının müqayisəli təhlilindən belə nəticəyə gəlmək mümkündür ki, inzibati ərazilərin inkişafı ilə bağlı yerli əhəmiyyətli məsələlərin həlli həm yerli icra hakimiyyətinin, həm də bələdiyyələrin səlahiyyətlərinə aid edilmişdir ki, bu da inzibati-ərazi vahidlərinin idarə olunması sisteminin mürəkkəbləşdirilməsinə və idarəetmədə qeyri-məhsuldar maliyyələşdirmələrin həyata keçirilməsinə səbəb olur.

Yerli özünüidarə orqanlarının və dövlət hakimiyyəti orqanlarının yaşayış məntəqələrinin idarə olunması üzrə qarşılıqlı münasibətlərinin hüquqi əsaslarının tədqiqi aşağıdakı nəticəni əsaslandırmağa imkan verir.

Eyni ərazidə fəaliyyət göstərən və eyni əhalini idarə edən müstəqil statuslu hakimiyyət orqanlarından hər birinin hüquqları və vəzifələri Konstitusiya və qanunlarla müəyyənləşdirildiyi halda, onların birgə idarəçilik fəaliyyətini tənzimləyən hüquqi akt indiyədək qəbul olunmamışdır.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasının Konstitusiyası*. (1995). www.e-qanun.az/framework/897.
2. *Azərbaycan Respublikasında iqtisadi rayonların yeni bölgüsü haqqında*. (07 iyul 2021). Azərbaycan Respublikası Prezidentinin Fərmanı.
3. *"Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanunu*. (1999). www.e-qanun.az/framework/4770.
4. Friedman, M. (1968). The Role of Monetary Policy. *American Economic Review*. 58(1), pp. 1–17.
5. Keynes, J.M. (1936). *The General Theory of Employment, Interest and Money.* Macmillan.
6. Krugman, P. (2012). *End This Depression Now.*
7. Mishkin, F.S. (2019). *The Economics of Money, Banking, and Financial Markets*. Pearson.
8. "*Yerli Özünüidarə haqqında Avropa Xartiyası"*. (2002). www.rm/col.int/the-congress-booklet-european-charter-of-local-self-government-azerlax/si/168098bc39.
9. *"Yerli İcra Hakimiyyətləri haqqında Əsasnamə".* (2012). https://e-qanun.az/framework/23701.
10. https://president.az/az/articles/view/52389
11. https://ru.wikipedia.org/wiki/Qubernator
12. https://tr.wikipedia.org/wiki/Vali

Daxil oldu: 17.02.2025
Qəbul edildi: 22.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/17-21

**Səadət Musayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
fizika-riyaziyyat üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0008-0772-9407
s.musayeva_ttm@mail.ru
**Xankişi Məmmədov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
texnika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru

# Texnologiya müəllimliyi ixtisası üzrə mütəxəssis hazırlığında folklordan istifadə imkanları

## Xülasə

Bu araşdırmada texnologiya müəllimliyi ixtisası üzrə mütəxəssis hazırlığında folklordan istifadə imkanları araşdırılımış, "ətri eşidilən" deyimlərin bir qismi tədqiqata cəlb edilmişdir. O deyimlərdən ki, onların qədri, qiyməti bilənlər üçün çox bahadır. Bir Azərbaycan atalar sözündə deyilir ki, ucuz ətin şorbası olmaz. Bəs niyə ucuz ətin şorbası olmaz deyilir? Qeyd edilir ki, lap qədim zamanlarda bütün duru xörəklərin hamısı şorba adlanırmış. Bu xörəklərə bütün sulu xörəklər - bozbaş, xaş, borş, sup, düşbərə, küftə və s. aid imiş. O zamanlar bütün şorbalar ətdən, özü də yağlı ətdən hazırlanırmış. Lakin indi olduğu kimi o vaxt da yağlı ət yağsız ətlə müqayisədə çox baha qiymətə satılırmış. Ona görə deyiblər ki, ucuz ətin şorbası olmaz. Araşdırmada *"şorba" adının XI əsrdə "mün" olduğu göstərilməklə, bu barədə M.Kaşğarinin məşhur* "Divani lüğət-it-türk", eləcə də prof. *M.Hüseynovanın "Azərbaycan dilinin yemək və içki adlarının tarixi-etimoloji lüğəti" və M.Kaşğarinin "Divani lüğət-it-türk" əsərinin qrammatik xüsusiyyətləri" əsərlərində* qeyd olunmuşdur. Tədqiqatda kimya elminə aid olan "inqredient" termininə də diqqət ayrılmış və göstərilmişdir ki, kimya elmi də məişətin alt çoxluğuna aid olan leksemlər qrupuna aiddir. Bu isə hər hansı bir məsələnin digər elmlərlə simbioz öyrənilməsinə, insanların dünyanı daha dərindən başa düşməsinə kömək etməsi deməkdir.

***Açar sözlər:*** *mətbəx, el deyimləri, inqredient, simbioz, şorba, borş, bozbaş*

**Saadat Musayeva**
Azerbaijan State Pedagogical University
PhD in Physics and Mathematics
https://orcid.org/0009-0008-0772-9407
s.musayeva_ttm@mail.ru
**Khankishi Mammadov**
Azerbaijan State Pedagogical University
PhD in Engineering
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru

# Opportunities of Using Folklore in the Training of Experts in Technology Teaching Specialty

## Abstract

This article considers the possibilities of using folklore in the training of specialists in the specialty teacher of technology, and also provides some "The smell is heard" phraseological

expressions, in which their price is very high for those who appreciate them well. In one Azerbaijani proverb, it is said that you can't make soup out of cheap meat. But why do they say that you can't make soup from cheap meat? It is known that in ancient times all liquid dishes were called soup. Such dishes include all soups-bozbash, khash, borscht, dushbara, meatball, etc. At that time, all soups were made with meat, especially fatty meat. But then, as now, fatty meat was much more expensive than lean meat. That's why they say that “you can't make soup from cheap meat”. The study shows that the name "shorba" in the XI century was "mun" and is mentioned in the famous "Dictionary of Divani-it-Turk" by M.Kashgari, as well as in the famous works of Prof. M.Huseynova "Historical-etymological dictionary of names of food and drinks of Azerbaijani language" and "Grammatical features of "Dictionary of Divani-it-Turk". The study also used the term "ingredient" related to chemistry and it was shown that chemistry is also included in the group of lexemes related to the subgroup of everyday life. This means that studying any issue in symbiosis with other sciences helps people to understand the world more deeply.
***Keywords:*** *cuisine, folk sayings, ingredient, symbiosis, soup, borscht, bozbash*

## Giriş

Texnologiya müəllimliyi ixtisası üzrə bakalavr səviyyəsində kadr hazırlığı üçün nəzərdə tutulan fənlərdən biri də “Kulinariya” fənnidir. Əslində, gələcəkdə proqrama “Molekulyar kulinariya” fənni daxil edilsə, daha yaxşı olar. Yaşı çox gənc olan “molekulyar kulinariya” (keçən əsrin 90-cı illərində yaranıb) yemək hazırlanmasına yeni elmi yanaşma olub, hazırda dünyada böyük maraq kəsb edən tədqiqat sahələrindən biridir. “Kulinariya” termininin romalıların onuncu ilahəsi “Kulinariya”nın və qədim yunanların təbabət tanrısı Asklepinin aşpazı Kulinanın adından götürüldüyü ehtimal edilsə də, bu sözün kökü latınca “culina” sözünə gedib çıxır. Tarixi 1 milyon il əvvələ gedib çıxan kulinariya, yəni yemək hazırlama sənəti və mədəniyyəti haqqında yazılara qədim mənbələrdə rast gəlmək olur. Bu sahədə yazılan ilk kitab isə b.e.ə. 40-cı ildə romalı Aspinin adıyla bağlıdır.

Qeyd edək ki, hər bir xalqın mətbəxi və onun qida ənənələri onun tarixini, incəsənətini, musiqisini, düşüncə tərzini, inam və etiqadını, həyata baxış fəlsəfəsini, rəqslərini, mahnılarını, fiziki görünüşünü, geyimlərini, bayramlarını, bir sözlə mədəniyyətini dolğun əks etdirən əsas göstəricilərdən biridir. Bizim mədəniyyətimizin və ilham mənbəyimizin kökü də mətbəxdən qaynaqlanır. Əbəs yerə “Əvvəl təam, sonra kəlam” deməyiblər ki! Dilimizdə də elə möhürlənmiş ifadələr var ki, onları işlədirik, amma çox zaman onların mənasını, fəlsəfəsini doğru anlaya bilmirik, yəni çox şey gizlində qalır, üstünü toz və ya ot basır və müəyyən vaxtdan sonra yaddan çıxır. Bu mənada M.Lomonosovun dediyi kimi “Heç bir şübhə yoxdur ki, elm elmə kömək edir. Fizika kimyaya, riyaziyyat fizikaya, informatika folklora, mənəviyyat elmi və tarix poeziyaya kömək edən kimi”. Deməli, elm dünyasında “rəqəmlərin atası” adlandırılan Kornelius Aqrippanın 1533-cü ildə nəşr etdiyi “Okkult fəlsəfəsi” əsərindən göründüyü kimi, elmlərin əlaqəli öyrənilməsi lap qədimdən özünü büruzə verir və bu prioritetlik öz aktuallığını bu gün də saxlayır (Məmmədov, Musayeva, 2024).

**Tədqiqat**

Məqalələrimizin birində qeyd etmişdik ki, “harmoniya” məişətin alt çoxluğuna daxildir. Riyazi dildə bunu biz belə yaza bilərik: “harmoniya”⊂ “məişət”. Bu isə o deməkdir ki, harada frazeoloji ifadələr varsa, orada harmoniya var (Məmmədov, Teymurova, 2025, s.22). Harada harmoniya varsa, orada dilin əlifbası, sintaksisi və semantikası var. Semantika isə sintaksis konstruksiyalarının təsviridir (Məmmədov, Əyyuov, 2019, s.56-63).

Bu araşdırmada texnologiya müəllimliyi ixtisası üzrə mütəxəssis hazırlığında folklordan istifadə imkanları araşdırılımış, məişətdə işlətdiyimiz bir çox “ətri eşidilən” deyimlərin bir-biri ilə vəhdəti və bağlılığı, yəni harmoniyası *müasir düşüncə prizmasından* tədqiqata cəlb edilmişdir. Əlbəttə, arif olanlar nə demək istədiyimiz sözlərin ətrini yaxşı duyurlar. Belə halda ariflər deyirlər ki, “ətri eşidirəm”. Bu yazıda məhz “ətri eşidilən” deyimlərdən söhbət açacağıq. O deyimlərdən ki, onların qiyməti bilənlər üçün çox bahadır. Ucuz sözlə axı bizim nə işimiz var? Özü də bilə-bilə ki, ucuz ətin şorbası olmaz. Bəs niyə ucuz ətin şorbası olmaz deyilir? Məsələ burasındadır ki, lap qədim

zamanlarda bütün duru xörəklərin hamısı şorba adlanırmış (Mustafayev, Məmmədov, 2008, s.94). Bu xörəklərə bildiyimiz və bilmədiyimiz sulu xörəklər - bozbaş, xaş, borş, sup, düşbərə və s. aid imiş. O zamanlar bütün şorbalar ətdən, özü də yağlı ətdən hazırlanırmış. Lakin keçmişdə yağlı ət indi olduğu kimi yağsız ətdən çox baha qiymətə satılırmış. Ona görə deyiblər ki, ucuz ətin şorbası olmaz. Müəyyən dövrdən sonra şorba həm də ətsiz, amma hökmən su, düyü, turşu və digər ədviyyalardan hazırlanmağa başlamışdır. Beləliklə, bütün duru xörəklərin hamısının şorba adlandırıldığı məlum olur. Hazırda şorbanın inqredientində adları müxtəlif olan məhsullara, məsələn, noxud, kartof və s. rast gəlinir. Amma bu məhsulların hamısının olması, əlbəttə məcburi deyil. Qeyd edək ki, "inqredient" kimya elminə aid olan bir termin olub, mənası hər hansı bir mürəkkəb birləşmənin və ya qarışığın tərkib hissəsi deməkdir. Buradan belə bir nəticəyə gəlmək olar ki, kimya da məişətin alt çoxluğuna aid olan leksemlər qrupuna aiddir. Mənbələrdə "şorba" sözünün kökünün Hindistanla bağlı olduğu və 10 min il qabaqlar tapıldığı göstərilir. Hazırda Azərbaycanda müxtəlif şorba növləri mövcuddur: əriştə, borş, dovğa, müxtəlif ət və tərəvəz şorbaları, umac və s. "Şorba" sözü bəzən müxtəlif dialekt və şivələrimizdə "şorva" kimi də işlənir. B.Əhmədov yazır ki, "şorba" "çorba" kimi də işlədilir. "Ço" "su" deməkdir, "sulu xörək" mənasını verir (Əhmədov, 2015, s.241). Böyük dilçi alim M.Hüseynovanın *"*Azərbaycan dilinin yemək və içki adlarının tarixi-etimoloji lüğəti" də "şorba" adının XI əsrdə "mün" olduğu aydın olur. M.Kaşğari yazır ki, mən yağma ölkəsində eşitdim, "şorba gətir" demək əvəzinə "mün gəldür" deyirlər (Hüseynova, 2022, s.138). M.Hüseynova qeyd edir ki, "mün"sözü hazırda da çorba anlamında müasir türk dillərində, məsələn, altay, xakas dillərində "mün", yakut dilində isə "min" kimi istifadə olunmaqdadır.

"Şorba" sözü müxtəlif türkcələrdə aşağıdakı formalarda işlənir:

Türkiyə türkcəsində "çorba", Azərbaycan türkcəsində "şorba", başqırd türkcəsində "aş", "hurra", qazax türkcəsində "şorpa", "köye", qırğız türkcəsində "şorpo", "çorpe", özbək türkcəsində "şorve", tatar türkcəsində "şulpa", türkmən türkcəsində "çorba", uyğur türkcəsində "şurpa", "şorva" (Hüseynova, 2018, s.155). Qeyd edək ki, *f*ransız sözü olan "soupe' sözündən əmələ gələn şorbanın *h*azırda dünyada yüz əllidən çox növü məlumdur. *Bir* çox dillərdə bu sözün təxminən eyni cür səslənir: fransız dilində "soupe", rus dilində "sup", ingilis dilində "soup", holland dilində "soep"və s.

*Şorba adına atalar sözlərimiz də var: "*Şorbanın imanı ətdir", "Şorbanın sıyıqlığı düyünün azlığındandır" və s. Məlumdur ki, bütün dilçilər ərəb sözü olan "iman"ı "mütləq təsdiq etmək" kimi qəbul edirlər. Deməli, birinci deyim "Şorbanın mütləq əti olmalıdır" anlamına gəlir. Axırıncı deyimdəki "sıyıqlığı" sözü isə "duruluğu" kimi anlaşılır. İndi isə şorba növlərinin bəzilərinin tarixi-etimoloji *düşüncə prizmasından poetik-idraki məzmununa diqqət edək:*

Mənbələrdə fars sözü olduğu bildirilən "əriştə"nin eramızdan əvvəl 208-220-ci illərdə Çində Han sülaləsi hakimiyyətinin ikinci dövrünə, yəni Sonrakı Han (Şərqi) dövrünə təsadüf etdiyi haqqında yazılara rast gəlmək olur. Yeri gəlmişkən, "Dastani-Əhməd Hərami" kitabında əriştə "ərişə" kimi göstərilmişdir (İsmayılova, 2020, s.37). M.Hüseynova isə əriştənin ümumtürk kulinariyasına aid olduğunu qeyd edərək Azərbaycanın demək olar ki, bütün dialekt və şivələrində, o cümlədən Təbriz dialektində rast gəlindiyini yazır (Hüseynova, 2018, s.72). Bu söz Azərbaycan türkcəsində "əriştə", Türkiyə türkcəsində "erişte", qazax türkcəsində "kespe", başqırd türkcəsində "tokmaz", qırğız türkcəsində "kesme", özbək türkcəsində "üqra, üqri aş", tatar türkcəsində "tukmac", türkmən türkcəsində "üpaş", uyğur türkcəsində "çöp" şəklində işlənir (Hüseynova, 2018, s.73). B.Əhmədov da əriştə sözünün farsca "riştə", yəni "ip" sözünün təhrif edilmiş forması olduğunu qeyd edir (Klassik, 2005, s.242). Doğrudan da, əriştənin ip kimi uzun olması bu cür mülahizə yürütməyə imkan verir (Əhmədov, 2015, s.104). Bu isə əriştənin M.Hüseynova yazdığı kimi ümumtürk kulinariyasına aid olduğunu sübut edən bir amildir. Qeyd edək ki, o taylı-bu taylı Azərbaycanın əksər dialekt və şivələrində əriştə adından başqa "əriştə aşı", "əriştə şiləsi", "əriştə şorbası", "əriştə plovu" kimi xörək adlarına da rast gəlinir. Əriştə adına atalar sözlərimiz də var: *"Qız ilə əriştə, qarı ilə əriştə", "*Əriştə bəylər aşı, quymaq / *dutmac* onun yol*daşı*" (Atalar sözləri, 2013, s.177). *"*Özünə umac ova bilmir, özgəyə əriştə kəsir" (Atalar sözləri, 2013, s.345). Əriştə adına olan bu dörd atalar sözündə bizə daha çox "dutmac" sözünün mənası az işləndiyi üçün o qədər də aydın deyil. Qeyd edək ki, "dutmac" da türklərin Zülqərneyndən qalma məşhur bir yeməyidir. Mənası "özünü ac tutma, bu yeməkdən bişir, ye" deməkdir. Bu deyimlərdən fikrimizcə ən işlək olanı isə *"*Özünə umac ova bilmir, özgəyə əriştə

kəsir" məsəlidir. Əslində "umac" yox, "ovmaq" sözündən yaranan "ovmac" olmalıdır. Göründüyü kimi, "o" səsi "u" səsi ilə əvəz olunmuş, "v" səsi isə ixtisara düşmşüdür (Əhmədov, 2015, s.259). Bu misal insanların öz işlərini həll edə bilmədikləri halda, yerli-yersiz başqalarının işlərinə müdaxilə edən zaman işlənir. Bununla bağlı T.Əmiraslanov yazır ki, əriştə kəsmək üçün undan xəmir hazırlamaq, yoğurmaq, kündə qoymaq, yuxa yaymaq, əriştəni kəsmək, qurutmaq və ya qovurmaq lazım gəlir. Bu isə çox zəhmət və zaman sərf edilir. Ona görə də umac ovmağa tənbəllik edən xanım əriştə hazırlamağa heç yaxın getməz (Əmiraslaov, 2013, s.31-32).

İndi də borş haqqında. Kələm, çuğundur və başqa göyərtidən bişirilən kələm şorbası b*orş adlanır.* Ukrayna mənşəli olan bu şorba Azərbaycana Rusiyadan, Rusiyaya isə Ukraynadan XIX əsrdə keçib. Ən çox Şərqi və Qərbi Avropada, eləcə də Şimali Asiyada daha çox yayılıb. Slavyan dillərinin etimaloji lüğətlərinə əsasən demək olar ki, "borş" adı "adi borşovik" adlı bitkinin adından götürülüb. Azərbaycan dilinə "adi baldırğan" kimi tərcümə olunur. Borşun müasir mənası - çuğundur və kələm şorbası deməkdir. Azərbaycan folklorunda borşla bağlı hər hansı bir atalar sözünə, el deyiminə və ya hər hansı bir lətifəyə rast gəlinmir. Amma, ukrayna və rus dilində belə nümunələr yetərincədir. Məsələn, ukraynalılar yalan və ya boş söhbətlər haqqında istehza ilə deyirlər: çılpaq borş. Ukrayna folklorunda işlədilən bir el deyimi də maraqlıdır: Borş sənin üçün şorba deyil. Əlbəttə bu, borşun ukraynalılar üçün nə qədər önəmli olduğunu göstərir.

Qeyd edək ki, Azərbaycan mətbəxində plov bütün xörəklərin şahı olduğu kimi, ukrayna mətbəxində də borş bütün yeməklərin şahı hesab olunur. Ona görə də bu barədə çoxlu mahnılar bəstələnmiş, əfsanələr yazılmışdır. Bu isə adı çəkilən terminin linqvistik baxımından da nə qədər əhəmiyyət daşıdığını göstərir. Ukrayna folklorunda rast gəldiyimiz bəzi el deyimlərinə iki dildə diqqət edək (Ukrainski prikazki, prislivya, i take inshe, 1993).

| Ukrayna el deyimləri | Azərbaycan dilinə tərcümə |
|---|---|
| Borh – löbovğ | Borş sevgidir |
| Borh - vtoraə matğ | Borş ikinci anadır |
| Budet i na naşey uliüe borh | Bizim küçədə də borş olar |
| Pustğ menə borh spaset ot tixix vod, a s burnımi ə i sam spravlösğ | Borş məni dayaz gölməçədən çıxarsın, tufanla özüm bacararam |
| Borh moquç, kak okean | Borş okean kimi zəngindir |
| Dve porüii borha - gto sila | İki nəfərlik borş artıq gücdür |
| Net krasotı bez borha | Borşsuz gözəllik yoxdur |
| Ne imey sto rubley, a imey sto borhey. | Yüz manatın olmasın, yüz borşun olsun |
| Xoroşiy borh ne bıvaet deşev, deşevıy - ne bıvaet borhëm | Yaxşı borş ucuz olmur, ucuz olan isə borş deyil |
| Kto rano vstaet - tomu borh daet | Səhər tez durana borş verərlər |
| Bez borha ne vılovişğ i ktulxu iz pruda | Borş olmadan hətta gölməçədən balıq tuta bilməzsən |

Diqqət etsək ukrayna el deyimlərinin bizim atalar sözləri ilə eyni semantikaya malik olduqlarını asanca görərik. Məsələn biz deyirik: "küçəyə də gün çıxar", ukraynalılar deyir ki, "Bizim küçədə də borş olar", yaxud, biz deyirik: "Yüz manatın olunca, yüz dostun olsun", ukraynalılar deyir ki, "Yüz manatın olmasın, yüz borşun olsun", yaxud, biz Kür çayına deyirik: "Ana Kür", ukraynalılar deyir ki, "Borş ikinci anadır". Fikrimizcə əlavə şərhə ehtiyac yoxdur.

## Nəticə

Beləliklə, bu araşdırmada da milli-mənəvi köklərimizi, adət-ənənlərimizi, mədəniyyətimizi, milli psixologiyamızı və mentalitetimizi əks etdirən və işləkliyi kifayət qədər yüksək olan el deyimlərinin

müasir düşüncə prizmasından maraq kəsb etdiyini və *insanlara dünyanı dərindən qavramasına kömək etdiyinin görə bilərik.*

**Ədəbiyyat**


1. Əhmədov, B. (2015). *Etimologiya lüğəti.* Altun kitab.
2. Əmiralanov, T. (2013). *Söz mətbəxi.* Nurlan.
3. Hüseynova, M. (2018). *Azərbaycan dilinin yemək və içki adlarının tarixi-etimoloji lüğəti.* ADPU.
4. Hüseynova, M.(2022). *Mahmud Kaşğarinin "Divani lüğət-it-türk" əsərinin qrammatik xüsusiyyətləri.* ADPU.
5. İsmayılıova, M. (2020). *Azərbaycan mətbəx kultu leksikasının tarixi-etimoloji təhlili və türk dilləri dialektlərinə inteqrasiyası*. Linqvistika problemləri. №4.
6. *Klassik Azərbaycan ədəbiyyatında işlənən ərəb və fars sözləri lüğəti* (2005). Şərq-Qərb.
7. Məmmədov, X., Teymurova, Ə.*(2025). Mətbəxlə bağlı bəzi frazeoloji ifadələrin harmoniyası.* Elmi Tədqiqat Beynəlxalq onlayn elmi jurnal
8. Məmmədov, X., Musayeva, S.( *2024). Texnologiya müəllimliyi hazırlığında ölçü vahidlərindən istifadə səviyyəsi*. Elmi Tədqiqat Beynəlxalq onlayn elmi jurnal.
9. Mustafayev, Q., Məmmədov, A. *(*2008). *Ataların sözü - xalqın gözü.*Təknur.
10. Məmmədov, X., Əyyubov, Ə.(2019). *Bəzi sayların və ölçü vahidlərinin riyazi semantikası və ikt-dən istifadə*. Təhsildə İKT- elmi metodik jurnal. №3.
11. *Ukrainski prikazki, prislivya, i take inşe*.(1993). Lybid.
12. Yaqubqızı, M. *Atalar sözləri*. (2013). Nurlan.


Daxil oldu: 08.02.2025
Qəbul edildi: 19.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/22-29

**Nərminə Məmmədova**
Bakı Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0001-5425-2818
narminamammadova@bsu.edu.az

# Türk və ispan dillərində genderəməxsus nitqin mədəni özəllikləri və diskurs strategiyaları

## Xülasə

Genderəməxsus dil xüsusiyyətlərinin mədəni müstəvidə təhlili müasir dilçilikdə və sosial elmlərdə mühüm yer tutur. Qloballaşma və multikulturalizm şəraitində fərqli mədəniyyətlərdə gender rollarının diskursa necə sirayət etməsi, cəmiyyətin sosial strukturu və dəyərləri ilə sıx bağlıdır. Türk və ispan cəmiyyətləri patriarxal və ailəmərkəzli modellərlə yanaşı, fərqli sosiallaşma yolları və dil strategiyalarını əks etdirir ki, bu da genderəsaslı diskursun müqayisəli araşdırılmasını aktuallaşdırır.

Bu tədqiqatda türk və ispan dillərində kişi və qadın diskursunun mədəni təsirlərlə necə formalaşdığı analiz olunur. Tədqiqatda dilin içindəki gender strukturlarının necə meydana gəldiyi, cinsiyyətə bağlı sosial və mədəni kodların nitqdə və ünsiyyət strategiyalarında necə ifadə olunduğu araşdırılır. Nəticədə, hər iki dildə qadın və kişi danışıq üslublarının emosional ifadə, nəzakət formaları, dominantlıq və empatiya meyilləri baxımından fərqli olduğu göstərilir.

***Açar sözlər:*** *genderəməxsus diskurs, mədəniyyət və dil, türk və ispan dilləri, kişi və qadın nitqi, sosial-mədəni kodlar*

**Narmina Mammadova**
Baku State University
PhD in Philology
https://orcid.org/0000-0001-5425-2818
narminamammadova@bsu.edu.az

# Cultural Features of Gendered Speech and Discourse Strategies in Turkish and Spanish Languages

## Abstract

The analysis of gender-related linguistic features within a cultural context occupies a significant place in contemporary linguistics and the social sciences. In the era of globalization and multiculturalism, the way gender roles permeate discourse across different cultures is closely linked to the social structure and values of a society. Turkish and Spanish societies, alongside patriarchal and family-centered models, reflect diverse paths of socialization and linguistic strategies, which underscores the relevance of a comparative study of gender-marked discourse.

This study analyzes how male and female discourse in Turkish and Spanish is shaped by cultural influences. It examines the formation of gender structures within language and explores how gender-based social and cultural codes are manifested in speech and communicative strategies. The findings reveal that male and female speech styles differ in both languages, particularly in terms of emotional expression, forms of politeness, tendencies toward dominance, and empathy.

***Keywords:*** *gender-marked discourse, culture and language, Turkish and Spanish languages, male and female speech, sociocultural code*

## Giriş

Dil sadəcə kommunikasiya vasitəsi deyil, həm də bir cəmiyyətin mədəni kodlarının, sosial strukturlarının və tarixi təcrübələrinin daşıyıcısıdır. O, fərdlər arasında əlaqə qurmaqla yanaşı, kollektiv kimliyin formalaşmasına, sosial münasibətlərin tənzimlənməsinə və ictimai rolların təsbitinə xidmət edir. Bu baxımdan dil cəmiyyətin ideoloji və mədəni strukturlarını təcəssüm etdirən güclü bir simvolik sistemdir. Onun vasitəsilə insanlar yalnız fikirlərini deyil, həm də mənsub olduqları sosial qrupların dəyərlərini ifadə edirlər.

Gender fərqlilikləri isə bu simvolik sistemdə xüsusi yer tutur. Cinsiyyət yalnız bioloji bir fərq deyil, həm də sosial və mədəni kontekstlərdə müxtəlif mənalar qazanan konstruksiyadır. Bu konstruksiyalar dilin struktur və istifadəsində dərin izlər buraxır. Kişi və qadınların danışıq tərzləri, üslub seçimləri, söz ehtiyatı və kommunikasiya strategiyaları bu fərqliliyin dil səviyyəsindəki əksləridir. Hər bir cəmiyyətin gender rollarına dair mövqeyi, dilin formalaşma prosesində mühüm rol oynayır. Bu səbəbdən də gender və dil arasında qarşılıqlı təsirli və kompleks bir münasibət mövcuddur.

Türk və ispan mədəniyyətləri bu münasibətin təzahür formalarını müqayisəli şəkildə öyrənmək üçün əhəmiyyətli nümunələrdir. Hər iki cəmiyyətin tarixi inkişafı, sosial quruluşu və mədəni dəyərləri fərqli olsa da, dilin gender rollarını necə əks etdirdiyi baxımından maraqlı paralellər və fərqliliklər təqdim edir. Xüsusilə, gündəlik ünsiyyətdən tutmuş rəsmi diskursa qədər geniş bir spektrdə qadın və kişi danışıq formaları bu mədəniyyətlərin cinsiyyətə dair normativ sistemlərinin dilə necə sirayət etdiyini göstərir. Beləliklə, dilin cəmiyyətin gender dinamikalarını necə kodlaşdırdığı və bu kodlaşdırmanın mədəni faktorlarla necə formalaşdığı sualı aktuallıq kəsb edir.

Bu tədqiqatın məqsədi, türk və ispan dillərində qadın və kişi diskursu arasındakı fərqlərin arxasında dayanan mədəni, tarixi və sosial faktorları araşdırmaqdır. Burada əsas diqqət dilin içərisində yerləşmiş gender strukturlarının necə formalaşdığına və bu strukturların mədəni kodlarla necə və nə dərəcədə uzlaşdığına yönəldiləcəkdir. Dilin səthi elementləri ilə yanaşı, onun dərin semantik və praqmatik qatlarında cinsiyyətə dair hansı meyarların, gözləntilərin və normativ çərçivələrin mövcud olduğu tədqiqatın əsas istiqamətlərindən birini təşkil edir.

Nəticə etibarilə, türk və ispan mədəniyyətləri arasındakı diskurs fərqlilikləri yalnız linqvistik aspektlərlə izah edilə bilməz. Bu fərqlər daha geniş bir kontekstdə – mədəniyyət, tarix, ideologiya və sosial quruluşların sintezində başa düşülməlidir. Məhz bu baxış bucağı gender və dil arasındakı əlaqəni daha dərindən anlamağa və onu konkret dillər çərçivəsində təhlil etməyə imkan verir.

### Tədqiqat

Türk mədəniyyətindəki diskurs fərqlilikləri. Türk mədəniyyəti əsasən, patriarxal dəyərlər üzərində qurulmuş bir cəmiyyət modelini əks etdirir. Tarixən, ailə institutunun və qohumluq münasibətlərinin güclü təsiri fərdlərin sosial rollarının və bu rolların dilə yansımasının müəyyənləşdirilməsində mühüm rol oynamışdır. Belə bir strukturda qadın və kişi nitqinin formalaşması, ictimai gözləntilərə və mədəni normalara uyğun şəkildə baş verir. Qadınlar daha çox münasibətlərin qorunmasına yönəlmiş, nəzakətli və dolaylı ifadə formalarına üstünlük verdiyi halda, kişilər açıq, qətiyyətli və bəzən dominant diskurs qurmağa təşviq olunurlar (Bayraktaroğlu, 2000; Irzık, 2003).

Türk dilində qadınların danışıq üslubu qeyri-müəyyənlik, emosional ifadə zənginliyi və dolayılıq kimi xüsusiyyətlərlə seçilir. Bu xüsusiyyətlər onların sosial harmoniyanı qorumağa və qarşıdurmadan çəkinməyə yönəlmiş kommunikativ strategiyalarının göstəricisidir (Özkazanç, 2008). Dilsizin (2016) tədqiqatlarına əsasən, qadın nitqində tez-tez "bəlkə", "ola bilər", "görəsən" kimi qeyri-müəyyənlik bildirən formalar müşahidə olunur ki, bu da münasibətlərin zərif şəkildə tənzimlənməsinə xidmət edir. Bu xüsusiyyətlər qadınların daha çox empatiya və anlaşmaya əsaslanan ünsiyyət formalarını seçdiyini göstərir.

Əksinə, kişilər arasında dilin liderlik nümayiş etdirmək, avtoritet göstərmək və sosial statusu gücləndirmək məqsədilə daha açıq və iddialı formada istifadə olunduğu müşahidə olunur. Onların danışıq üslubu daha qətiyyətli, birbaşa və bəzən rəqabətçi xarakter daşıyır. Bu fərqli diskurs

modelləri, cəmiyyətin hər iki cinsdən gözlədiyi sosial funksiyaların və gender əsaslı davranış normalarının dilə necə yansıdığını göstərir.

Bu mənada Edward Goffmanın (1959) "özünü təqdim etmə" nəzəriyyəsi mövcud vəziyyəti təhlil etmək üçün əhəmiyyətli nəzəri çərçivə təqdim edir. Goffmana görə, insanlar sosial həyatlarında özlərini auditoriyaya müəyyən bir şəkildə təqdim etmək üçün performativ strategiyalardan istifadə edirlər. Türk cəmiyyətində də qadın və kişilər üzərlərinə qoyulmuş sosial rollara uyğun olaraq fərqli dil davranışları sərgiləyirlər. Qadınların dili münasibətlərin qorunmasına, kişilərin dili isə sosial mövqeyin və gücün ifadəsinə yönəlmiş olur.

Nəticə baxımından, türk dilindəki cinsiyyətə əsaslanan diskurs fərqlilikləri yalnız fərdi ünsiyyət deyil, həm də bu fərqlərin arxasında dayanan daha geniş mədəni və sosial strukturları əks etdirir. Dil burada yalnız kommunikasiya vasitəsi deyil, eyni zamanda genderlə bağlı sosial gözləntilərin və mədəni kodların daşıyıcısı kimi çıxış edir.

Erdoğan və Günay (2012) qadın nitqində daha çox dəstəkverici, münasibətyönümlü və harmoniya qoruyucu strategiyaların üstünlük təşkil etdiyini vurğulayırlar. Onların fikrincə, qadınlar söhbət zamanı emosional bağların gücləndirilməsi və qarşı tərəfin təsdiqlənməsi məqsədilə daha çox yumşaq və dolayı ifadələrə üstünlük verirlər. Bu, qadınlara aid edilən sosial rolların dilə yansıması kimi qiymətləndirilə bilər.

Kişilər isə, tədqiqatçılara görə, ünsiyyətdə qərarverici və mövqeyini açıq şəkildə ifadə edən üslubdan istifadə edirlər. Bu tip dil istifadəsi, onların sosial funksiyalarını – məsələn, liderlik, qərar vermə və ictimai nüfuzun qorunmasını həyata keçirmək üçün formalaşmışdır. Belə diskurslar, razılaşma ehtimalını azaltmaqla yanaşı, sosial güc nümayiş etdirmək və fərdin ictimai səviyyədə təsdiqini təmin etmək məqsədi daşıyır.

Erdoğan və Günay (2012) bu diskurs fərqlərini türk cəmiyyətinin dərinləşmiş mədəni və sosial strukturuna bağlayaraq qadınları "münasibətqurucu", kişiləri isə "funksiya yerinə yetirici" rollarda təsvir edirlər. Nəticədə, qadınların daha zərif və empatik ünsiyyət formaları, kişilərin isə sərt və açıq ifadələrə əsaslanan üslubu cinslərə xas sosial mövqelərin dilə necə əks olunduğunu nümayiş etdirir.

Bu fərqliliklər təkcə gündəlik ünsiyyət səviyyəsində qalmır, eyni zamanda cəmiyyətin gender əsaslı normativ sistemlərinin dil vasitəsilə yenidən istehsalına da xidmət edir. Beləliklə, türk dilindəki genderə bağlı diskurs strategiyaları, sosiodinamik və mədəni kontekstin ayrılmaz bir hissəsi kimi çıxış edir və fərqlərin yalnız bioloji deyil, həm də sosial konstruksiya nəticəsində formalaşdığını göstərir.

Türk dilində qrammatik cins kateqoriyasının olmaması ilk baxışda dilin gender baxımından neytral olduğu təəssüratı yaratsa da son dövrlərdə aparılan empirik tədqiqatlar bu təsəvvürün tam doğru olmadığını ortaya qoyur. Caglidil və digərlərinin (2024) apardığı genişmiqyaslı araşdırma göstərir ki, türk dilində leksik və semantik səviyyələrdə gender qərəzləri açıq şəkildə mövcuddur. Bu araşdırmaya əsasən, türk dilində tez-tez istifadə olunan dil modelləri kişi cinsinə aid peşə adları, sosial rollar və statuslarla daha çox assosiasiya olunur.

Məsələn, "doctor", "mühəndis", "professor" kimi peşə adları istifadə də əsasən, kişi subyektlərlə əlaqələndirilir. Qadınları təsvir etmək üçün isə, bu peşə adlarına əlavə izahlar ("qadın mühəndis", "qadın lider") ehtiyac duyulur. Bu isə göstərir ki, dil şüuraltı səviyyədə kişi normativliyini təkrarlayır və qadının aktiv lider mövqelərdə təmsil olunmasını qeyri-adi və qeyd olunası bir hal kimi təqdim edir.

Araşdırmada həmçinin vurğulanır ki, media dilində, reklam mətnlərində və gündəlik ünsiyyət formalarında qadınlar daha çox passiv, qayğıkeş və ailəyə bağlı rollarda dil vasitəsilə qurulur. Beləliklə, qrammatik cinsin olmamasına baxmayaraq, sosial təcrübələrdən qaynaqlanan gender stereotipləri türk dilinin semantik strukturlarında davamlı olaraq mövcudluğunu qoruyur.

Caglidil və digərlərinin (2024) tədqiqatı dilin yalnız struktur səviyyədə deyil, həm də diskursiv və ideoloji səviyyədə gender münasibətlərini necə təkrarladığını və möhkəmləndirdiyini aydın şəkildə nümayiş etdirir. Bu, türk dilində gender bərabərliyinə nail olmaq üçün sadəcə qrammatik dəyişikliklərin kifayət etmədiyini, daha dərindən köklənmiş sosial və mədəni kodların da transformasiya olunmasının vacibliyini göstərir.

Digər bir önəmli araşdırmada Savoldi və digərləri (2022) türk dilindəki nitq tərcüməsi modellərində gender qərəzlərini sistemli şəkildə təhlil etmiş və bu qərəzlərin dilin morfosintaktik

xüsusiyyətləri ilə necə əlaqəli olduğunu ortaya qoymuşdur. Tədqiqat nəticələrinə görə, türk dilində cinsiyyət kateqoriyasının qrammatik səviyyədə olmamasına baxmayaraq, tərcümə modellərində və avtomatik dil işləmə sistemlərində genderlə bağlı açıq və ya gizli qərəzlər təkrarlanır.

Müəlliflər göstərirlər ki, tərcümə zamanı neytral ifadələrin kişi cinsinə yönləndirilməsi və ya qadınların müəyyən peşə və fəaliyyət sahələrində təsvirinin daha az olması, türk dilinin morfosintaktik imkanlarının sosial-mədəni normalarla qarşılıqlı əlaqəsinin bir nəticəsidir. Məsələn, gender cəhətdən neytral ifadə tələbi olan situasiyalarda belə, modellər tez-tez kişi cinsini ifadə edən formaları seçir və qadınların aktiv rollarda iştirakını ya gizlədir, ya da marginal bir fenomen kimi təqdim edir.

Bu tədqiqat bir daha təsdiqləyir ki, türk dilində genderlə bağlı diskurs fərqlilikləri yalnız struktur səviyyədə izah olunmamalıdır. Əksinə, bu fərqlər dərin sosial və mədəni kodlarla, cəmiyyətin gender rollarına dair gözləntiləri ilə sıx bağlıdır. Savoldi və digərləri (2022) qeyd edir ki, dilin struktur quruluşu ilə sosial kontekst arasındakı bu qarşılıqlı münasibət gender bərabərsizliyinin yalnız dil səviyyəsində deyil, həm də texnoloji platformalarda və yeni media mühitlərində təkrar istehsalına səbəb olur.

Bu nəticələr türk dilində genderə qarşı həssas və ədalətli dil istifadəsini təşviq etmək üçün yalnız dilin qrammatik quruluşuna fokuslanmanın kifayət etmədiyini, həm də dilin sosial istifadəsi və texnoloji tətbiq sahələrində genişmiqyaslı dəyişikliklərin vacib olduğunu göstərir.

İspan mədəniyyətindəki diskurs fərqlilikləri. İspan mədəniyyəti də patriarxal quruluşa malik olsa da, bu struktur fərqli sosial və mədəni xüsusiyyətlər fonunda formalaşmışdır. İspan dilində gender fərqlilikləri həm dilin qrammatik strukturunda, həm də cəmiyyətin sosial və mədəni gözləntilərində özünü göstərir. Qrammatik cins kateqoriyası yalnız dilin quruluşunu deyil, eyni zamanda cəmiyyətin gender rollarını əks etdirən mühüm bir göstəricidir. Dil istifadəsindəki fərqlər yalnız qrammatik deyil, sosial münasibətlərdəki güc balansını da ifadə edir.

İspan cəmiyyətində qadınların danışıq üslubu adətən onlara aid edilən ənənəvi rollara uyğun olaraq daha münasibətyönümlü, təvazökar və diqqətcil xarakter daşıyır. Kişilər isə daha çox liderlik və güc nümayişinə əsaslanan, birbaşa və qətiyyətli ifadələrdən istifadə edirlər. Məsələn, "yo" (“mən”) əvəzliyinin istifadəsi kontekstində kişilərin öz mövqelərini vurğulamaq meyli daha güclüdür. Əksinə, qadınlar başqalarına yönəlik dəstək və xidmət mahiyyətli üslubu üstün tuturlar.

Bu fərqliliklər ispan cəmiyyətindəki gender stereotiplərinin və sosial gözləntilərin dilə necə yansıdığını göstərir. Qadınların danışığı çox zaman əlaqə yaratmağa, qarşı tərəfi təsdiqləməyə yönəlmişkən, kişilərin dili daha çox liderlik mövqeyinin qorunmasına xidmət edir (López, 2008; González, 2015). Bu tendensiyalar cinsiyyətə xas sosial rolların dil vasitəsilə necə möhkəmləndirildiyini göstərir.

Qadınların dilində “lento” (yavaş), “tranquila” (sakit) kimi ifadələrin istifadəsi onların cəmiyyətdə daha təmkinli və sakit rollarla əlaqələndirildiyini göstərir. Kişilər isə “rápido” (sürətli), “firme” (sabit) kimi ifadələrlə daha qətiyyətli və liderlik mövqeyinə uyğun şablonlara üstünlük verirlər. Bu dil nümunələri ispan mədəniyyətindəki genderəsaslı normativlərin və gözləntilərin təzahürüdür.

Beləliklə, ispan dilindəki diskurs fərqlilikləri təkcə qrammatik cins sistemi ilə məhdudlaşmır, həm də sosial və ideoloji təbəqələrin təsiri ilə formalaşır. Türk dilindəki gender diskursları ilə müqayisədə ispan dilində bu fərqliliklər daha dərin ideoloji strukturların dili necə formalaşdırdığını ortaya qoyur. Hər iki mədəniyyətdə dil yalnız ünsiyyət vasitəsi deyil, həm də cəmiyyətin sosial nizamını və gender normativlərini davam etdirən bir vasitə rolunu oynayır.

Bundan əlavə, gender rollarının təşəkkülü ispan mədəniyyətində uzun müddət katolik dini ənənələri və ailə institutuna əsaslanan dəyərlərlə möhkəmləndirilmişdir. Pilar García Mouton (2003) göstərir ki, ispan qadınlarının dili daha çox emosional məzmunlu, empatiyayönümlü və qarşılıqlı anlaşmanı gücləndirən strategiyalarla xarakterizə olunur. Onlar münasibətləri qoruyan və yaxınlıq yaradan ifadələrə üstünlük verirlər.

Əvəzində kişilər daha çox rasionallığa əsaslanan, açıq və sərt mövqe bildirən, sosial statuslarını ön plana çıxaran dil üslubuna üstünlük verirlər. Bu fərqli ünsiyyət strategiyaları ispan cəmiyyətindəki

genderəsaslı sosial mövqelərin dilə necə yansıdığını və möhkəmləndirildiyini aydın şəkildə ortaya qoyur.

García Mouton (2003) qeyd edir ki, bu fərqlər yalnız şəxsi ünsiyyətdə deyil, həm də rəsmi çıxışlar, kütləvi informasiya vasitələri və ictimai debatlarda aydın şəkildə təzahür edir. İctimai sahədə kişilərin dilinə daha çox "nəzarət edən" və "yönləndirici" üslub xas olduğu halda, qadınların ünsiyyəti "cavab verici" və "konsensusqurucu" xüsusiyyətlər daşıyır.

Bundan əlavə, García Mouton vurğulayır ki, ispan dilinin özündə kişi formalarının "unmarked" (qeyri-işarələnmiş) və qadın formalarının isə "marked" (işarələnmiş) hesab edilməsi, qadınların ictimai diskursda görünürlüğünü sistematik olaraq azaldır. Bu, yalnız dil strukturunda deyil, həm də ideoloji səviyyədə cinslər arasında güc asimmetriyasının bərpasına xidmət edir.

Beləliklə, ispan mədəniyyətində dilin genderləşməsi təkcə fərdi dil seçimlərinin nəticəsi deyil, eyni zamanda tarixi, dini və sosial dəyərlərin yaratdığı dərin köklü normativ çərçivələrin bir təzahürüdür.

Esteban Rodríguez (2005) ispan mediası üzərində apardığı təhlillərdə, kişi və qadın diskursları arasında aydın üslub fərqlərinin olduğunu ortaya qoymuşdur. Onun araşdırmasına görə, kişilər mediada çıxış edərkən daha çox dominant, avtoritar və iddialı dil formalarından istifadə edir, öz güc və nüfuzlarını nümayiş etdirməyə meyil göstərirlər. Bu nitq faktlarında şəxsi mövqelərini vurğulamaq, açıq fikirlər bildirmək və qarşı tərəfi təsir altına almaq məqsədi daşıyan strategiyalar üstünlük təşkil edir.

Qadınlar isə mediada daha çox konsensus yaratmağa yönəlmiş münasibətləri qorumağa və qarşılıqlı anlaşmanı gücləndirməyə xidmət edən dil strukturlarından istifadə edirlər. Onların diskursunda emosional yaxınlıq, qarşı tərəfi dinləmə və anlaşma qurma meyilləri daha nəzərəçarpacaqdır. Rodríguez-in (2005) əldə etdiyi bu nəticələr, Deborah Cameronun (1998) "Performing Gender Identity" nəzəriyyəsi ilə üst-üstə düşür. Cameronun yanaşmasına görə, gender fərqləri dil vasitəsilə sosial praktikalar içində daim "ifa olunur" (performed) və fərqli dil davranışları cinsiyyət identikliyinin yenidən istehsalında mühüm rol oynayır.

Rodríguez həmçinin vurğulayır ki, ispan mediasında qadınların diskursu yalnız fərqli üslub xüsusiyyətləri ilə deyil, eyni zamanda sosial status və güc mövqelərinə çıxış imkanlarının məhdudluğu ilə də formalaşır. Beləliklə, dil istifadəsi fərqləri sadəcə ünsiyyət üslubuna deyil, həm də struktur səviyyəli sosial bərabərsizliklərə işarə edir.

İspan mədəniyyətində kollektivist dəyərlərlə yanaşı fərdiyyətçi meyillər də müşahidə olunur. Katolik ənənələr və güclü ailə institutları uzun müddət cəmiyyətin gender rollarını müəyyənləşdirmişdir. Bu təsirlər, dil səviyyəsində də özünü göstərmiş, xüsusilə kişi cins formasının "neytral" kimi qəbul edilməsi qadınların dil içində görünürlüğünün azalmasına səbəb olmuşdur (Vigara Tauste, 1992; Calero Vaquera, 1997). Lakin son onilliklərdə feminist hərəkatların və dil siyasətlərinin təsiri ilə İspan dilində gender inklüzivliyinə yönəlik ciddi addımlar atılmış, qadın görünürlüğünü artırmaq məqsədi ilə islahatlar həyata keçirilmişdir (Bengoechea, 2001).

İspan diskursunda qadınların dil istifadəsi, daha çox dolayı ifadələrə, emosional vurğulara və qarşılıqlı anlaşmanı gücləndirən ünsiyyət strategiyalarına əsaslanır. Kişilər isə birbaşa, açıq və məqsədyönlü ifadə tərzlərinə üstünlük verirlər (Coperías Aguilar, 2005). Bununla belə, müasir dövrdə İspan cəmiyyətində baş verən dil dəyişiklikləri və genderə həssas kommunikasiya təşəbbüsləri, qadınların ictimai diskursda daha aktiv və tələbkar mövqe tutmalarına imkan yaratmışdır.

Qrammatik cins sistemi ispan dilinin əsas xüsusiyyətlərindən biridir. İsim, sifət və əvəzliklərin kişi (masculino) və qadın (femenino) formaları üzrə dəyişməsi, cinsiyyət fərqlərini yalnız leksik və sintaktik deyil, həm də semantik səviyyədə ifadə etməyə imkan verir. Bu struktur xüsusiyyət, dilin genderə dair sosial və ideoloji məzmununu daha da ön plana çıxarır.

Son illərdə İspaniyada gender inklüzivliyi istiqamətində dil sahəsində mühüm dəyişikliklər təşviq olunmuşdur. Xüsusilə, qeyri-binar və gender müxtəlifliyini əhatə edən yeni dil formalarının yaradılması və rəsmi istifadəyə keçirilməsi üçün ciddi cəhdlər göstərilmişdir. 2020-ci ildə Real Academia Española (RAE) tərəfindən "elle" gender neytral əvəzliyinin qeydə alınması bu prosesin əlamətdar bir mərhələsi olmuşdur. "Elle" əvəzliyi ənənəvi "él" (o, kişi üçün) və "ella" (o, qadın üçün)

formalarının alternativi olaraq qeyri-binar şəxslərin identifikasiyasını dil səviyyəsində tanımaq məqsədi daşıyır.

Bu yenilik, dilin sosial dəyişikliklərə uyğun elastikliyini göstərməklə yanaşı, İspaniyada gender ədalətinə və inklüzivliyə yönəlik ictimai şüurun artdığını da əks etdirir.

María Paz Battaner və Antonio Briz (2021) kimi çağdaş ispan dilçiləri vurğulayırlar ki, dilin gender inklüzivliyinə doğru transformasiyası yalnız texniki və ya linqvistik dəyişikliklərlə məhdudlaşmır əksinə, bu dəyişikliklər daha geniş ideoloji və sosial dinamikanın bir ifadəsi kimi dəyərləndirilməlidir. Onların fikrincə, dil sadəcə informasiya ötürən neytral bir vasitə deyil, sosial reallıqları yaradan və möhkəmləndirən bir güc strukturudur. Bu baxımdan, gender neytral ifadələrin təşviqi və qeyri-binar formaların dilə daxil edilməsi, cəmiyyətin gender kimliyi və bərabərlik haqqında dəyişən anlayışlarının birbaşa nəticəsi kimi çıxış edir.

Battaner və Briz həmçinin qeyd edirlər ki, dilin transformasiyası, fərdi kimliklərin tanınması və inklüzivliyin artırılması məqsədilə sosial məkanda yeni ifadə vasitələrinin yaradılmasına imkan verir. Bu yanaşma, Michel Foucaultnun dil və hakimiyyət münasibətləri haqqında nəzəriyyəsi ilə də səsləşir; belə ki, dil yalnız reallığın təsviri deyil, eyni zamanda reallığın qurulması üçün əsas mexanizmdir. Beləliklə, ispan dilində aparılan genderə həssas dil dəyişiklikləri, genişləndirilmiş bərabərlik tələbləri və sosial inklüzivlik təşəbbüsləri ilə paralel inkişaf edir, bu da dilin, cəmiyyətin ideoloji xəritədəki yerini və funksiyasını bir daha gücləndirir.

Derner və həmkarlarının (2024) apardığı müasir tədqiqatda, ispan dilində yaradılmış genişmiqyaslı mətn korpusları üzərində aparılan analizlər nəticəsində gender əsaslı diskurs fərqliliklərinin miqyası və xarakteri empirik şəkildə müəyyən edilmişdir. Tədqiqatçılar süni intellektə əsaslanan böyük dil modellərindən (large language models – LLM) istifadə edərək kişi və qadın cinsinə aid terminlərin tezlik göstəricilərini müqayisəli şəkildə təhlil etmişlər. Nəticələr göstərmişdir ki, kişi cinsinə aid ifadələr qadın cinsinə aid ifadələrlə müqayisədə təxminən 4:1-dən 6:1 nisbətində daha çox təmsil olunmuşdur. Bu fərq yalnız dilin qrammatik və leksik strukturlarından irəli gəlmir əksinə, o, dilin daşıdığı sosial-mədəni kodların və dominant ideoloji çərçivələrin təsiri ilə daha da dərinləşir. Beləliklə, bu nəticə ispan dilində genderlə bağlı diskursun təkcə dilin daxili quruluşundan deyil, həm də cəmiyyətin tarixi, sosial münasibətlər sistemi və mədəniyyətindən qaynaqlandığını göstərən mühüm bir sübut kimi qiymətləndirilə bilər.

## Nəticə

Mədəniyyətlərarası müqayisə göstərir ki, türk və ispan dillərində kişi və qadın diskursu arasındakı fərqliliklər sadəcə linqvistik səviyyədə deyil, daha geniş sosial və ideoloji kontekstlərdə formalaşır. Hər iki dilin cinsə görə fərqli diskurs strategiyaları, həmin cəmiyyətin gender rollarına və mədəniyyətin nitqə yansımasına dair spesifik yanaşmalarını əks etdirir.

Türk cəmiyyətində qadınların dil istifadəsi daha çox ənənəvi və kollektivist dəyərlərlə bağlı olub, ehtiyatlı və dolayı ünsiyyət formaları ilə xarakterizə olunur. Bu, qadınların cəmiyyət daxilindəki mövqeyinə uyğun olaraq nitqlərində uyğunlaşma, nəzakət və qarşılıqlı anlaşma meyllərinin güclü şəkildə təzahür etməsi ilə müşahidə edilir. Eyni zamanda kişilər daha çox rəsmi, açıq və dominant nitq aktlarına üstünlük verirlər ki, bu da patriarxal sosial sistemin dilə sirayət etmiş bir nəticəsi kimi qiymətləndirilə bilər.

İspan mədəniyyətində isə xüsusilə, son onilliklərdə baş verən feminist dəyişikliklər və gender bərabərliyinə yönəlik ictimai təşəbbüslər qadınların diskursunda daha ifadəli, sərbəst və fərdiyyətçi ünsiyyət modelini ön plana çıxarmışdır. Burada qadınların daha emosional, empatiyayönümlü və əlaqə qurmağa əsaslanan üslubuna qarşılıq, kişilərin daha birbaşa, informasiyayönümlü və hökm bildirən nitq tərzi müşahidə edilir (Lakoff, 1975; Tannen, 1990; Cameron, 2006).

Hər iki mədəniyyətdə qadınların sosial məhdudiyyətlər səbəbi ilə daha çox dolayı, adaptiv və harmoniyaya yönəlmiş strategiyalara üstünlük verdiyi halda, kişilər dil vasitəsi ilə simvolik güc və status nümayiş etdirmək meyli göstərirlər. Bu fərqliliklər yalnız fərdi seçimlərdən deyil, həm də cəmiyyətin genderlə bağlı ideoloji strukturundan qaynaqlanır (Holmes, 1995; Mills, 2003).

Bununla yanaşı, ispan dilində qrammatik cinsin olması, dilin özündə gender fərqliliklərinin daha açıq şəkildə kodlaşdırılmasına səbəb olur. Kişi formalarının "neytral" sayılması və qadın formalarının "işarələnmiş" hesab edilməsi dilin ideoloji funksiya daşıdığını, yəni cinslərarası güc münasibətlərini dil səviyyəsində də bərpa etdiyini göstərir (Alcaraz, 2010).

Nəticə etibarı ilə, dil və gender arasındakı əlaqə sadəcə struktur səviyyəsində deyil, sosial, mədəni və ideoloji faktorların qarşılıqlı təsiri ilə formalaşır. Diskursda müşahidə olunan gender fərqlilikləri həm dilin öz kodlarında, həm də danışanın mövcud olduğu sosial-mədəni mühitdəki mövqeyində əks olunur. Bu baxımdan, dilin gender aspektlərini öyrənmək üçün onu cəmiyyətin ideoloji və mədəni çərçivəsindən ayrı düşünmək mümkün deyildir.

## Ədəbiyyat

1. Alcaraz, E. (2010). *Lenguaje, mujer y sociedad: Un análisis cultural*. Barcelona.Editorial Gedisa.
2. Battaner, M.P., Briz, A. (2021). *Lenguaje, sociedad y cambio social: Nuevos retos para la lingüística*. Barcelona. Ariel.
3. Battaner, E., Briz, A. (2021). *El lenguaje inclusivo: de la teoría a la práctica*. Madrid. Ediciones Cátedra.
4. Bayraktaroğlu, A. (2001). Metapragmatics of gendered speech: Honorifics and occupational titles in Turkish. In: Hellinger, M. & Bussmann, H. (Eds.), *Gender across Languages: The Linguistic Representation of Women and Men* . Amsterdam. John Benjamins.
5. Bengoechea, M. (2001). Sexismo lingüístico y visibilidad de la mujer. *Revista de Filología de la Universidad de La Laguna*, №19.
6. Bengoechea, M. (2009). La visibilidad de la mujer en el discurso institucional. *Revista de Filología Española*, 89(1).
7. Brown, P., Levinson, S.C. (1987). *Politeness: Some universals in language usage*. Cambridge: Cambridge University Press.
8. Caglidil, O., Ostendorff, M., Rehm, G. (2024). Investigating Gender Bias in Turkish Language Models. *arXiv preprint*, arxiv,2404.11726.
9. Calero Vaquera, M.L. (1997). Sexo, género y lenguaje: una perspectiva sociolingüística. *Oralia: Análisis del Discurso Oral*, №0.
10. Calero Vaquera, M.L. (1997). *El sexismo en el lenguaje*. Sevilla: Universidad de Sevilla.
11. Cameron, D. (1998). Performing gender identity: Young men's talk and the construction of heterosexual masculinity. In: Coates, J. (Ed.), *Language and Gender: A Reader*. Blackwell.
12. Coperías Aguilar, M.J. (2005). Comunicación y género: Estilos comunicativos en hombres y mujeres. *Revista Española de Lingüística Aplicada*, №18.
13. Demir, C. (2011). Türkçede cinsiyetsiz dil kullanımı üzerine bir değerlendirme. *Türkbilig*, №22.
14. Derner, E., Guimaraes, G. (2024). *Quantifying gender representation bias in Spanish text corpora*. *arxiv preprint*, arxiv, 2406.13677.
15. Derner, M., Maudslay, R., Pavlick, E. (2024). Measuring representational bias in Spanish with large language models. *arxiv preprint*, arxiv:2406.13677. https://arxiv.org/abs/2406.13677
16. Dilsiz, İ. (2016). *Türk kültüründe cinsiyet rolları və dil kullanımı*. İstanbul: XYZ Yayıncılık.
17. Erdoğan, E., Günay, V. (2012). *Dil və toplumsal cinsiyet*. Alfa Yayınları.
18. Fairclough, N. (1995). *Critical discourse analysis: The critical study of language*. Longman.
19. Foucault, M. (2002). *The Archaeology of Knowledge*. Routledge.
20. García Mouton, P. (2003). *Lenguaje y discriminación sexual*. Ediciones Cátedra.
21. García Mouton, P. (2003). *Lenguaje y género en la sociedad española: Entre tradición y cambio*. Ediciones Cátedra.
22. Goffman, E. (1959). *The presentation of self in everyday life*. Garden City, NY: Doubleday Anchor Books.
23. González Sanz, M., Polo Cano, N. (2023). Creencias en torno a la manifestación del género en las voces españolas. *ELUA: Estudios de Lingüística*, №37.
24. Holmes, J. (1995). *Women, Men and Politeness*. Longman.

25. Irzık, S. (2003). Feminism and the question of postmodernism in Turkey. In: Lewis, R., Mills, S. (Eds.), *Feminist Postcolonial Theory: A Reader*. Routledge.
26. Lakoff, R. (1975). *Language and Woman's Place: Text and Commentaries*. Harper & Row.
27. López Díez, P. (2008). Los medios y la representación de género: algunas propuestas para avanzar. *Feminismos*, №11.
28. Mills, S. (2003). *Language and Sexism*. Cambridge University Press.
29. Özkazanç, A. (2008). *İktidarın bedeni: Feminizm, biyopolitika ve özne*. İletişim Yayınları.
30. Özkazanç, A. (2011). *Toplumsal Cinsiyet ve Dil: Feminist Söylem Analizleri*. Metis Yayınları.
31. Pérez, J. (2000). *La España de los Austrias: La configuración de la sociedad moderna*. Cátedra.
32. Real Academia Española. (2020). *Inclusión del pronombre 'elle' y los cambios recientes en el idioma español*. RAE Publications.
33. Real Academia Española. (2020). *Informe sobre el uso de lenguaje inclusivo*. RAE.
34. Rodríguez, E. (2005). *Lenguaje, género y medios de comunicación en España*. Editorial Tecnos.
35. Savoldi, B., Sprugnoli, R., Passarotti, M., Nissim, M. (2022). Gender bias in machine translation: A case study on Turkish. *arXiv preprint*, arXiv:2203.09866.
36. Tannen, D. (1990). *You just don't understand: Women and men in conversation*. Ballantine Books.
37. Vigara Tauste, A.M. (1992). *Lenguaje y discriminación sexual*. Cátedra.
38. Vigara Tauste, A.M. (2000). *Lenguaje, Mujer y Poder*. Cátedra.
39. Vigara Tauste, A.M. (1992). *Lenguaje, sexo y discriminación*. Narcea Ediciones.

Daxil oldu: 02.02.2025
Qəbul edildi: 13.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/30-35

**Vəfa Nəcəfova**
Milli Aviasiya Akademiyası
iqtisadiyyat üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-7410-3514
vnacafova@naa.edu.az

# Mülki aviasiyada biznes - sistemin inkişafının sosial-iqtisadi aspektləri

## Xülasə

Məqalədə mülki aviasiya sahəsində və onun biznes-sisteminin inkişafının sosial-iqtisadi mahiyyəti və amilləri barədə müxtəlif elmi-nəzəri yanaşmalar öyrənilmiş və müvafiq ümumiləşdirmələr edilmişdir. Biznes-məkanın mikromühit, sahə və bazar mühiti, təşkilatın bazar mühitinə inteqrasiyasının tipləri (insorsinq, autsorsinq və virtual) təsərrüfat əməliyyatlarının həyata keçirilməsi ilə əlaqədar transaksion xərclər ətraflı araşdırılmışdır. Burada həmçinin, təşkilatın əsas fəaliyyət növlərinin iqtisadi məqsədləri və onlara nail olmaq üçün biznes-sistemin yerinə yetirdiyi funksiyalar dəqiqləşdirilərək şəkil formasında təqdim edilmişdir. Məqalədə tətbiq olunan biznes-sistemlərin sosial-iqtisadi təsirləri araşdırılır. Müəllif mülki aviasiyanın məşğulluq, regional inkişaf və milli iqtisadiyyata təsirini təhlil edir, beynəlxalq təcrübəni müqayisə edir və Azərbaycan üçün inkişaf təklifləri verir. Məqalə göstərir ki, düzgün yönəldilmiş biznes-sistemlər bu sahənin potensialını maksimum səviyyədə üzə çıxarmağa imkan verir.

***Açar sözlər:*** *mülki aviasiya, biznes-sistem, biznes-məkan, transaksion xərclər, strateji planlaşdırma, inkişaf strategiyası*

**Vafa Najafova**
National Aviation Academy
PhD in Economics
https://orcid.org/0009-0006-7410-3514
vnacafova@naa.edu.az

# The Socio-Economic Aspects of Business System Development in Civil Aviation

## Abstract

The article explores various theoretical and scientific approaches to the development of the business system in the field of civil aviation and its socio-economic foundations and factors. The microenvironment of the business space, industry and market environment, types of integration of an organization into the market environment (insourcing, outsourcing, and virtual), and the transactional costs associated with the execution of economic operations are thoroughly analyzed. The article also clarifies the economic goals of the main activities of the organization and the functions performed by the business system to achieve these goals, presented in the form of diagrams. The socio-economic impacts of implemented business systems are examined. The author analyzes the influence of civil aviation on employment, regional development and the national economy, compares international experiences and provides development proposals for Azerbaijan. The article demonstrates that well-structured business systems allow for the full realization of the sector's potential.

***Keywords:*** *civil aviation, business system, business location, transactional expenses, strategic planning, development strategy*

 

## Giriş

Qlobal iqtisadiyyatın sürətlə inkişaf etdiyi müasir dövrdə nəqliyyat sektorunun, xüsusilə də mülki aviasiyanın rolu əhəmiyyətli dərəcədə artmışdır. Mülki aviasiya yalnız sərnişin və yük daşımalarını həyata keçirən texniki sistem deyil, həm də sosial-iqtisadi proseslərə təsir göstərən kompleks biznes sistemidir. Bu sektor turizm, ticarət, regional inkişaf, məşğulluq və beynəlxalq əməkdaşlıq sahələrində mühüm rol oynayır. Müasir idarəetmə və biznes modellərinin tətbiqi mülki aviasiyanın davamlı və rəqabətqabiliyyətli inkişafını təmin edir. Bu səbəbdən, mülki aviasiyada biznes-sistemlərin inkişaf dinamikasının və onların sosial-iqtisadi təsirlərinin araşdırılması elmi və praktiki baxımdan xüsusi aktuallıq kəsb edir.

Biznes-sistem — təşkilatın idarə olunmasında istifadə olunan resurslar, proseslər və strukturların kompleksidir. Mülki aviasiya sahəsində bu sistemlərə aşağıdakılar daxildir:

- aviaşirkətlərin idarəetmə modeli (low-cost, premium və ya hibrid modellər);
- xidmətlərin rəqəmsallaşdırılması və avtomatlaşdırılması (bilet satışı, check-in sistemləri);
- infrastrukturun idarə olunması (hava limanları, logistik mərkəzlər);
- strateji tərəfdaşlıqlar və alyanslar (Star Alliance, oneworld və s).

Müasir biznes-sistemlər çevik idarəetmə, yüksək müştəri məmnuniyyəti və xərclərin optimallaşdırılması ilə fərqlənir. Əlavə olaraq, “hub and spoke” və “point-to-point” kimi model fərqlilikləri də konkret biznes yanaşmalarını formalaşdırır.

Strateji planlaşdırma konsepsiyaları müəyyən təşkilati mahiyyətin - müəssisə, firma, şirkət və korporasiyanın saxlanılması və inkişafı ideyasına tabedir. Həmin konsepsiyalar çərçivəsində alınan nəticələrin real biznesin şərtlərinə və məhdudiyyətlərinə uyğunsuzluğunu tektomərkəzi paradiqma heç vaxt şübhə altına almayıb. Eyni zamanda, nəzəri cəhətdən artıq təsdiq edilmişdir ki, istənilən təşkilat adamlar tərəfindən müəyyən birgə fəaliyyətin həyata keçirilməsinin yalnız spesifik formasıdır.

Təşkilatın dəqiq və tam mahiyyətini ilk dəfə B.Z.Milner müəyyənləşdirmişdir. O, hesab edir ki, təşkilat müəyyən sərhədlərlə ağıllı uyğunlaşdırılan sosial təşkili ifadə edr ki, hansı ki məqsədə, yaxud məqsədlərə nail olmaq üçün nisbətən daimi əsasda fəaliyyət göstərir. “Sosial uyğunlaşma” sözü altında idarəetmə başa düşülür, həm də təşkilat öz aralarında qarşılıqlı fəaliyyət göstərən ayrı-ayrı adamlardan, yaxud onların qrupundan ibarətdir (Azoev, Chelenkov, Konkurentnye, 2000. s. 46). Deməli, əgər fəaliyyətin məzmunu dəyişilirsə, təşkilat mütləq dəyişilməlidir. Əgər təşkilatda dəyişiklik onun məzmunundakı dəyişikliklə əlaqədardırsa, onda məntiqi nəzərdə tutmaq olar ki, strateji planlaşdırmanın obyekti adamların qarşılıqlı hərəkətinin məqsədyönlü fəaliyyəti, yəni biznes olmalıdır. Təşkilatın inkişaf strategiyası biznesin inkişaf strategiyası istiqamətində formalaşdırılmalıdır. Təşkilatın inkişafı dünyada onun funksional faydalı inkişaf imkanlarının tanınmasına əsaslanmalıdır, çünki onun ümumiyyətlə mövcudluğu və funksiyaları lazımdır. Öz funksiyasını başa düşmək, onun inkişaf imkanlarını və tələbatı qiymətləndirmək üçün makrosistem elementini dərk etmək lazımdır, nə qədər funksiya sadəcə hərəkət deyil, bəzi makroprosesin ayrılmaz hissəsidir.

### Tədqiqat

Sistemli təhlil nöqteyi-nəzərincə strateji planlaşdırmanın klassik nəzəriyyəsinin tektomərkəzi paradiqması tədqiqatçı qarşısında duran şəraitin maksimum sadələşdirilməsidir. Aydındır ki, müasir təşkilat özlüyündə daxilən mürəkkəb sistemləridir. Amma bu heç bir şəkildə təşkilatın inkişaf strategiyasını müəyyənləşdirməməlidir. Təşkilatın mənası o demək deyil ki, element kimi daxil olduğu sistemdə özündən xaricən və daxilən təqdim edir. Əgər təşkilat özünü qoruyub saxlamağa cəhd edirsə, ilk növbədə öz daxili nizam-intizamının saxlanılması haqqında deyil, öz təyinatı haqqında, öz sistem funksiyası haqqında narahat olmalıdır, nə qədər ki bütün qaydalar deyil, yalnız məqsədyönlü qaydalar yaradıcıdır, faydalıdır, funksional yararlığını itirən zaman təşkilatın dəstəklədiyi daxili nizam-intizam məqsədyönlü olmur. Amma təşkilatın elədiyi funksional yararlılığı özü deyil, onun xarici mühiti müəyyənləşdirir.

Müasir iqtisadçılar arasında istehlakçı üstünlüklərinin əldə edilməsi üzrə leqal nəticəsində maksimum mənfəətin alınması məqsədi olan təsərrüfat təşkilatı barədə fikir ayrılığı vardır. Belə

nöqteyi-nəzər təşkilatın yaranması, mövcudluğu və ləğv olunması səbəblərini izah etməyə imkan vermir. Bundan başqa belə müəyyənləşdirmədə şübhəsiz təşkilatlar rəqiblərə, yəni eyni məqsədə nail olmaqda maraqlı olan hüquqi, yaxud fiziki şəxslərə çevrilirlər (Alimagamedova, 2009. s.13).

Praktikada təşkilatlar özlərinin mövcudluğu və inkişafının məqsədlərini başqa cür (fərqli) müəyyənləşdirir və müxtəlif şəkildə ifadə edirlər. Müəyyən qrup əhalinin tələbatının ödənilməsinə cəhd; daha yaxşı milli şirkət yaratmağa cəhd; istehsal etdiyi əmtəə və xidmətlərin keyfiyyətinin yüksəldilməsinə cəhd. Lakin məqsədlərinin maksimum mənfəət almaq olduğunu heç zaman qeyd etmirlər.

*Biznesin formalaşması və inkişafı şəraitində sürətli dəyişikliklərin baş verməsi daha kəskin sual qoyur: təsərrüfat təşkilatı nədir və o, ümumiyyətlə, nə üçün mövcuddur?*

Aydındır ki, təşkilatların yaranması və mövcudluğu hər bir fərdi şərait ya gəlirli, ya da mümkün olmayanda birgə fəaliyyət nəticəsində gəlirin alınmasında adamlara kömək göstərmək üçün vacibdir.

Mülki aviasiyanın iqtisadi təsirləri bir neçə istiqamətdə təhlil oluna bilər:

-Aviaşirkətlərin gəlirləri, dövlət büdcəsinə vergi ödəmələri, beynəlxalq uçuşlardan gələn valyuta daxilolmaları;

- Aviasiyanın dəstəklədiyi turizm, ticarət, mehmanxana və logistika sahələrinin inkişafı;
- Bir aviasiya iş yerinin digər sahələrdə 3–4 əlavə iş yerinin yaranmasına səbəb olması.

İqtisadi cəhətdən inkişaf etmiş ölkələrdə mülki aviasiyanın ÜDM-ə töhfəsi 3–5% arasında dəyişir. Dünya Bankı və ICAO kimi qurumların hesabatlarına görə, düzgün idarə olunan aviasiya sektoru milli iqtisadi inkişafın lokomotivi ola bilər.

1937-ci ildə Amerika iqtisadçısı Ronald Qari Kouz "Firmanın təbiəti" əsərində qeyd etmişdir ki, təşkilatların sərhədi təsərrüfat əlaqələrinin qurulması ilə əlaqədar xərclərlə müəyyən edilir, bunun nəticəsində bütöv sosial təşkil kimi birləşmək və fəaliyyət göstərmək adamlara daha faydalıdır, nəinki müstəqil iqtisadi subyekt qismində fəaliyyət göstərmək. Təşkilatın üzvü olan adamlar özünün bazar azadlığının hissəsini itirir. R.Q.Kouzun fikrincə, onlar bazar vasitəsilə təsərrüfat əməliyyatlarının həyata keçirilməsilə əlaqədar öz transaksion xərclərini minimumlaşdırmaqdan ötrü buna gedirlər.

Transaksion xərclərə aiddir:

- gəlirli işgüzar əlaqələrin (tərəfdaşların, investorların, müştərilərin) qurulması üzrə müxtəlif növ xərclər;
- rəqiblərin neqativ təsirlərinin aradan qaldırılması ilə əlaqədar xərclər;
- səhvlər və pozuntularla əlaqədar xərclər;
- vasitəçilərin xidmət haqqına məsariflər;
- biznes-münasibətləri iştirakçılarının maraqlarının razılaşdırılması mexanizmlərinin tətbiqinə xərclər;
- istehsal mexanizmlərinin təkmil olmaması üzündən yeni yaradılan dəyərin müəyyən hissəsinin itirilməsilə əlaqədar xərclər.

Bazar vasitəsilə bəzi əməliyyatların həyata keçirilməsi üçün bu əməliyyatın əksinə olan iştirakçını müəyyənləşdirmək, şərtləri razılaşdırmaq məqsədilə bir sıra danışıqlar aparmaq, müqavilə bağlamaq və onun icrasına nəzarət etmək lazımdır. Təşkilat daxilində bütün əməliyyatlar sadəcə inzibati qərarlarla həyata keçirilir və ona görə də bazar şəraitində ola bilən transaksion xərclər burada praktiki olmur.

Biznesin inkişafı ilə əlaqədar transaksion xərcləri çox vaxt qiymətləndirmək mümkün olmur və onların miqdarı barədə dolayısı buraxılmış imkanları qiymətləndirmək vasitəsilə fikir söyləmək olar. Buraxılan imkanlar dedikdə təsərrüfat resurslarının (material, maliyyə, əmək və intellektual) sərəncamında olan alternativ istifadə qərarlarından ən yaxşısı başa düşülür. Buraxılmış imkanların dəyəri alına biləcək iqtisadi effekt və əslində faktiki alınan effekt arasındakı fərqə bərabərdir.

Əgər biznesin inkişafından təşkilatın aldığı balans mənfəəti, həmin təşkilatın buraxılmış iqtisadi effektini örtmürsə, onda təşkilat müsbət balans mənfəəti alır, amma bununla belə onun fəaliyyətinin iqtisadi effekti mənfi hesab edilir. Bu iqtisadi effekt hələ iqtisadi mənfəət adlanır (Milner, 1999. s.21).

Transaksion xərclər problemi işgüzar əlaqələrin lokallaşmasının nəticəsi kimi yaranır. Tam dəqiq informasiya olmadan heç kim inana bilməz ki, əldə etdiyi resurs, əmtəə və xidmətə görə artıq haqq ödəmir həmçinin, cəmiyyətdə yerinə yetirdiyi funksiyasına görə həqiqi qiymətini alır.

R.Kouzun fikrini inkişaf etdirərək təxmini söyləmək olar ki, işlənilən biznes növü ilə bağlı transaksion xərclərin məbləği özünəməxsus qiymətdir, hansı ki biznesin öz əmtəəsinə, yaxud xidmətinə görə arzuolunan qiyməti almaqdan ötrü mütləq ödəməlidir. Başqa sözlə, transaksion xərclərin məbləği – biznesin qiymətidir. Əgər əmtəə və xidmətin qiyməti tələb və təklifin razılaşdırılması vasitəsilə bazar tərəfindən tənzimlənirsə, onda biznesin qiymətini təşkilat özü tənzimləyə bilər.

Maksimum mümkün mənfəətin alınması biznesin iqtisadi məqsədi ola bilər, amma təşkilatın iqtisadi məqsədi transaksion xərclərin, yaxud biznesin qiymətinin minimumlaşdırılmasıdır. Biznes formalaşdıqdan sonra təşkilat yaranır, biznesin inkişafı qanunauyğun transaksion xərclərin artmasına gətirib çıxarır. Transaksion xərclərin məbləğinin minimumlaşması və inkişafı qanunauyğun haldır. Təşkilatın dağılması həmçinin biznesin pisləşməsi (zəiflənməsi) ilə başlayır. Əgər transaksion xərclərin məbləği biznesin mənfəətliliyi ilə müqayisədə çox yüksək olarsa, onda təşkilat və biznesin arasında uyğunsuzluq yaranır, yəni forma və məzmun arasında dialektik zidiyyət baş verir. Bu ziddiyyətin aradan qaldırılması ya biznes sferasının dəyişilməsi vasitəsilə onun yenidən profilləşdirilməsi, ya da yeni təşkilati formada biznesin saxlanılması məqsədilə onun transformasiyası vasitəsilə mümkündür, hansıki həmin biznesə prinsipcə yeni qiymət səviyyəsi verir.

Beləliklə, cəmiyyətdə müəyyən kommersiya gəliri ilə istehlak dəyərinin yaradılmasına və reallaşdırılmasına yönəldilən insanın məqsədyönlü fəaliyyət üsulu kimi biznesin cəlbediciliyi və effektivliyi təşkilatın daxilində, onun xarici mühitində, sahədə və bazarda münasibətlər sistemindən bilavasitə asılıdır. Belə münasibətlər sistemini göstərmək üçün biznes-sistem anlayışından istifadə olunur, məhz biznes-sistem müvafiq biznesin qiymətinə son nəticədə təsiri müəyyənləşdirəcək.

İstənilən biznesin qlobal sistem funksiyası cəmiyyətin imkanlarını konkret tələbatın ödənilməsinə çevirməkdən ibarətdir. Bu funksiyanın həm təşkilatın daxili potensialı ilə şərtlənən daxili məhdudiyyətləri, həm də makroamillərin təsiri ilə şərtlənən xarici məhdudiyyətləri olur. Biznes-sistem mahiyyətcə konkret biznesin qlobal sistem funksiyasının bütün elementlərini birləşdirir. Ona görə də əsas strateji məsələ biznes – imkanların, son tələbatların, makro və mikroşəraitin seçilməsi haqqında optimal qərarların qəbulundan ibarətdir.

Bir təşkilat çərçivəsində mürəkkəb məhsul istehsalı mütləq öz arxasınca istifadə olunan resursların, texnologiyanın və kapitalın müvafiq artımı ilə müşayiət edilən çoxsahəli korporasiyada təşkilata çevrilir. Onun arxasınca idarəetmə sistemi mürəkkəbləşir və biznesin effektivliyi aşağı düşür. İş təkcə onda deyil ki, istənilən sistemdə əlaqələrin genişləndirilməsi ilə onun imtina ehtimalı artır, həm də sistem elementlərinin adekvat (rəqabətqabiliyyətli) səviyyəsinin saxlanılmasına daha çox qüvvə və vəsait sərf olunur. Texnoloji, texniki, maliyyə, kadr və elmi xarakterli məsələlərin miqdarı və müxtəlifliyi artır.

Təşkilatla bağlı eyni dəyişikliklər bazarda da baş verir. Belə ki, istehlakçı fərdiləşdikcə onun tələbatının mürəkkəbliyi artır. Deməli, istehlakçını “zəbt” etmək üçün təkliflərin mürəkkəbliyi onun tələbatının mürəkkəbliyindən az olmamalıdır. Son istehlakçını “zəbt” etməkdən ötrü təşkilat faktiki supermarketə çevrilməlidir.

Bazar münasibətləri şəraitində firma və şirkətin əsas fəaliyyət növlərinin bütün məqsədləri içərisində iqtisadi məqsədləri xüsusi yer tutur:

- istehsal-kommersiya fəaliyyətindən mənfəətin artması;
- kapital qoyuluşunun ödənilməsinin surətlənməsi;
- işçilərin sosial məsələlərinə nail olunması;
- ölkə qarşısında qoyulan iqtisadi öhdəlik.

İstənilən şirkət xüsusilə aviaşirkətlər göstərilən məqsədlərə uyğun olaraq aşağıdakı funksiyaları yerinə yetirir (Efremov, 2001. s.13).




***Şəkil 1. Biznes-sistemin əsas məqsədləri və funksiyaları***

Funksional strategiyanın formalaşması problemi daxili altsistem üçün xüsusi aktuallıq kəsb edir, onun həlli prosesində icraçılar arasında idarəetmə və bölgünün daha məqsədyönlü strukturu müəyyənləşdirilir.

Regional biznes-sistemin fəaliyyəti region əhalisinin həyat səviyyəsinin yüksəldilməsinə, region ərazisinin sosial, təsərrüfat, resurs və iqtisadi potensialının balanslı təkrar istehsalının təmin edilməsinə hədəflənir. Biznes-sistemin inkişaf strategiyasının reallaşdırılması mürəkkəb sosial-iqtisadi sistem kimi onun özünütəşkili prosesində həyata keçirilir ki, bu da xarici mühitin surətlə dəyişilməsi, təsərrüfat fəaliyyətinin xarici tənzimlənməsinin effektivsizliyi ilə şərtlənir.

Azərbaycan Hava Yolları QSC (AZAL) ölkənin əsas milli aviadaşıyıcısı olaraq fəaliyyətini genişləndirməkdədir. 2024-cü ildə AZAL 4 milyon 44 min sərnişin daşıyaraq 2 milyard 99 min manat gəlir əldə etmişdir. Bu, əvvəlki illərlə müqayisədə əhəmiyyətli artımı göstərir. 2025-ci ilin ilk rübündə isə şirkət 865,000 sərnişin daşıyaraq, uçuşlarının 89%-ni vaxtında icra etmişdir. Bu göstəricilər AZAL-ın xidmət keyfiyyətindəki müsbət inkişafı əks etdirir.

AZAL təyyarə parkını müasir və yanacağa qənaət edən hava gəmiləri ilə yeniləməyə davam edir. 2023-cü ildə şirkət "Airbus A320neo", "Airbus A321neo" və "Boeing 787-8 Dreamliner" kimi yeni təyyarələri donanmasına əlavə etmişdir. Bu təyyarələr əvvəlki modellərlə müqayisədə hər oturacağa görə təxminən 15-30% daha az yanacaq sərf edir. Bu modernizasiya həm əməliyyat səmərəliliyini artırır, həm də ətraf mühitə təsiri azaldır.

AZAL rəqəmsal həllərin tətbiqinə xüsusi önəm verir. Aviabiletlərin onlayn satışı, mobil tətbiqlər və elektron qeydiyyat sistemləri sərnişinlərə daha rahat xidmət göstərilməsini təmin edir. 2024-cü ilin ilk dörd ayında uçuşların vaxtında həyata keçirilməsi göstəricisi 87% təşkil etmişdir ki, bu da beynəlxalq səviyyədə qəbul olunmuş standartdan 7% yüksəkdir. Bu, şirkətin əməliyyat səmərəliliyinin və müştəri məmnuniyyətinin artmasına səbəb olmuşdur.

Azərbaycanda mülki aviasiya sektoru dinamik inkişaf mərhələsindədir. İnfrastrukturun modernləşdirilməsi, donanmanın yenilənməsi və rəqəmsallaşma sahəsində atılan addımlar sektorun rəqabət qabiliyyətini artırır. Lakin aşağıdakı sahələrdə əlavə tədbirlərin görülməsi tövsiyə olunur:

- low-cost (aşağı büdcəli) aviadaşıyıcıların fəaliyyətinin təşviqi və bazara daxil olmasının asanlaşdırılması;
- regionlara daxili uçuşların sayının artırılması və əlçatanlığın təmin edilməsi;
- aviasiya təhlükəsizliyi standartlarının daha da gücləndirilməsi və beynəlxalq təcrübənin tətbiqi;
- kadr hazırlığı və təlim proqramlarının beynəlxalq standartlara uyğunlaşdırılması.

Bu tədbirlərin həyata keçirilməsi Azərbaycanın mülki aviasiya sektorunun daha da inkişaf etməsinə və beynəlxalq səviyyədə rəqabət qabiliyyətinin artırılmasına xidmət edəcəkdir.

## Nəticə

1. Mülki aviasiyada biznes-sistemlərin inkişafı ölkənin sosial-iqtisadi tərəqqisində mühüm yer tutur. Bu sahədə səmərəli idarəetmə, innovativ yanaşmalar və sosial yönümlü qərarlar yalnız iqtisadi artıma deyil, həm də sosial inklüzivlik və regional bərabərliyin təmin olunmasına xidmət edir. Azərbaycanın mülki aviasiya sahəsində əldə etdiyi irəliləyişlər müsbət qiymətləndirilsə də, qarşıda duran problemlərin həlli üçün sistemli islahatlara və beynəlxalq təcrübənin tətbiqinə ehtiyac vardır.

2. Cəmiyyətdə istehlak dəyərinin yaradılması və realizasiyasına yönəldilən insanın məqsədyönlü fəaliyyət üsulu kimi biznes təşkilatın daxili münasibətlər sistemindən, onun xarici mühitindən, sahədən və bazardan bilavasitə asılıdır. Belə münasibətlər sistemini xarakterizə etmək üçün biznes-sistem anlayışından istifadə olunur. Biznes-sistem mahiyyətcə kommersiya təşkilatıdır, fəaliyyətinin əsas məqsədi mənfəət almaqdır.

3. Biznes-sistemin imici təkcə mənfəət almaq deyil, həm də əhalinin həyat səviyyəsini yüksəltmək və sağlamlığını yaxşılaşdırmaq, ətraf mühiti qoruyub saxlamaq, bir sözlə, sosial məqsədlərə nail olmaqdır. Mülki aviasiyada effektiv biznes-sistemin təşkili üçün kommersiya əlaqələrini formalaşdırmağa, hava nəqliyyatının inkişafının planlaşdırılmasını təkmilləşdirməyə imkan verən bazarın inkişaf etmiş (təkmil) infrastrukturunun olması vacibdir.

4. Bütün sosial-iqtisadi münasibətlər sisteminin transformasiyası şəraitində biznes-sistemin inkişaf strategiyasının formalaşmasının mürəkkəbliyi mülki aviasiyanın inkişaf strategiyasının reallaşdırılması probleminin xarakterini müəyyənləşdirir. Hər bir biznes-sistemdə strateji fəaliyyət sferasının dəqiq müəyyənləşdirilməsi zəruridir, hansı ki inkişafını başqa bazarlardan və infrastrukturlardan asılı olmadan planlaşdırmaq və idarəetmək olar.

## Ədəbiyyat

1. Azoev, G.L., Chelenkov, A. P. (2000). *Konkurentnye preiushchestva firmy*.
2. Alimagamedova, K.I. (2009). *Strategiya razvitiya biznes – sistem v sfere servisa.*
3. Ansoff, I. (1999). *Novaya korporativnaya strategiya.*
4. Button, K. ( 2017). *Air Transport Networks: Theory and Policy Implications.*
5. Druker, P. (1974). *Tasks, Responsibilities, and prastises.*
6. Efremov, V.S. (2001). *Strategicheskoe planirovanie v Biznes-sistemakh.*
7. Forsyth, P., Gillen, D. (n.d.). *Airport Competition: The European Experience*.
8. Ilenkova, N. D. (1997). *Spros: analiz i upravlenie.*
9. Knysh, M.I. (2000). *Konkuretnye strategiya*.
10. Kruglov, M.I. (1998). *Strategicheskoe upravlenie kompaniei*.
11. Milner, B.Z. (1999). *Teoriya organizatsii.*
12. *World Bank Group*. (2021).

Daxil oldu: 07.02.2025
Qəbul edildi: 10.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/36-41

**Arif Ağalarov**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0005-3361-2497
arifagalarov@ndu.edu.az

# Molla Pənah Vaqif və anadilli poeziyamız

## Xülasə

Molla Pənah Vaqif Azərbaycan ədəbiyyatı tarixində özünəməxsus mövqeyi olan qüdrətli ədəbi simalardandır. Ədəbiyyat tariximizdə Nizami və Füzulidən sonra ədəbi məktəb yaradan üçüncü sənətkardır. Onun yaradıcılığı ədəbiyyatımızın yüksəliş tarixində yeni bir mərhələnin başlanğıcıdır. Molla Pənah Vaqifin dövrü Azərbaycan poeziyasının milli dirçəliş dövrü kimi qiymətləndirilir. Bu dövrün əsas cəhətləri arasında optimizm, açıqfikirli yanaşma, realist baxışlar yer alır və geniş dünyagörüşü önə çıxır. Bu xüsusiyyətlər hər biri Vaqifin şəxsi həyatında və yaradıcılığında özünü göstərmiş, onun ictimai-siyasi şəxsiyyət kimi tanınmasında xüsusi əhəmiyyət daşımışdır. Qeyd etdiyimiz bütün bu cəhətlərin hər biri Vaqifin şəxsi həyatı və yaradıcılığında özünü göstərmiş, eyni zamanda onun ictimai-siyasi fəaliyyətinin vacib bir hissəsi olmuşdur.

Azərbaycan ədəbi dilinin inkişafında Vaqifin rolunu dəyərləndirərkən, dilimizin xüsusi inkişaf mərhələlərini nəzərdən keçirmək, qiymətləndirmək vacibdir. Vaqif özündən əvvəlki ədiblərin ədəbi irsini özünəməxsus şəkildə, özünəməxsus tərzdə davam etdirərək, yeni bir yol açıb. M.P.Vaqif Azərbaycan ədəbiyyatının XIX əsr inkişafının əsasını qoyaraq, bu dövrün formalaşmasına əhəmiyyətli töhfə verib. Demək olar ki, o özündən əvvəlki ədiblərin, sənətkarların irsini milli zəmində yekunlaşdırıb, sonrakı ədiblərin, xüsusən, XIX əsrdə yaşamış ədiblərin ədəbi fəaliyyətlərinə istiqamət vermişdir.

Məqalədə M.P.Vaqif şeirlərinin dilinin saflığı müqayisə baxımından təmizliyi, anlaşıqlığı önə çəkilir. XVIII əsr anadilli poeziyamızın zirvəsində dayandığı, özündən sonra ədəbi məktəb yaratdığı diqqətə çatdırılır. Vaqif yaradıcılığı, ənənəsi ondan sonra yaranan şifahi şeirlərinə, onlarca şairin yaradıcılığına güclü təsir etməsi məsələləri şərh edilmişdir.

***Açar sözlər:*** *M.P.Vaqif, Azərbaycan dili, Azərbaycan poeziyası, şeir, alınma sözlər*

**Arif Aghalarov**
Nakhchivan State University
PhD in Philology
https://orcid.org/0009-0005-3361-2497
arifagalarov@ndu.edu.az

# Molla Panah Vagif and Our Native Poetry

## Abstract

Molla Panah Vagif is one of the powerful literary figures with a special position in the history of Azerbaijani literature. He is the third artist in our literary history to create a literary school after Nizami and Fuzuli. His creativity is the beginning of a new stage in the history of the rise of our literature. The period of Molla Panah Vagif is considered the period of national revival of Azerbaijani poetry. Among the main features of this period are optimism, open-minded approach and realistic perspectives, a realistic approach and a broad worldview stand out. Each of these features manifested itself in Vagif's personal life and creativity, and was of particular importance in his recognition as a socio-political figure. Each of these features we have mentioned manifested

 

itself in Vagif's personal life and creativity, and at the same time was an important part of his socio-political activity.

When evaluating the role of Vagif in the development of the Azerbaijani literary language, it is important to consider and evaluate the specific stages of development of our language. Vagif, continuing the literary heritage of his predecessors in his own unique way, in his own unique style, opened a new path. M.P. Vagif laid the foundation for the development of Azerbaijani literature in the 19th century, making a significant and important contribution to the formation of this period. It can be said that he summed up the heritage of his predecessors and artists on a national basis and gave direction to the literary activities of subsequent writers, especially those who lived in the 19th century.

The article emphasizes the purity of the language of M.P. Vagif's poems in terms of comparison, their clarity and comprehensibility. It is brought to the attention that he stood at the peak of our 18th century native language poetry and created a literary school after him. The issues of Vagif's creativity and tradition on the oral poems that emerged after him, and the strong influence of them on the poet's creativity are commented on.

***Keywords:*** *M.P.Vagif, Azerbaijani language, Azerbaijani poetry, poetry, borrowed words*

## Giriş

Azərbaycan ədəbiyyatı tarixində xüsusi mövqeyə malik olan şairlərdən biri də M.P.Vaqifdir. O, XVIII əsr Azərbaycan ədəbiyyatında, daha doğrusu, anadilli şeirimizin pik nöqtəsində dayanan sənətkardır. Belə ki, Şah İsmayıl XVI əsrin əvvəllərində Azərbaycan dilini fars dili ilə yanaşı dövlət dili elan etdikdən sonra, həm özü ana dilində şeirlər yazdı, həm də bu fürsətdən istifadə edən Həqiqi Təbrizi, Məhəmməd Füzuli, sonralar Həbibi, Kişvəri və digərləri doğma dildə yazmağa cürət etdilər. Doğrudur, hələ bir əsr ondan əvvəl yaşayıb-yaratmış İ.Nəsimi ana dilində çox gözəl şeir nümunələri yaratmışdır:

Yanaram eşqindən, gözlərimdən axar yaşlar,
Həsrətin dərdi çıxarıbdır yürəyimdən başlar.

yaxud,

Düşdü yenə dəli könlüm gözlərinin xəyalinə
Kim nə bilir bukönlümün fikri nədir, xəyali nə?

yaxud,

Üzünü məndən nihan etmək dilərsən, etməgil,
Gözlərin yaşın rəvan etmək dilərsən, etməgil.

Bərqi nəsrin üzrə mişkin xəta sən tağıdub
Aşiqi bixaniman etmək dilərsən, etməgil (Nəsimi, 2004).

### Tədqiqat

Nəsimini digərlərindən fərqləndirən odur ki, o, Ş.İ.Xətaidən də əvvəl ana dilində şeirlər yazıb. Doğrudur, bu şeirlərin dilində də fars-ərəb tərkibli söz və ifadələr işlənib. Bu da o dövrü üçün xarakterik hal idi. Ondan sonra Azərbaycan dilində şeirlər, qəzəllər yazan sənətkarların dilində də fars-ərəb sözləri işlənib və işlənməliydi də çünki Azərbaycan ədəbi dili birdən-birə bugünkü səviyyəyə düşməyib. XIV-XV əsrlərdə tədricən saflaşıb, XVI əsrdə H.Təbrizi, M.Füzuli, Ş.İ.Xətai və digər sənətkarlar tərəfindən ədəbi dilimiz bir az da saflaşıb, türkmənşəli və əsl Azərbaycan sözləri ilə zənginləşib. Lakin yenə də fars-ərəb tərkibli sözlərdən yaxa qurtara bilməyib. M.Füzulidən bir neçə bəndə nəzər salaq:

Qəzəldir səfərbəxşi-əhli nəzər,
Qəzəldir guli-bustani hünər.
Qəzali-qəzəl şeydi asan deyil
Qəzəl münkiri əhli-ürfan deyil.

yaxud,

Ol ki, hər saət gülərdi çeşmi-giryanım görüb,
Ağlar oldu halima birəhm cananım görüb.
Eyləyin təyini-əczayi-müdəvva dərdimə,
Tərk edib cəm etmədi hali-pərişanım görüb (Füzuli, 2005).

Göründüyü kimi, səkkiz misrada on kəlmədən artıq fars-ərəb tərkibli söz və söz birləşməsi işlənib. Bu təbii hal idi, başqa sözlə desək, təxminən qırx sözdən onu alınmadır ki, bu da iyirmi beş faizdir və o dövr üçün təqdirəlayiq hadisə idi.

Bir əsr ondan sonra Aşıq Abbas Tufarqanlı dediyi, sonralar qələm alınmış bir neçə bənd şeirə nəzər salaq:

Abbas ağlar zarı-zarı,
Getməz könlümün qubarı,
İlqarından dönən yarı,
Tanrı tez məzar eyləsin.

Başına döndüyüm, Ay Gülgəz Pəri,
Çəkərəm hicranı dərd ayağından.
Elin töhmətindən, fələk cəbrindən,
Düşmüşəm çöllərə dərd ayağından

Fakt göz qabağındadır, otuz iki sözün dördü alınma sözdür. Təxminən, 10-12 faiz (Quliyeva, Əhmədova, 2017).

Məqsədimiz XVIII əsrdə yaşayıb-yaratmış M.P.Vaqifin yazdığı ana dilli şeirimizdə ədəbi dilimizin inkişaf səviyyəsini, saflığını, alınma sözlərdən necə təmizləndiyini diqqətə çatdırmaqdır. Bunun üçün M.P.Vaqif yaradıcılığından bir-iki bənd şeirə diqqət yetirməyi vacib saydıq:

Bayram oldu, heç bilmirəm neyləyim?
Bizim evdə dolu çuval da yoxdu.
Düyü ilə hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdu.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm, dəxi qoymazlar kəndə.
Xalq batıbdı noğula, şəkərə, qəndə,
Bizim evdə axta-zoğal da yoxdu (Vaqif, 2004).

İnkaredilməz faktdır ki, birinci bənddə 23 sözün hamısı əsl Azərbaycan sözüdür. İkinci bənddə 21 sözdən cəmi üç söz:- Allah, naşükür, şəkər sözləri alınmadır. Cəmi 44 sözdən 3 söz alınmadır.

Bu rəqəmi XX əsr və XXI əsrin birinci rübündə yazıb-yaratmış şairlərin şeirlərində işlənmiş alınma sözlərin sayı ilə müqayisə edək:

S.Vurğun şeirlərindən iki bənd:

Başımdan getmişdi sevdanın dəmi,
Xəyalım gəzirdi bütün aləmi.

Bu düşkün könlümü deyin yenəmi
Çəkdiniz sorğuya, suala, gözlər? (Vurğun, 2004, s. 44).

Burada "sevdanın dəmi" ifadəsi ilə duyğuların güclü, ehtiraslı mərhələsi nəzərdə tutulur. Artıq bu mərhələ ötüb, indi isə yalnız xəyallar, xatirələr qalıb. "Düşkün könlün" isə yenidən sınağa çəkilməsi, sual altına alınması insanın daxili qırılmalarını, təkrar emosional sarsıntı yaşamasını simvolizə edir.

Əzəldən belədir çünki kainat
Cahan daimidir ömür əmanət,
Əldən ələ gəzir vəfasız həyat
Biz gəldi gedərik sən yaşa, dünya (Vurğun, 2004 s. 44).

Bu hissədə isə mövzu daha fəlsəfi məcraya keçir. Şair həyatın keçiciliyini, dünyanın isə qalıcı olduğunu bildirir. "Ömür əmanətdir" ifadəsi insanın bu dünyadakı varlığının müvəqqəti olduğunu vurğulayır. "Biz gəldi-gedərik, sən yaşa, dünya" misrası ilə həyatın axıcı, insanın isə faniliyi təsirli şəkildə ifadə olunur. Diqqət yetirsək, iki bənddə 36 öz var, onların 9-u alınma sözdür. Təxminən, 25 faiz.

Süleyman Rüstəm yaradıcılığından iki bənd şeir:

Oxuyun, bir qızıl kitabam mən,
İnqilab oğlu, inqilabam mən,
Ruhu yüksək adamların biriyəm,
Sinfimin top-tüfəngli şairiyəm mən.

Nədir o mənalı dərin baxışlar?
Nədir gözlərindən yağan yağışlar?
Nədir qəlbindəki payızlar, qışlar?
Yetimtək boynunu burma, Təbrizim!
Məlul, məlul baxıb durma, Təbrizim! (Rüstəm, 2005).

İki bənddə 6 söz alınmadır. Bu da gözəldir, ancaq XVIII əsrdə Vaqifdən nümunə gətirdiyimiz yuxarıdakı iki bənd şeirdə cəmi 3 söz alınmadır. Dəyərli oxucularımız heç də hesab etməsin ki, biz şairləri yaxşı, yaxud "pis" adı altında müqayisə edirik. Qəti olaraq yox! Mən də bir dilsevər ziyalı kimi ancaq müqayisə etdiyimiz şairlərin alınma sözlərdən necə istifadə etdiklərini önə çəkmək istədim və qabartdım ki, XVIII əsrdə Vaqif adlı azərbaycanlı bir sənətkar Azərbaycan ədəbi dilinin zənginləşməsində, saflaşmasında hansı mövqedə durub, bu mənada özündən əvvəlki şairləri ötüb, sonra gələn şairlər üçün örnək olub, ədəbi dil məktəbi yaradıb.

Bilirəm ki, Vaqifdən nümunə gətirilmiş iki bənd şeir qaneedici deyil, yəni ola bilər ki, həminki iki bənddə 2-3 söz alınma olsun. Elə şeirləri də var ki, orada alınma sözlərin miqdarı daha çox olsun. Fikrimizi dəqiqləşdirmək üçün digər nümunələrə nəzər yetirək:

Əgər yarsan, gəl sarmaşaq qol-boyun,
Durub daldalardan baxmağın nədi?
Yar deyilsən çək ayağın geri dur,
Canımı odlara yaxmağın nədi?

Eşqin sevdasına heç kəs pis deməz,
Məhəbbət yolundan ayaq kəs deməz,
Göz görməsə dəli könül istəməz,
Bəzənib qarşıma çıxmağın nədi? (Vaqif, 2004).

Hər şey göz önündədir. İki bənd şeirdə 40 sözün yalnız ikisi alınmadır, yəni eşq və məhəbbət sözləri. Bu sözlərin hər ikisi bu gün də hər birimizin gündəlik lüğətimizdə işlənən sözlərdir. Bax

budur M.P.Vaqifin poeziyada dil ucalığı, ədəbi dil mövqeyi, dilimizin saflaşması, yad sözlərdən təmizlənməsi yolunda gördüyü işlər.

Fikrimizi bir daha təsdiq etmək üçün ölməz sənətkarın bir neçə bənd şeirinə də nəzər salaq:

Səhər dura sürmə çəkə gözünə,
Birçəklərin həlqə qoya üzünə,
Cilvələnə, sığal çəkə özünə,
İşi, gücü gülüb oynamaq ola.

yaxud,

Xeyli vaxtdır ayrılmışıq yar ilən,
Gördük, amma danışmadıq ayrıldıq.
Qaldı canda gizli-gizli dərdimiz,
Bircə kəlmə danışmadıq ayrıldıq

və yaxud,

Qış günü qışlağın Qıraqbasanın,
Gözüdür Aranıln, cümlə cahanın
Belə gözəl yerin, belə məkanın
Bir gözəl obası hayıf ki, yoxdur (Cəfərov, 2017).

Təəccüblü gəlsə də, realdır ki, üç bənd şeirdə, daha doğrusu, 55 sözün təkcə bir kəlməsi alınmadır. O da məkan sözüdür ki, bu gün də hər birimiz o sözü işlədirik.

## Nəticə

M.P.Vaqifin yaradıcılığından seçdiyimiz yuxarıdakı nümunələrin sayını artırmaq çətin deyil, lakin şairin bütün şeirləri bu tip deyil, yəni onun digər şeirlərində fars-ərəb tərkibli sözlər çox deyil. Məsələn:

Mən cahan mülkündə mütləq doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim.

yaxud,

Sən ha bir sonasan cüda düşübsən
Bir bölük yaşılbaş sonadan, Pəri
(Molla Pənah Vaqif əsərləri, 2004. s. 41).

İnkar etmək olmaz ki, müqayisə olunduqda hər nə varsa göz önündədir. Yəni özündən əvvəlki şairlərin dili Vaqifin şeir dilindən gəlirdi, özündən sonrakı şairlərin əksəriyyətinin dilindən safdır, gözəldir. Bu qısa yazıdan belə bir nəticə hasil olur.

Beləliklə, anadilli poeziyamızın XVIII əsrdə zirvəsində dayanan M.P.Vaqif ədəbi dilimizin inkişafında, saflaşmasında əcnəbi söz və söz birləşməsindən təmizlənməsində xüsusi mövqeyə malik olan şairdir. Onun yaradıcılığı öz novatorluğu, yəni yenilikçiliyi ilə fərqlənir. M.P.Vaqif yaradıcılığı özündən sonra yaranan şifahi xalq ədəbiyyatımız güclü təsir etmiş, yazılı ədəbiyyatımızın, daha doğrusu, şairlərimizin yaradıcılığına da əvvəzsiz bəhrə vermişdir.

## Ədəbiyyat

1. Araslı, H. (1968). *Molla Pənah Vaqif əsərləri.*
2. Cəfərov, N. (2017). *Molla Pənah Vaqif.*
3. Dadaşzadə, A. (1966). *Molla Pənah Vaqif: Həyat və yaradıcılığı.*
4. Füzuli, M. (2005). *Seçilmiş əsərləri (Altı cilddə, I cild).*
5. İsmayılov, H. (2005). *Molla Pənah Vaqif və Azərbaycan poeziyası.*
6. Quliyeva, S., Əhmədova, L. (2017). *Molla Pənah Vaqif* .
7. Məmmədli, F. (2010). *Vaqifin əsərlərində sosial-realizm.*
8. *Molla Pənah Vaqif əsərləri*. (2004).Şərq-Qərb.
9. Nəsimi, İ. (2004). *Seçilmiş əsərləri (İki cilddə, I cild).*
10. Rüstəm, S. (2005). *Seçilmiş əsərləri (Üç cilddə, I cild)*.
10. Vurğun, S. (2004). *Seçilmiş əsərləri (Beş cilddə, II cild).*
11. Vaqif, M.P. (2004). *Seçilmiş əsərləri.*

Daxil oldu: 14.02.2025
Qəbul edildi: 20.05.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 5 / 42-46
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 5 / 42-46 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/45/42-46

**Xankişi Məmmədov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
texnika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru

# Mahirə Nağıqızı fenomeni və onun dünyasının fəlsəfəsi

**Xülasə**

Bu araşdırmada XXI əsr milli ədəbi-bədii fikir tarixinin görkəmli nümayəndəsi, elmimizin, ədəbiyyatımızın həm inkişafında, həm də zənginləşməsində xüsusi xidmətləri olan istedadlı şair, fədakar maarif xadimi, Mahirə Nağıqızı fenomenindən və onun dünyasının fəlsəfəsindən söhbət açılır. Qeyd edilir ki, parlayan ulduza bənzəyən, milli varlığımızı, mənliyimizi, kimliyimizi hər əsərində əks etdirən, oxucuya qürurverici və iftixaredici duyğular yaşadan Mahirə Nağıqızı fenomeni Azərbaycanın bəxtinə düşən qeyri-adi şəxsiyyət, əvəzolunmaz alim, şair, pedaqoq, müəllimlər müəllimi olaraq gənc nəslin milli-mənəvi ruhda tərbiyəsində və ümumən, milli düşüncə tariximizdə əvəzsiz rolu olan əbədiyaşar şəxsiyyətlərdən biridir. Riyazi dildə desək, Mahirə Nağıqızı dünyası fəlsəfənin alt çoxluğuna daxil olan bütün sahələri əhatə edir. Onun qələmə aldığı "Missiya", "Ulu öndərimizin natiqlik məharəti", "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf strategiyası", "Dərdi dərin Həsən Mirzə", "Alim təfəkkürünün itiliyi", "Üslubi morfologiya", "Aşıq və el şairlərinin üslubi sintaksisi", "Aşıq və el şairlərinin poetikası", "Aşıq və el şairlərinin leksikası" və digər elmi, eləcə də "Mənim anam", "Su at dalımca, ana", "Yaşadacaq anam məni", "Analı dünyam", "Bayatılar və üç şeir", "Onun daş nağılı", "Ruhuna beşiksə, tanı, Vətəndir", "Dilimiz – varlığımızdır", "Salam olsun" adlı bədii kitabları və orijinal bayatıları ayrı-ayrılıqda bir həyat məktəbi, insanlıq dərsidir. "Ana dilim" şeiri isə xalqımızın zəngin mədəniyyətini, kökünü, soyunu, mənəvi dünyasını, bir sözlə xalqın mənliyini, kimliyini varlığını əks etdirən qan yaddaşıdır. Başdan-başa vətənpərvərlik, milli-mənəvi dəyərlər üzərində köklənmiş bu dərslərin fəlsəfəsi çox dərindir.

***Açar sözlər:*** *Mahirə Nağıqızı, şair, alim, missiya, ana dilim, fəlsəfə*

**Khankishi Mammadov**
Azerbaijan State Pedagogical University
PhD in Engineering
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru

# Mahira Naghigizi Phenomenon and Her World's Philosophy

**Abstract**

This study discusses the Mahira Naghigizi phenomenon – a prominent representative of 21st-century national literary and artistic thought, a talented poet, and a devoted educator whose contributions have been significant in developing and enriching our science and literature. It is emphasized that Mahira Naghigizi's world, which resembles a shining star and perhaps reflects our national identity, essence, and selfhood in every one of her works, inspires readers with pride and honor. She is regarded as an extraordinary figure gifted to Azerbaijan – an irreplaceable scholar, poet, educator, and a teacher of teachers – who plays an invaluable role in instilling national and spiritual values in the younger generation and in shaping the overall history of national thought. In mathematical terms, the "Mahira Naghigizi's world" encompasses all the domains that fall within the subset of philosophy. Her written works such as "Missiya" (Mission), "Ulu öndərimizin natiqlik

 

məharəti" (Our National Leader's Oratory Skills), "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf strategiyası" (Heydar Aliyev and the Strategy for the Development of the Azerbaijani Language), "Dərdi dərin Həsən Mirzə" (Hasan Mirza's Deep Sorrow), "Alim təfəkkürünün itiliyi" (The Sharpness of a Scholar's Mind), "Üslubi morfologiya" "Stylistic Morphology", "Stylistic Syntax of Ashug and Folk Poets", "Poetics of Ashug and Folk Poets", "Lexicon of Ashug and Folk Poets", and other academic writings—as well as her literary works like "My Mother", "Mother, Pour Water After Me", "My Mother Will Keep Me Alive", "My World with Mother", "Bayatis and Three Poems", "Her Stone Tale", "If the Cradle Is for Your Soul, Know That It's the Homeland", "Our Language Is Our Identity", "Greetings", and – along with her original bayatis (a form of Azerbaijani folk poetry), each stand as a school of life and a lesson in humanity in their own right. Her poem "My Mother Tongue" is considered the blood memory that reflects our nation's rich culture, roots, ancestry, spiritual world – in short, the very essence and identity of the people. Rooted deeply in patriotism and national-spiritual values, the philosophy behind these lessons is profound.

***Keywords:*** *Mahira Naghigizi, poet, scholar, mission, my mother tongue, philosophy*

## Giriş

Sözübütöv, sözünü dəyişməyən, sözünü danmayan, söz verib ona əməl edən, xeyirxahlıq üçün canından keçən, bar gətirdikcə başını və baxışlarını aşağı dikən, yaxşılıq etməkdən ləzzət alan, ömrünü xalqına, millətinə, dövlətinə həsr edən insanlara nadir, qeyri-adi, əvəzolunmayan, qənimət və ya fenomen insanlar deyilir. Müasir izahlı lüğətlərdə "fenomen" izah edilə bilinməyən nadir hadisə, qeyri-adi insan, əvəzolunmaz şəxsiyyət kimi qeyd olunur. Hər sahədə olduğu kimi ədəbi aləmdə də belə şəxsiyyətlər var. Mir Cəlal Paşayev, Həsən Mirzə, Mahirə Nağıqızı belə fenomenlərdəndir. Bu araşdırmada Mahirə Nağıqızı fenomenindən və onun dünyasının fəlsəfəsindən söhbət açılır. Parlayan ulduza bənzəyən, milli varlığımızı, mənliyimizi, kimliyimizi bəlkə də, hər əsərində əks etdirən, oxucuya qürurverici və iftixaredici duyğular yaşadan Mahirə Nağıqızı fenomeni də Azərbaycanın bəxtinə düşən qeyri-adi şəxsiyyət, əvəzolunmaz alim, şair, pedaqoq, müəllimlər müəllimi olaraq gənc nəslin milli-mənəvi ruhda tərbiyəsində və ümumən, milli düşüncə tariximizdə əvəzsiz rolu olan əbədiyaşar şəxsiyyətlərdən biridir. Riyazi dildə desək, Mahirə Nağıqızı dünyası fəlsəfənin alt çoxluğuna daxil olan bütün sahələri əhatə edir.

**Tədqiqat**

Bənzərsiz və geniş yaradıcılıq diapazonuna malik olan Mahirə Nağıqızının qələmə aldığı bir-birindən maraqlı – "Missiya" (Hüseynova, 2019), "Ulu öndərimizin natiqlik məharəti" (Hüseynova, 2009), "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf strategiyası" (Hüseynova, 2023), "Dərdi dərin Həsən Mirzə" (Hüseynova, 2013), "Alim təfəkkürünün itiliyi", "Üslubi morfologiya", "Aşıq və el şairlərinin üslubi sintaksisi", "Aşıq və el şairlərinin poetikası", "Aşıq və el şairlərinin leksikası" və digər elmi, eləcə də "Mənim anam", "Su at dalımca, ana", "Yaşadacaq anam məni", "Analı dünyam" (Hüseynova, 2015), "Bayatılar və üç şeir" (Hüseynova, 2015), "Onun daş nağılı" (Hüseynova, 2020), "Ruhuna beşiksə, tanı, Vətəndir", "Dilimiz – varlığımızdır", "Salam olsun" (Hüseynova, 2020) adlı bədii kitabları və orijinal bayatıları ayrı-ayrılıqda bir həyat məktəbi, insanlıq dərsidir. "Ana dilim" şeiri isə xalqımızın zəngin mədəniyyətini, kökünü, soyunu, mənəvi dünyasını, bir sözlə, xalqın mənliyini, kimliyini varlığını əks etdirən qan yaddaşıdır. Başdan-başa vətənpərvərlik, milli-mənəvi dəyərlər üzərində köklənmiş bu dərslərin fəlsəfəsi çox dərin olub, qəvvas axtarır ki, bir-bir onları incəlyib üzə çıxartsın.

Poeziya bulağının gözündən su içən Mahirə Nağıqızı fəlsəfəsinin kökü birmənalı olaraq Allaha, vətənə, anaya, ataya, xalqına, millətinə, övladlarına, nəvələrinə, şəhidlərimizə və zəfərimizə olan sonsuz sevgiyə bağlıdır. Bu da bilavasitə qəlb zənginliyi ilə, ruh zənginliyi ilə bağlıdır. Sanki bu əsərlərin hamısının xəmiri təbiətlə, folklorla yoğrulub, mayası isə kökdən, süddən, sudan irəli gəlir. Elə bir əsəri, yazısı yoxdur ki, o əsərdən, o yazıdan həyat qoxusu, insanlıq ətri, humanizm təravəti hiss olunmasın. Onun əsərlərində, dolğun təsvirləri, canlı lövhələri xatırladan təbiət cizgiləri o qədər ustalıqla, zövqlə, incəliklə, olduğu kimi təbii yazılıb ki, oxucu özünü sanki həmin mühitdə hiss edir. Bu təsvirlərdən birinə diqqət edək: "1971-ci il idi. Yenə sazaqlı payız qapını kəsdirmişdi. Payız da

tələsirdi, anam da. Payızın sərt sazaqları artdıqca qışa bir addım da yaxınlaşır, ağacların sonuncu yarpaqlar da məğlubedilmişlər kimi bir-bir yerə düşür, irigövdəli, qollu-budaqlı ağaclar da sanki soyuqda üşüyür, gözümün qarşısında kiçilir, yığılırdı. Bunları mən, anamın dili ilə desək, "bikar adamlar" müşahidə edirdi. Anam isə bu vaxtlarda gördüyümüz kimi, yenə öz hazırlığında-qış hazırlığında idi. İpə sərilmiş əriştəni ağappaq süfrənin üstünə irisini ayrı, bir az xırdalanmışları da bir ayrı yığırdı. Təndirin üstündəki sac qıpqırmızı idi. Yaş dəsmalla sacın alouşunu alan anam əriştədən aşsüzənlərə doldurur və sacın içinə tökürdü. Yanındakı ərsini yerə qoymur, əriştəni sacda qovururdu. Onun zərif, ağ bənizi pörtüb qıpqırmızı olmuş, gözləri yaşarmışdı. Bu mərasim günortadan bir az ötmüş bitdi. İndi anam bağçada sərdiyi süfrələrdə əriştənin soyumasını gözləyirdi". Zənnimcə, əlavə şərhə ehtiyac yoxdur. Bircə onu əlavə edim ki, Mahirə xanım nə yaxşı nəsrə gəlməyib, bu mənada yazıçıların əməlli-başlı bəxti gətirib.

Mahirə Nağıqızı dünyasının fəlsəfəsindən söhbət açarkən dünyanı heyrətləndirən siyasət korifey ulu öndərimiz Heydər Əliyev haqqında qələmə aldığı "Missiya" kitabına və bu kitabda təqdim edilən faktların təhlil maneralarına, elmi və publisistik üslubların maraqlı sintezinə və bu sintezin fəlsəfəsinə nəzər salmaq kifayətdir. Əslində, vətənimizin böyük qızı, şərəfli və nəhəng bir nəslin daşıyıcısı olan Mahirə xanım ədəbiyyatımızda yeni mərhələdir, onun yaradıcılığının tədqiqi isə böyük əhəmiyyət daşıyır. Doğrudan da, ədəbiyyatda yeni iz açmaq, bu qədər cəlbedici olmaq, cəmiyyətdə bu cür nüfuz qazanmaq, bu qədər tədqiq olunmaq, lirizmi, musiqililiyi ilə bu qədər seçilmək, iki yüzə yaxın şeirinə mahnı bəstələnmək Mahirə xanıma qismət olan kimi hər şairə qismət olmur. Sözsüz ki, bütün bu uğurlar şairin elmli, bilikli, məharətli, bacarıqlı, bir sözlə, bişkin olmağından irəli gəlir.

Mahirə xanımın yaradıcılığında Qərbi Azərbaycan mövzusunun xüsusi yeri var və biz bunu təbii qəbul edirik. Sözsüz ki, bu da böyük insanın öz soy-kökünə, dədə-baba yurduna və elinə-obasına bağlılığından və sədaqətindən irəli gəlir. Həsən Mirzə kimi böyük el və elm adamının davamçısı necə olmalıdır ki? Onun "XIX-XX əsrlər Azərbaycan aşıq və el şairlərinin yaradıcılığında onomastik vahidlərin linqvopoetikası" (Hüseynova, 2015), "Müasir Azərbaycan dili: Aşıq və el şairlərinin yaradıcılığında dialektizmlərin öyrədilməsinə dair" (Hüseynova, 2015), "Müasir Azərbaycan dili: Aşıq və el şairlərinin yaradıcılığının dil, üslub xüsusiyyətləri" (Hüseynova, 2018), "Qərbi Azərbaycan paleotoponimlərinin linqvistik etimoloji təhlili" (Hüseynova, 2023) və yüzlərlə məqalələri fikrimizcə çox şeydən xəbər verir. "Ana dilim" şeiri isə ən gözəl şeirlərdən biridir:

Yurd yaratdın, xalqıma ev- eşik oldun,
Laylalarla ruhumuza beşik oldun,
Dünyamızın sərhədinə keşik oldun,
Millət etdin el-elatı, ana dilim,
Dədəm-babam amanatı, ana dilim (Hüseynova, 2020, s.20).

Mahirə Nağıqızının bütün əsərləri tərbiyəvi xarakterə malikdir. Anasına olan sevgini xatırlamaq üçün "Saz havası" məqaləsinə diqqət etmək kifayətdir: Aşıq "İrəvan çuxuru" oxuyurdu, mənimsə gözlərim anamı axtarırdı və tapdı. O, qapının ağzında oturmuş, gözlərini uzaq, çox uzaq qeyri-müəyyən bir nöqtəyə dikmişdi. Nə düşünürdü, görəsən?! Anası Nahidə (Nahad nənə) saçlarınımı darayırdı, yoxsa atası Mirzəlioğlu İbrahim nəsihət verirdi, bəlkə də, Dərələyəzdə çiçəklərin arasında gəzirdi. Mənə elə gəldi ki, o həmin məqamlarda atalı-analı günlərini yaşayırdı... "Orta Sarıtel" başlayandan sona qədər anam gizli-gizli ağladı. Yanına gəldim: Ay ana, niyə ağlayırsan? Gör, Nəsib dayı nə gözəl oxuyur…! "Bəs sən niyə ağlayırsan?"- deyəndə anam dilləndi və astaca əlavə etdi: Sən qulaq as. Anamla keçirdiyimiz o pərəsəng günləri xatırladım". Kömür sobasının istisi adamlara elə xoş idi ki, sanki bayırda lopa-lopa yağan qarı belə düşünmürdülər, hamı sazın sehrində idi. Anamın gözlərindən narın-narın yaş ələnirdi. Mənsə yenə anamın dizinin dibini kəsdirdim: "Ay ana, nə oldu, niyə ağlayırsan? Nə yaxşı Nəsib dayı gəldi! Ağlama, nə olar, bəsdir". Belə yerdə kövrəlməyəsən, neyləyəsən?

Mahirə xanımın yaradaıcılığında insan üçün ən mərhəm duyğuların poetik təzahürü olan mənzərələrdən və fəlsəfi düşüncələrdən istifadə arealı çox genişdir. Bu gözəlliyi hiss etməmək,

duymamaq, ləzzət almamaq mümkün deyil. Bu mənada şairin "Onun daş nağılı" kitabına nəzər salmaq kifayət edər.

Qarabağda müharibə gedən zaman Mahirə xanımın hərbi-vətənpərvərlik ruhunda yazdığı şeirləri, o cümlədən "Son döyüşə hazır ol" şeiri igidlərimizə, ərənlərimizə bu şeirdən ilham alıb onları qəhrəmanlıqlar göstərməyə, qələbələr qazanmağa, uğur qazanmağa, zəfər çalmağa, azğın düşmənlərin dərsini verməyə səsləyir:

Azərbaycan əsgəri, yolun Şuşaya gedər,
O yürüşün naminə son döyüşə hazır ol!
İntizarda Laçındı, Zəngilandı, Kəlbəcər,
Pir görüşün naminə, son döyüşə hazır ol! (Hüseynova, 2020, s.39).

Vətənimizin bütövlüyü uğrunda yorulmadan çalışan Mahirə xanımın Qərbi Azərbaycanla bağlı gördüyü işlər də göz qabağındadır. Ümumiyyətlə bu böyük insanın yazdığı, dediyi, nə varsa, hamısı halallığın bəhrəsidir, "Yığıram" şeirində yazdığı kimi:

Ər öyüdünnən topladım,
Qəmi düyünnən topladım.
Ana südünnən topladım,
Nə yığdım halal yığıram (Hüseynova, 2020, s.48).

Mahirə Nağıqızının əsərlərində folklorun istər, arxaik, istərsə də çağdaş janrlarından hamısına, məsələn, dualara, alqışlara bol-bol rast gəlmək olur. Amma şairin bayatıları, haxıştaları, laylaları ələ düşməz. Bu əsərlərin hər biri gözəllik dünyasının sirli-sehirli qapılarını açmağa, "gözəllik" məhfumunun formulunu müəyyən etməyə, dürüstlüyün və gözəlliyin tam tərifini verməyə imkan verir. Bu mənada şairin əsərləri mümkünsüz olanın mümkün olmasını öz oxucusuna anladır və onun əsərlərini oxuyarkən elə mənzərələr, bəzəklər, naxışlar, baxışlar yaranır ki, bu duyğular hətta ağıllı olanın da ağlını alır. Fikir fikri, düşüncə düşüncəni, duyğu duyğunu, söz sözü çəkir. Oğul gərəkdir ki, bu gözəllikdən baş aça, onun dadını, tamını duyub hiss edib ləzzət ala. Mahirə xanımın iç dünyasının fəlsəfəsi bax budur. Fikrimizcə, dahiliyə gedən yol da elə burdan başlayır. Gərək, dediyin sözlə əməlin bir-birini tamamlasın. Yoxsa, hər şey yarımçıq qalar.

İstər-istəməz bir sual hər kəsi düşündürə bilər. Görəsən, Mahirə xanım bu zirvələri necə fəth edib? Bizə el gəlir ki, bu uğurların əsas səbəbi böyük şairimizin sözün və istedadının gücünə güvənməyindən irəli gəlir. Yoxsa, bu qədər uğur qazanmaq mümkün olmazdı. Açığını deyək ki, Mahirə xanım kimi yazmaq çox çətindir. Bəlkə də, heç mümkün olan deyil, çünki bu duyğu, bu hiss yer adamında ola bilməz, amma bunu Mahirə xanım bacarıb. Səbəbi də odur ki, o, yer adamından çox-çox uzaq olan insandır. Elə ona görə ona "Göylər adamı", "Ruh adamı" desək daha doğru və düzgün olar.

## Nəticə

Sonda isə qeyd edək ki, XXI əsr milli ədəbi-bədii fikir tarixinin görkəmli nümayəndəsi, elmimizin, ədəbiyyatımızın həm inkişafında, həm də zənginləşməsində xüsusi xidmətləri olan Allah adamı, imam övladı, parlayan ulduz, işıqlı adam, nur çeşməsi, istedadlı şair, fədakar maarif xadimi, ləyaqətlilik dağının zirvəsində bardaş qurub əbədi əyləşmiş Mahirə xanım xoşbəxt adamdır. Çünki xoşbəxt o kəsdir ki, özündən sonra onun ocağını yandıran, odunu, közünü sönməyə qoymayan, ideyalarını layiqincə davam etdirən, sonrakı ömrünün pöhrələrini yaşadan Könül Həsənova kimi qızı, mələyə bənzəyən nəvələri var. Bütün bu qeyd edilənlərdən belə bir nəticəyə gəlmək olur ki, əsərlərindən hər zaman bəhrələndiyimiz Mahirə Nağıqızı nə yaxşı ki, bizim müasirimizdir. Allah hər kəsin qənşərinə Mahirə Nağıqızı kimi yaxşılarını çıxartsın!

## Ədəbiyyat

1. Hüseynova, M. (2015). *Analı dünyam*. Vətən.
2. Hüseynova, M. ( 2015). *Bayatılar və üç şeir*. Apostroff.
3. Hüseynova, M. ( 2013). *Dərdi dərin Həsən Mirzə. Bakı.* Vətən.
4. Hüseynova, M. (2023). *Heydər Əliyev və Azərbaycan dilinin inkişaf strategiyası.* Elm.
5. Hüseynova, M.( 2015). *XIX-XX əsrlər Azərbaycan aşıq və el şairlərinin yaradıcılığında onomastik vahidlərin linqvopoetikası (Dərələyəz mahalı üzrə).* ADPU.
6. Hüseynova, M. (2023). *Qərbi Azərbaycan paleotoponimlərinin linqvistik etimoloji təhlili.* ADPU.
7. Hüseynova, M. (2019). *Missiya.* ADPU.
8. Hüseynova, M. (2015). *Müasir Azərbaycan dili: Aşıq və el şairlərinin yaradıcılığında dialektizmlərin öyrədilməsinə dair (Dərələyəz mahalı üzrə).*Vətən.
9. Hüseynova, M. (2018). *Müasir Azərbaycan dili: Aşıq və el şairlərinin yaradıcılığının dil, üslub xüsusiyyətləri. (Dərələyəz mahalı üzrə).* Bakı.
10. Hüseynova, M. (2020). *Onun daş nağılı.* ADPU.
11. Hüseynova, M. (2020). *Salam olsun*. Bakı.
12. Hüseynova, M. (2009). *Ulu öndərimizin natiqlik məharəti.* Avropa.

Daxil oldu: 30.01.2025
Qəbul edildi: 12.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/47-50

**Elburus Vəliyev**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0002-1462-305X
elbrusveliyev79@gmail.com

# Bəzi köməkçi nitq hissələrinin leksik anlamı, onların söz yaradıcılığında rolu və sintaktik məqamları

**Xülasə**

Nitq mədəniyyəti mənəvi mədəniyyətin ayrılmaz və vacib tərkib hissəsi hesab olunur. Müstəqillik əldə edildikdən sonra dilimizin və nitq mədəniyyətimizin inkişafı, eyni zamanda bu sahənin gənc nəslin formalaşmasında oynadığı rol əsas prioritetlərdən biri kimi müəyyən edilmişdir. Hazırda Azərbaycan dili respublikanın rəsmi dili olmaqla yanaşı, geniş ünsiyyət vasitəsi kimi də çıxış edir. Düzgün və aydın nitq üçün bu dilin bütün incəliklərini dərindən öyrənmək vacibdir. Azərbaycan dili sabit qrammatik quruluşu, geniş və zəngin lüğət tərkibi, ahəngdar və zərif səslənmə xüsusiyyətləri ilə seçilir. Onun leksik strukturu qrammatik və sintaktik xüsusiyyətlərinə görə müxtəlif nitq hissələrinə – isim, feil və köməkçi nitq vahidlərinə bölünür.

Nitq hissələrinə Azərbaycan dilində isim, sifət, say, əvəzlik, feil, zərf, bağlayıcı, qoşma, ədat, modal sözlər və nida daxildir. Leksik məna daşıyan sözlər eyni zamanda qrammatik funksiya yerinə yetirərək cümlədə müəyyən sintaktik rol oynayır. Hər hansı bir sözün nitq hissəsi kimi qəbul olunması üçün onun yalnız leksik mənası deyil, eyni zamanda qrammatik funksiyası da olmalıdır. Daha əvvəl də vurğulandığı kimi, köməkçi nitq hissələrinə qoşmalar, ədatlar, bağlayıcılar, modal sözlər və nida daxildir. Bu kateqoriyaya aid sözlər əsas nitq hissələrindən fərqli olaraq, leksik məna daşımır, cümlə üzvü kimi çıxış etmir və müstəqil şəkildə suala cavab vermir. Dilin zənginliyi araşdırıldıqda aydın olur ki, bir çox sözlər müxtəlif mənalarda işlədilə bilir. Bu xüsusiyyət təkcə əsas nitq hissələrində deyil, həmçinin, köməkçi nitq hissələrində də müşahidə olunur.

***Açar sözlər**: köməkçi nitq hissələri, leksik anlam, sintaktik məqam, leksik və qrammatik məna*

**Elburus Valiyev**
Nakhchivan State University
PhD in Philology
https://orcid.org/0009-0002-1462-305X
elbrusveliyev79@gmail.com

# Lexical Meaning of Some Auxiliary Parts of Speech, Their Role in Word Formation and Syntactic Aspects

**Abstract**

Speech culture is generally considered one of the main components of spiritual culture. From the time of independence to the present day, the formation of our language, speech culture and the formation of our youth have been put forward as a key issue for comprehensive development. Today, the Azerbaijani language is the official language of our state and a broad means of communication. In order for our speech to be flawlessly fluent, it is important to master all the subtleties of this language. The Azerbaijani language has its own stable grammatical structure, rich vocabulary and expression reserve, harmonious, elegant sounding. The lexical composition of the Azerbaijani language is divided into several groups according to its lexical-grammatical, morphological and syntactic characteristics - parts of speech: nouns, verbs and auxiliary parts of speech. In the Azerbaijani language, parts of speech include nouns, adjectives, numerals, pronouns,

verbs, adverbs, conjunctions, conjunctions, prepositions and modal words. Words expressing lexical meaning have grammatical meaning and carry a syntactic function within a sentence. In order for a word included in our dictionary to be a part of speech, it must have a certain grammatical meaning in addition to its lexical meaning. As we mentioned above, auxiliary parts of speech include conjunctions, adverbs, connecting and modal words and interjections. Unlike the main parts of speech, auxiliary parts of speech cannot have a lexical meaning, cannot be used separately as a sentence member and do not answer an independent question. The study of the richness of the Azerbaijani language shows that in our speech one word is expressed in several meanings. This is manifested in the auxiliary parts of speech as well as in the main parts of speech.

***Keywords:*** *auxiliary parts of speech, lexical meaning, syntactic point, lexical and grammatical meaning*

## Giriş

Dilin lüğət tərkibindəki sözlərin böyük bir qrupu mənalı, yəni leksik və qrammatik mənaya malik olsa da, digər bir qrupu isə yarımmənalı yalnız qrammatik məna kəsb edən sözlərdir.

Tanınmış dilçilərin əksəriyyəti; Baskakov, Vinoqradov, L.Budaqov, A.Qurbanov, M.Şirəliyev, Z.Budaqova, S.Cəfərov, Ə.Fərəcov, Ə.Dəmirçizadə, Ə.Əfəndiyev, Y.Seyidov, Ə.Abdullayev və başqaları sübut və təsdiq etmişlər ki, dildə mənasız söz yoxdur. Yəni duz, gözəl, beş, kimsə, yazmaq, aşağı və s. Leksik və qrammatik, dək, və, bəlkə, məgər, off sözləri təkcə qrammatik mənaya malikdir. Bu da sözlərin nitq hissələrinin iki bəzi mənbələrdə üç qrupa bölünməsinə əsas verir. Məqsədimiz nitq hissələrini şərh etmək deyil, çünki bu sahədə onlarca dərslik, metodik vəsaitlər yazılmış, hətta ayrı-ayrı qrammatik kateqoriyalar haqqında xeyli miqdarda köməkçi vəsaitlər, elmi məqalələr çap olunmuşdur.

**Tədqiqat**

Bütün bunlara baxmayaraq, ali və orta məktəb qrammatikalarında və digər vəsaitlərdə əsas nitq hissələrinin köməkçi nitq hissələrindən yarımmənalı sözlərdən əsas fərqini belə müəyyənləşdirmişlər:

Əsas nitq hissələri leksik və qrammatik mənaya malikdir;

Əsas nitq hissələri morfoloji əlamət, yəni leksik və qrammatik şəkilçilər qəbul edib dəyişə bilər, köməkçi nitq hissələri yox. Dəmir-çi-lər-dən, yaz-ma-mış-am, bir-ləş-miş-di-lər və s, yəni əsas nitq hissələri söz yaradıcılığında fəal iştirak edir. Köməkçi nitq hissələri yox. Əsas nitq hissələri hər hansı bir suala cavab verir, köməkçi nitq hissələrinin sualı yoxdur. (qələm-nə? gedirəm – nə edirəm? Sarı (yarpaq) - nesə (yarpaq?). Beş (kitab) – neçə (kitab). Mən insanam – kim?. Tələbələr aşağıya endilər. Haraya? və s. Əsas nitq hissələri cümlə üzvü vəzifəsində çıxış edir. Köməkçi nitq hissələri cümlə üzvü olmaz. Əsas nitq hissələri morfoloji əlamət – leksik və qrammatik şəkilçi qəbul edib dəyişə bilir, yəni söz yaradıcılığında fəal iştirak edir. Köməkçi nitq hissələrində belə bir xüsusiyyət yoxdur.

Konkret dil faktları sübut edir ki, köməkçi nitq hissələri, daha doğrusu yarımmənalı sözlər də yeri gəldikcə söz yaradıcılığında iştirak edə bilir (Hüseynzadə, 2007).

Bildiyimiz kimi, söz yaradıcılığı iki yolla – morfoloji və sintaktik üsulla yaranır. Lakin lüğət tərkibi dilin daxili imkanları sayəsində təkcə morfoloji və sintaktik yolla deyil, həm də leksik və semantik üsullarla da yaranır. Biz bu yazıda morfoloji və sintaktik yollarla yanaşı, həm də leksik üsulla da köməkçi nitq hissələrinin söz yaradıcılığında iştirakından söz açmağı qarşımıza məqsəd qoymuşuq. Köməkçi nitq hissələrinin bir qismi digər əsas nitq hissələri yerində də çıxış edə bilir. Bu, leksik yolla söz yaradıcılığı deməkdir. Nümunələrə diqqət yetirək:

Azər evə tərəf getdi (qoşma). Tərəflər razılaşdılar (isim). Səndən sonra Adil getməlidi (qoşma). Sən sonra gələrsən (zaman zərfi). Mustafadan qabaq gələn yox idi (qoşma). Arif qabaq partada əyləşmişdi (sifət). Bizdən əvvəl siz gəlmişdiniz (qoşma). Əvvəl Arif gəlsin, sonra Sadiq (zaman zərfi). Xəstə qatıqdan başqa heç nə yemir (qoşma). Arzunu başqa işə dəyişdilər (sifət).

Ana dilindən qeyri dili sevmirəm. Qeyrisi çor desə, can deyir ona, mən qurban oluram, bəyənmir məni (isim). Yaxın dostumdan qeyri adamın gəlməsini istəmirəm (sifət) (Xəlilov, 2002). Modal sözlərdən bir qismi həm modal söz kim, həm də digər nitq hissəsi kimi çıxış edənlər:

Şübhəsiz ki, bu gün yağan qar iki – üç günə əriyəcək (modal söz). Dostum bu məsələni şübhəsiz həll etdi (zərf). Ola bilər, sabah qar yağsın (modal söz). Bu məsələ günü sabah həll ola bilər (feil). Deyirlər, havalar bu gündən başlayaraq isinəcək (modal söz). Çoxları mənə fağırsan deyirlər (feil). Deyəsən, məni başa düşmədin (modal söz). Gərək bunu sən atana deyəsən (feil). Görəsən, çağırsam gələrmi ceyran? (modal söz). Gərəkdir ki, bu işi sən görəsən (feil). Axırda, biz gəlib kəndə çatdıq (modal söz). Siz axırda gəlsəniz, yaxşı olar (zərf) (Nərimanov, 2004).

Qoy mən yenə söhbət açım ilk baharımdan (ədat). Kitabı yerinə qoy (fel). Təkcə sən deyən olmalıdı, məgər (ədat). Yazıq uşaq şəhərə təkcə getdi (zərf). Yalnız sizi tanıyıram (ədat). Ədalət bu gecə çadırda təkcə yatdı (zərf). Olmaya, bu gələn müəllimdir? (ədat). Gərək Vaqif burada olmaya (feil). Axır mənə de görüm sən nə üçün burada işləmək istəmirsən? Sən axır(da) gəl, Arif tələsir (zərf). Su lal – dinməzcə axır, hərdənbir şaqqıllayır (feil). Ah mən onun üçün nələr etmədim? (nida). Ahın dağlara, daşlara! (isim) (Hüseyn, 2005).

Bəzi köməkçi nitq hissələri var ki, onlar sintaktik üsulla, yəni digər bir leksik mənalı sözə qoşularaq mürəkkəb söz, yəni tərkibi söz, yaxud söz birləşməsi yaradır. Nümunələrə nəzər salaq:

Mən də sənin kimi bəxtiqara səyyadam,
Tor atıram tərlan üçün sar gəlir (aşıq şeiri).
Ondan ötrü burnumun ucu göynəyir.

Belə qocalar haqqında o, nənəsindən maraqlı nağıllar eşitmişdi.

Rzabalanın haqqında kim danışmaq istəyir? (Ordubadi, 2012). Qardaşım konsulxanadan qayıtdıqdan sonra sizin barənizdə fikrini tamamilə dəyişib. Onların heç biri Xəzər qədər xoşuma gəlmədi (Ordubadi, 2012).

Nümunələrdəki işarələnmiş qoşmalı birləşmələr sintaksisdə bir üzv vəzifəsində çıxış edir, əgər həmin qoşmaları (üçün, ötrü, haqqında, barəsində, qədər...) cümlədən çıxsaq, cümlənin mənası məntiqi baxımdan itər. Təkcə bir nümunə: Mən də sənin kimi oxuyacağam cümləsində kimi qoşmasını çıxsaq, belə bir cümlə olar – Mən də sənin oxuyacağam. Göründüyü kimi, bu cümlə tamamilə uyğunsuz bir "cümlə"dir. Bax elə qrammatik məna da budur. Deməli, qrammatik məna pozulduqda, məntiqi məna da pozulur (Kazımov, 2014).

Onu da qeyd edək ki, bəzi qoşmalı birləşmələr cümlənin xəbəri də ola bilir. Almaz da sənin kimidir, dediyindən dönməz (Cabbarlı, 2005).

Əvvəla, bu sözlər köməkçi fel kimi götürülə bilməz, ona görə ki, bunların leksik mənası yoxdur. İkincisi, bunlar fel şəkillərinin hekayəsi, rəvayəti, şərti kimi qəbul edilə bilməz (hərçənd ki, uzun illər belə yazılıb belə də deyilib). Çünki bu sözlər – köməkçi sözlər təkcə fellərə qoşulmur (gəlmiş idi, oxuyacaq imişşə və s.) onlar bütün leksik mənalı sözlərə qoşulur (Arif idi, Arif imiş, Arifsə, Aldığım qiymət beş idi, Onun xətti gözəl imiş, Danışan mən idim, dinləyən sən idin, işi görən sənsənsə, bəs o nə deyir? (Seyidov, 2002).

Çox haqlı olaraq son illərdə orta məktəb qrammatikalarında bu sözlər sadəcə olaraq hissəcik adlandırılmışdır. Biz də bu fikirdəyik, çünki onlar bütün əsas nitq hissələrinə hətta köməkçi nitq hissələrinə də qoşula bilir və tərkib halında cümlədə bir üzv vəzifəsində çıxış edir. Həmçinin, qoşulduğu sözü keçmiş zamana bağlayır. Qeyd edək ki, morfoloji xarakterinə və sintaktik məqamına görə ikən bağlaması –idi, -imiş hissəciklərindən fərqlidir. Bu fərqlərin başlıcası odur ki, ikən bağlaması qoşulduğu sözü keçmiş zamana bağlamaq xüsusiyyətinə malik deyildir. Tərkibində ikən olan birləşmələr zaman zərfi və ya zərfliyi məzmunu daşıyır və həmin cümlələr müxtəlif zamanlarda ola bilir (Əfəndiyev, 1963). Dil faktlarına müraciət etməklə bu fikri bir daha dəqiqləşdirək:

Qoşulduğu söz və ya tərkiblə birlikdə zaman bildirir və cümlədə zaman zərfliyi vəzifəsində çıxış edir:

Konsulun özü vaxt ikən məni yanına çağırıb demişdi (M.S.Ordubadi). Biz gecə ikən Tütünçü oğlu ilə birlikdə onların mənzilinə getməli olduq (M.S.Ordubadi). Bahadır burda ikən mən hissiyyatımı ondan gizlədirdim (Nərimanov, 2004). Qoşulduğu söz və ya tərkiblə birlikdə hal – vəziyyət bildirir: Vaxtı ilə bu küçə uçuq-sökük evlərdən ibarət ikən indi nə qədər də gözəlləşmişdi. Diri ikən ölü kimi yaşamağın daha bəsdir . Sözlü ikən niyə qoşulub qaçdın, bala (Hüseyn, 2005).

Azərbaycan dilçiliyində uzun illərdir ki, sintaksisin tədqiqində struktur-semantik yanaşmaya xüsusi önəm verilir. Bu istiqamətdə aparılan ənənəvi araşdırmalar zamanı köməkçi nitq hissələrinin quruluş xüsusiyyətləri və onların mətnin struktur-semantikasında oynadığı rol da nəzərdən qaçırılmır. Aydındır ki, sözlərin, söz birləşmələrinin və cümlələrin qarşılıqlı əlaqəsinin qurulmasında, mətnin ümumi strukturunun formalaşmasında, müxtəlif qrammatik məna çalarlarının ifadəsində köməkçi nitq hissələri əhəmiyyətli rol oynayır. Belə vasitələr olmadan mətnin bütövlüyünü təsəvvür etmək demək olar ki, mümkünsüzdür.

## Nəticə

Mətn daxilində istifadə edilən hər bir dil vahidinin müəyyən funksiyası olduğu kimi, köməkçi nitq hissələri də xüsusi vəzifə daşıyır. Onlar təkcə qrammatik əlaqələndirici funksiya ilə məhdudlaşmır, çox vaxt semantik və üslubi çalarlar da qazandırır. Bu nitq vahidləri, adətən, müxtəlif quruluşa malik olub, müstəqil sözlər əsasında formalaşmış və dilin müxtəlif ünsürlərindən yaranmışdır. Onların tarixi-etimoloji baxımdan öyrənilməsi elmi baxımdan mühüm əhəmiyyət daşıyır.

Xüsusilə, mürəkkəb quruluşlu köməkçi nitq hissələrinin tərkibində fərqli nitq hissələrindən ibarət elementlərin birləşməsi müşahidə olunur ki, bu da onların tarixi və etimoloji baxımdan təhlilini asanlaşdırır (Təhməzov, 2017).

Nümunələrin sayını istənilən qədər artırmaq olar. Yekun olaraq onu qeyd etmək lazımdır ki, yarımmənalı sözlər, yəni köməkçi nitq hissələri adlandırılmış söz qrupları və ya hissəciklər, habelə ikən bağlaması da qrammatik məna kəsb etməklə bərabər, yeri gəldikdə sintaktik vəzifə də daşıya bilir.

## Ədəbiyyat

1. Abdullayev, N. (2013). *Nitq mədəniyyətinin əsasları.*
2. *Azərbaycan dilinin qrammatikası.* (1960).
3. Cabbarlı, C. (2005). *Seçilmiş əsərləri.*
4. Əfəndiyev, Y. (1963). *Köməkçi nitq hissələrinin tədrisi (qoşma və bağlayıcı).*
5. Hüseynzadə, M. (2007). *Müasir Azərbaycan dili. III hissə: Morfologiya*.
6. Hüseyn, M. (2005). *Seçilmiş əsərləri.*
7. Xəlilov, B. (2002). *Müasir Azərbaycan dilinin morfologiyası.*
8. Kazımov, Q. (2014). *Müasir Azərbaycan dili. Morfologiya*
9. Nərimanov, N. (2004). *Seçilmiş əsərləri.*
10. Ordubadi, M.S. (2012). *Dumanlı Təbriz (roman).*
11. Seyidov, Y. (2002). *Azərbaycan dilinin qrammatikası (Morfologiya).*
12. Təhməzov, Z. (2017). *Müasir Azərbaycan dilində köməkçi nitq hissələrinin təsnifi*.

Daxil oldu: 04.02.2025
Qəbul edildi: 22.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/51-54

**Dilnoza Muratova**
Fergana State University
PhD in Philology
https://orcid.org/0000-0002-6413-6957
muratovadilnoza2@gmail.com

# Communicative-Pragmatic Analysis of Linguistic Means Forming Apology Acts

## Abstract

This article analyzes the communicative-pragmatic features of linguistic means that form the act of apology. It explores functional characteristics of apologies within the framework of speech act theory, focusing on appropriateness to context and links to socio-psychological factors. The article also compares Uzbek and English apology expressions, discussing their linguopragmatic aspects and cultural significance. Additionally, illocutionary and perlocutionary force of apology expressions are examined in cross-cultural communication.
***Keywords:*** *apology act, pragmatics, linguopragmatics, speech act, communication tools, communicative situation, intercultural communication*

**Dilnoza Muratova**
Fərqanə Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-6413-6957
muratovadilnoza2@gmail.com

# Üzr aktını formalaşdıran dil vasitələrinin kommunikativ-praqmatik təhlili

## Xülasə

Bu məqalədə üzr aktını formalaşdıran dil vasitələrinin kommunikativ-praqmatik xüsusiyyətləri işıqlandırılır. Dilçilikdəki praqmatik yanaşma, xüsusilə nitq aktları nəzəriyyəsi çərçivəsində üzr ifadələrinin funksional xüsusiyyətləri, nitq vəziyyətinə uyğunluğu və sosial-psixoloji amillərlə əlaqəsi təhlil olunur. Özbək və ingilis dillərindəki üzr ifadələrinin linqvopraqmatik xüsusiyyətləri və onların ünsiyyət mədəniyyətindəki yeri nəzərdən keçirilir. Həmçinin, nitq aktları nəzəriyyəsində üzr sözlərinin illokuativ və perlokutiv təsir gücü və onların mədəniyyətlərarası ünsiyyətdə oynadığı rol barədə təhlillər təqdim olunur.
***Açar sözlər:*** *üzr aktı, praqmatika, linqvopraqmatika, nitq aktı, ünsiyyət vasitələri, kommunikativ vəziyyət, mədəniyyətlərarası ünsiyyət*

## Introduction

Language is the main tool of communication in human society. It not only enables the transmission of information but also plays a vital role in shaping social relationships and maintaining societal harmony. Among the various linguistic functions, speech acts-particularly apologies-serve as essential mechanisms for conflict resolution, expression of regret, and restoration of social balance. Apology acts are employed to acknowledge a breach of social norms or expectations and to seek forgiveness from the affected party. As such, they are crucial in both personal and institutional contexts.

Since the end of the 20th century, pragmatics has emerged as a distinct and rapidly developing branch of linguistics. It explores how language is used in real-life contexts, focusing on the relationship between linguistic expressions and the users' intentions. Within this field, speech acts such as apologies are examined in terms of their structure, function, and communicative

 

effectiveness. Pragmatics is concerned not only with what is said but also with what is implied, presupposed, or understood in a given context. Thus, the speaker's intention, the listener's interpretation, the situational context, and the underlying cultural norms are all central to the pragmatic analysis of apology acts.

The psychological and cultural contexts that arise during communication significantly influence the form and content of apologies. Emotionally, apology acts are closely tied to feelings of guilt, shame, empathy, or responsibility, and the intensity of these emotions can affect the way an apology is formulated. Culturally, every society has its own norms regarding when and how to apologize, who should apologize, and what constitutes an acceptable apology. These norms are deeply embedded in language and vary widely across linguistic communities.

Particularly, communicative differences between Uzbek and English cultures determine how apologies are expressed and interpreted (Kolshanskiy, 1984; Susov, 1990). In English, phrases such as "Excuse me," "I'm sorry," and "I beg your pardon" are used in a range of contexts—from minor inconveniences to more serious offenses. These expressions can vary in formality, with "Excuse me" often used for attention-getting or minor intrusions, while "I'm sorry" is typically more emotionally loaded. In Uzbek, equivalents such as "Uzr," "Kechirasiz," and "Afv etasiz" fulfill similar functions but are shaped by unique sociocultural conventions. For example, "Uzr" is widely used in both casual and formal interactions and carries a deep cultural connotation of humility and respect. "Kechirasiz" is often used in service encounters or when interrupting someone, while "Afv etasiz" is more formal and commonly used in official or highly respectful contexts. Additionally, body language, tone, and the use of honorifics further influence how apology acts are perceived in Uzbek society (Mo'minov, 2005; Iskandarova, 1993).

Understanding the pragmatic and cultural dimensions of apology acts in both English and Uzbek not only deepens our awareness of cross-cultural communication but also highlights the importance of context-sensitive language use. Comparative studies in this area can reveal important insights into how different linguistic communities manage social harmony and interpersonal relations through language.

**Research**

Literature review and methods. This article presents a pragmatic analysis of the units that form apology acts based on the approaches of scholars such as G.V.Kolshanskiy, I.R.Susov, V.M.Alpatov, and V.N.Golovin. Additionally, the views of Uzbek linguists such as S.Muminov, Sh.Iskandarova, M.Hakimov, Sh.Safarov, Sh.Usmonova, and D.Khudoyberganova are also referenced (Usmonova, 2015; Xudoyberganova, 2020; Hakimov, 2001; Safarov, 2010). The expression forms of apology acts in language are elucidated using component, textual, and functional analysis methods.

Research methods include linguopragmatic analysis, component analysis based on communication theory, cross-cultural pragmatic approaches, and text analysis techniques. Special attention is given to how apology phrases in English literary texts are reinforced through phonetic and stylistic devices.

Results and Discussion. The study revealed that the apology act is a significant component of pragmatic competence. Apologies serve as tools for maintaining interpersonal relationships, repairing social breaches, and navigating culturally defined expectations of politeness. The choice of linguistic tools in apologies is closely tied to the speech context, social roles of interlocutors, and the degree of formality. In Uzbek, expressions like *"Kechirasiz"* and *"Uzr"* are pragmatically nuanced. *"Kechirasiz"* is commonly used in everyday situations such as asking someone to move or interrupting a conversation, while *"Uzr"* conveys deeper regret and is often used in more serious or formal apologies (Qurbonova, 2018). *"Afv etasiz"* tends to appear in highly respectful or institutional settings, emphasizing social distance and deference.

In English, apology phrases such as *"Sorry," "Excuse me,"* and *"I beg your pardon"* also vary in formality, emotional weight, and context. For example, *"Sorry"* can range from casual use to express minor regret to heartfelt apologies in more emotional contexts. *"I beg your pardon"* is more formal and may imply surprise or the need for clarification in addition to apology. These expressions

often serve dual functions: maintaining politeness and signaling the speaker's social awareness (Golovin, 1985; Searle, 1969).

Apologizing in communication is not only a linguistic action but also a complex socio-cultural phenomenon influenced by values such as honor, respect, group harmony, and emotional expression. In collectivist cultures like Uzbek society, where respect for elders, group cohesion, and hierarchical relationships are emphasized, apologies often include markers of humility and self-effacement (Alpatov, 1991; Golovin, 1981). In contrast, English-speaking cultures, particularly in more individualistic societies, may prioritize sincerity and directness in apology acts, while still observing politeness strategies.

According to speech act theory, the apology act consists of locutionary (the actual utterance), illocutionary (the intended meaning or function), and perlocutionary (the listener's reaction) components (Austin, 1962; Searle, 1969). From this perspective, an apology not only conveys regret but also serves as a speech act that helps manage social expectations and reestablish mutual understanding. This three-part structure is essential for understanding how apology expressions achieve their communicative function in both languages.

The linguopragmatic analysis in this study also identifies the denotative (literal) and connotative (implied or emotional) meanings of apology expressions. For example, while *"Uzr"* and *"Sorry"* both denote an apology, their connotations may vary greatly — *"Uzr"* may carry an implicit plea for forgiveness and submission, while *"Sorry"* may signal responsibility and remorse depending on intonation and context.

Furthermore, the study addressed pragmatic barriers — instances when communicative failure arises not from grammatical error, but from inappropriate or misunderstood use of speech acts. These barriers can occur in intercultural interactions when speakers are unaware of cultural expectations regarding apologies. For example, a direct "Sorry" may be perceived as insincere in cultures that expect more elaborate or emotionally expressive apologies. Conversely, a highly formal or ritualistic apology in Uzbek may be seen as excessive or distant in casual English contexts. In such cases, apologies function not just to express regret but to repair pragmatic failures and restore effective communication.

In literary texts, particularly in English-language fiction such as *Harry Potter*, apology expressions are creatively employed to convey character emotion and narrative tension. Forms like *"S-s-sorry"* or repeated apologies (e.g., *"I'm really, really sorry"*) not only dramatize the situation but also signal hesitation, fear, or deep remorse. These phonetic and stylistic variations highlight how apologies can be emotionally rich and pragmatically complex.

## Conclusion

The communicative-pragmatic analysis of apology expressions demonstrates that apologies are not merely formulaic language structures but are deeply embedded in the psychological, cultural, and social fabric of communication. They reflect the speaker's awareness of social norms, emotional intelligence, and interpersonal sensitivity.

By comparing apology expressions in English and Uzbek, the study emphasizes that speech acts function within culturally defined frameworks. While both languages employ apologies to manage interpersonal relationships, the structure, frequency, and emotional depth of these expressions differ significantly due to cultural values, societal norms, and pragmatic conventions. Understanding these differences is essential for developing effective cross-cultural communication skills.

Within the framework of speech act theory, apologies serve as essential mechanisms for restoring social order, acknowledging responsibility, and expressing politeness. They are integral to the dynamics of everyday communication, conflict resolution, and the maintenance of social harmony.

This analysis has broader implications in pedagogical linguistics**,** translation theory**,** cross-cultural pragmatics**,** and foreign language teaching. For language learners, acquiring the ability to use apologies appropriately in various contexts enhances not only grammatical proficiency but also pragmatic competence, which is vital for real-world communication. Educators and translators can

benefit from understanding the cultural underpinnings of apology expressions to avoid miscommunication and to promote culturally sensitive interpretation.

Future research may explore how apologies are received and evaluated by native speakers, how non-verbal elements (e.g., gestures, facial expressions) accompany apology speech acts, and how technology-mediated communication (e.g., texting, emails) affects the way apologies are expressed and interpreted in different cultures.

## References

1. Alpatov, V.M. (1991). *Linguistics and society*. Nauka.
2. Austin, J.L. (1962). *How to do things with words*. Oxford University Press.
3. Golovin, V.N. (1981). *Communication and speech behavior*. Higher School.
4. Golovin, B.N. (1985). *Language and communication*. Nauka.
5. Hakimov, M. (2001). *O'zbek tilida matnning pragmatik talqini* (Doctoral dissertation).
6. Xudoyberganova, D. (2020). *O'zbek tilida muloqot vositalari va ularning pragmatik tahlili*. Intellekt.
7. Iskandarova, Sh.M. (1993). *O'zbek nutq odatining muloqot shakllari* (PhD dissertation abstract).
8. Kolshanskiy, G.V. (1984). *Status of linguistic pragmatics*. Nauka.
9. Qurbonova, M.A. (2018). *Nutqiy aktlar nazariyasining lingvistik asoslari*. O'qituvchi.
10. Mo'minov, S. (2005). *O'zbek tilida muloqot madaniyati*. Fan.
11. Safarov, Sh. (2010). *Nutq aktlari va ularning lingvistik xususiyatlari*. Fan.
12. Susov, I.R. (1990). *Pragmatics and language usage*. Leningrad University Press.
13. Searle, J.R. (1969). *Speech acts: An essay in the philosophy of language*. Cambridge University Press.
14. Usmonova, Sh. (2015). *O'zbek tilida uzr ifodalarining lingvopragmatik tahlili*. Tashkent: Akademnashr.

Received: 02.02.2025
Accepted: 15.04.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/55-62

**Aytac Rəhimli**
Bakı Dövlət Universiteti
doktorant
https://orcid.org/0009-0004-6776-9874
aytacrahimli1@gmail.com

# Aktiv əməliyyatların optimallaşdırılmasında müasir bank texnologiyalarının rolu

### Xülasə

Bu məqalə bank texnologiyalarının sürətli inkişafı nəticəsində rəqəmsallaşmanın rolu və onun bankların aktiv idarəçiliyi və əməliyyat səmərəliliyinə təsirlərini araşdırır. Rəqəmsallaşmanın geniş tətbiqi sayəsində mobil və internet bankçılıq, açıq bankçılıq və API texnologiyaları vasitəsilə banklar müştərilərə daha sürətli və əlçatan xidmətlər təqdim olunmasına imkan yaradır. Blokçeyn texnologiyası mərkəzləşdirilməmiş strukturu ilə risksiz və şəffaflıq səviyyəsini yüksəldərək kredit riskinin və saxtakarlığın qarşısını almağa kömək edir. Süni intellekt və maşın öyrənməsi alqoritmlərinə əsaslanan analiz üsulları bankların kredit portfellərinin optimallaşdırılması, risklərin daha dəqiq qiymətləndirilməsi və likvidliyin proqnozlaşdırılmasında əsas rol oynayır. Böyük verilər analitikası isə müştəri davranışlarının daha dərindən analizi, kredit portfelinin keyfiyyətinin yüksəldilməsi və əməliyyat effektivliyini artırılması üçün tətbiq edilir. COVID-19 pandemiyası rəqəmsallaşmanı daha geniş tətbiq edilməsini təşviq etmiş və bankların strateji idarəçiliyində rəqəmsal texnologiyaların önəmini artırmışdır. Nəticədə, bu texnologiyalardan istifadə edilməsi əməliyyat sürətini, aktivlərin keyfiyyətini və maliyyə dayanıqlılığını yüksəldərək banklara uzunmüddətli rəqabət üstünlüyü təmin edir.

***Açar sözlər:*** *aktivlərin optimizasiyası, bank texnologiyaları, mobil və internet bankçılıq, açıq bankçılıq, blokçeyn, maşın öyrənməsi, böyük verilənlər*

**Aytaj Rahimli**
Baku State University
PhD student
https://orcid.org/0009-0004-6776-9874
aytacrahimli1@gmail.com

# The Role of Modern Banking Technologies in Optimizing Active Operations

### Abstract

This article investigates the role of digitalization, driven by the rapid advancement of banking technologies, and its impact on banks' asset management and operational efficiency. The widespread adoption of digital solutions, including mobile and internet banking, open banking initiatives, and API technologies, has enabled banks to deliver faster and more accessible services to customers. Blockchain technology, with its decentralized structure, enhances transparency and mitigates both credit risk and fraud. Analytical methods based on artificial intelligence and machine learning algorithms play a crucial role in optimizing banks' credit portfolios, improving the precision of risk assessments, and forecasting liquidity. Additionally, big data analytics is utilized to conduct deeper analyses of customer behavior, enhance credit portfolio quality, and increase operational efficiency. The COVID-19 pandemic has accelerated the adoption of digitalization and underscored the strategic importance of digital technologies in banking management. Consequently, the integration of these technologies has contributed to improvements in operational speed, asset quality, and financial resilience, thereby providing banks with a sustainable competitive advantage.

***Keywords:*** *asset optimization, banking technologies, mobile and internet banking, open banking, blockchain, machine learning, big data*

## Giriş

Banklar müasir maliyyə sistminin mühüm tərkib hissəsidir və iqtisadi artımın təşviqində mühüm rol oynayır. Rəqəmsallaşdırılmış maliyyə vasitəçiliyinin səmərəliliyi bank uğursuzluqlarını və sistem xarakterli böhranları yumşaltmaqla yanaşı, iqtisadi artıma əhəmiyyətli dərəcədə təsir göstərir. Rəqəmsal platformaları mənimsəmiş banklar mobil bankçılıqdan rəqəmsal pul kisələrinə və virtual məsləhət xidmətlərinə qədər geniş çeşiddə məhsullar təklif edir. Rəqəmsallaşmaya keçid təkcə ayrı-ayrı əməliyyat komponentlərinin səmərəliliyini artırmaqla yanaşı, bank əməliyyatlarının müxtəlif aspektlərini bir araya gətirməklə sektorun ümumi əməliyyat səmərəliliyini də yaxşılaşdırıb.

Bankların fəaliyyəti və müştərilər ilə qarşılıqlı əlaqə rəqəmsallaşma vasitəsilə dəyişir. Banklar ənənəvi biznes modellərini yeniləmək və daha səmərəli və həssas əməliyyat sistemləri yaratmaq üçün getdikcə daha çox rəqəmsal texnologiyaya diqqət yetirirlər. Əvvəllər əl ilə həyata keçirilən daxili proseslər indi avtomatlaşdırıla bilər, bu da xərclərin azaldılması və emal vaxtının sürətləndirilməsidir (Sulistyashati, Munashir, 2024).

Rəqəmsallaşma həm də kredit və likvidlik risklərini idarə etmək üçün yeni imkanlar təklif edir. Bu risklər uzun müddətdir ki, bank idarəçiliyi üçün əhəmiyyətli problemlərdir. Məlumata əsaslanan analitik yanaşmalar bankların risk modellərini daha sürətli və daha dəqiq müəyyən etmək imkanına malikdir. Bu texnologiyaların tətbiqi maliyyə institutlarına potensial riskləri əməliyyat fəaliyyətlərinə əhəmiyyətli dərəcədə təsir etməzdən əvvəl aşkar edib minimuma endirmək imkanı verir. Kredit müraciətləri avtomatlaşdırıldıqda, kredit riskinin qiymətləndirilməsi daha dəqiq ola bilər və beləliklə defolt ehtimalını azaltmağa kömək edir.

Ümumiyyətlə, yüksək texnoloji həllərdən istifadə bütün bank sektorunun səmərəliliyinə əhəmiyyətli dərəcədə təsir göstərir. Bunlar işçi qüvvəsinin səmərəliliyinin artırılması, xərclərin azaldılması, resursların səmərəli idarə edilməsi, əməliyyatların gəlirliliyinin artırılması, rəqabət qabiliyyətinin artırılması və bütün dünyada davamlı artıma nail olmaq kimi çoxsaylı imkanlar təklif edir. Bu, xüsusilə yeni yanaşmaların və müasir texnologiyaların bank sisteminə inteqrasiyasının nəzəri və praktiki aspektləri üzrə daha əhatəli tədqiqatların aparılmasını zəruri edir. Bu, ənənəvi bank təcrübələrini kökündən dəyişdirdi və fiziki şəxsləri, biznesləri və iqtisadiyyatları maliyyə cəhətdən gücləndirdi.

Rəqəmsal bankçılıq platformaları, blokçeyn, böyük məlumat analitikası və süni intellekt kimi texnologiyaların ortaya çıxması maliyyə xidmətlərinin bütün dünyada istehlak, çatdırılma və istifadə üsulunu tamamilə dəyişdirdi. Bu dəyişikliklər nəinki bankların əməliyyat imkanlarını artırdı, həm də maliyyə xidmətlərinə çıxışı daha demokratik etdi, beləliklə, xüsusilə az xidmət göstərən icmalarda və inkişaf etməkdə olan bazarlarda daha çox maliyyə inklüzivliyini və səlahiyyətlərini təşviq etdi (Yoganandham, 2024).

Banklar səmərəliliyi artırmaq üçün proseslərin avtomatlaşdırılması, böyük verilənlər, süni intellekt (AI) və bulud əsaslı sistemlər kimi texnologiyaları inteqrasiya edir. Bu, sürəti, dəqiqliyi, ardıcıllığı artırır və əməliyyat xərclərini azaldır. Bununla belə, bu texnologiyaların tətbiqi yeni texnologiyaların qəbulunu dəstəkləmək üçün adekvat infrastruktur, kifayət qədər insan resursları və şirkət mədəniyyətinin dəyişdirilməsini tələb edir.

Müasir bank texnologiyaları sayəsində banklar aktivlərin idarə edilməsində böyük üstünlüklər əldə edirlər. Böyük verilənlərin analitikası ilə kredit risklərinin daha dəqiq qiymətləndirilməsi, süni intellektlə dəstəklənən alqoritmlərlə maliyyə bazarlarında baş verən dalğalanmaların daha effektiv idarə olunması və blokçeyn texnologiyası ilə daha təhlükəsiz əməliyyatlar sayəsində bankların maliyyə göstəriciləri yaxşılaşır. Rəqəmsal ödəniş sistemləri, mobil bankçılıq proqramları və açıq bank həlləri də banklara likvidliyin idarə edilməsini və kapitalın bölüşdürülməsini optimallaşdırmağa və müştəri təcrübəsini təkmilləşdirməyə kömək edir.

COVID-19 pandemiyası bank sektorunun rəqəmsallaşmaya keçidini sürətləndirərək onun səmərəliliyinə əhəmiyyətli təsir göstərmişdir. Tədqiqat, İqtisadiyyat 4.0 kontekstində bank

sektorunun səmərəliliyini artırmaq və iqtisadi rəqabət qabiliyyətini gücləndirilməsi üçün vacib olan rəqəmsallaşmaya davamlı investisiyaların vacibliyini vurğulayır.

**Tədqiqat**

Rəqəmsal bankçılıq və varlıq idarəetməsi:

1.1.Mobil və internet bankçılıq: Bank sektorunda rəqəmsal transformasiyanın ən mühüm mərhələlərindən biri mobil və internet bankçılığın inkişafıdır. Ənənəvi bank xidmətləri, internetdən geniş istifadə və smart cihazların artan istifadəsi ilə getdikcə daha çox rəqəmsal platformalara köçürülür. Bu proses bankların əməliyyat səmərəliliyini artırmış, əməliyyat müddətlərini sürətləndirmiş və maliyyə xidmətlərinə çıxışı asanlaşdırmışdır.

Mobil cihazlar vasitəsilə həyata keçirilən mobil bankçılıq bankların müştərilərinə təklif etdiyi əsas rəqəmsal bankçılıq vasitələrindən biri hesab olunur. Ona görə də arzuladığı mobil cihaza, yəni smartfona sahib olan insanlar istədikləri yerdə və istədikləri vaxt bank xidmətlərindən yararlana bilərlər. Bundan əlavə, müştərilər bir çox bank əməliyyatlarından, o cümlədən bankların təklif etdiyi mobil bankçılıq proqramlarından yararlana bilərlər. Bütün bank əməliyyatlarına kartların bloklanması, hesab üzrə çoxlu ödənişlərin aparılması, balansın yoxlanılması və s. daxildir (Məmmədov, 2013).

Araşdırmalara görə, müştərilər mobil bankinq proqramları vasitəsilə taksit kartları, köçürmələr və ya birbaşa debetlərdən istifadə etməklə alış-veriş edirlər. Mobil bank proqramları istifadəçilərə birbaşa kartlarına və ya depozit hesablarına ödənişlər etməyə imkan verir. Bəzi müştərilər bonus xalları və alışlarında endirimlər qazanmaq üçün elektron cüzdanlarına kredit köçürür. Kredit köçürmələri həm mobil bankinq proqramları, həm də veb bankçılıq vasitəsilə həyata keçirilə bilər. Bu, həm internet bankçılıq, həm də mobil bankçılıqdan istifadəni artırmaqla rəqəmsal maliyyə xidmətlərinin yayılmasına töhfə verir (Choshdhury, Karim, Ashanis, Roshnak, 2024).

İnternet bakçılıq dedikdə, müştərilərin istənilən vaxt banklar tərəfindən irəli sürülən bir çox əməliyyatlardan (nağd pul vəsaitlərin yerləşdirilməsi və çıxarılması istisna olmaqla) istifadə etməsi başa düşülür. İnternet bankçılıqdan istifadənin əhatə dairəsi günü-gündən genişlənməkdədir. Bu gün demək olar ki, bütün banklar internet bankçılıq vasitəsi ilə müştərilərə bir çox bank xidmətləri təklif edirlər. İnternet bankçılığın banklara və müştərilərə verdiyi üstünlüklər baxımından ən əhəmiyyətli alternativ paylama kanalları arasında olduğunu söyləmək mümkündür (Özkan, İpekten, 2017). Banklar mobil və internet bankçılıqla öz aktivlərini daha effektiv idarə edə bilərlər. Real vaxt rejimində məlumat axını əməliyyat və infrastruktur xərclərini azaltmağa və gəlirliliyi artırmağa imkan verir. Kredit və investisiya məhsullarının sürətli çatdırılması hesabına aktivlərin artımı sürətlənir. Fond köçürmələri və elektron ödənişlər sayəsində likvidlik artır. Müştəri davranışı haqqında hərtərəfli məlumatdan istifadə etməklə banklar riskləri daha dəqiq qiymətləndirə və aktivlərin keyfiyyətini yaxşılaşdıra bilərlər. İstifadə asanlığı və müştəri məmnuniyyəti uzunmüddətli əlaqələr qurmağı asanlaşdırır.

1.2. Açıq bankçılıq və API (Tətbiq Proqramlaşdırma İnterfeysi). Texnoloji və rəqəmsal innovasiyalar banklar üçün əhəmiyyətli strateji nəticələrə malik olub, tez-tez rəqabət mənzərəsini dəyişdirir və sənaye daxilində bazar dinamikasını dəyişdirir (Porter, 1985). Böyük Britaniyada açıq bankçılıq təşəbbüsü (OBWG), 2018-ci ildə Avropada qüvvəyə minən yeni ödəniş sistemləri direktivinin (PSD2) elanı və açıq tətbiq proqramlaşdırma interfeyslərinin (API) tətbiqi açıq bank mühitinin inkişafına təkan verdi (Zachariadis. Ozcan, 2017).

OB, xüsusi maliyyə ekosistemini ifadə edir. Tətbiq proqramlaşdırma interfeysləri (API) vasitəsilə ekosistem, üçüncü tərəf maliyyə xidməti təminatçılarına əməliyyatlara, istehlak bankçılığına və digər maliyyə məlumatlarına çıxış imkanı verir. Banklar və bank olmayan maliyyə institutları bu API-lərdən istifadə edə bilərlər. Tətbiq interfeysi, müştəri təcrübələri və əməliyyatlar üçün təlimatlar bir sıra təhlükəsizlik profilləri tərəfindən idarə olunur. Ekosistemə dəstək verən bankçılıq o deməkdir ki, maliyyə məhsulları və xidmətlərinin əvvəlcədən müəyyən edilmiş birbaşa əlaqələri və ya “təchizat zəncirləri” yoxdur. Bunun əvəzinə, müştərinin seçimi bu mallar və xidmətlər arasında debet və kredit axınını istiqamətləndirir (Laplante, Kshetri, 2021).

Açıq bankçılıq ilə insanlar bir tətbiq vasitəsilə müxtəlif banklardakı hesablarını idarə edə, gəlir və xərclərini təhlil edə, fərdiləşdirilmiş maliyyə məsləhətləri ala, daha rəqabətli kredit və ya

investisiya məhsulları əldə edə bilərlər. Xüsusilə, Fintech şirkətləri rəqabəti artıraraq, maliyyə məhsullarının şaxələndirilməsinə və xərclərin azaldılmasına kömək edən bu sistemə töhfə veriblər. Məsələn, istifadəçi müxtəlif banklardakı hesablarını bir tətbiqdən idarə edə, onların xərcləmə analitikasına baxa və ən uyğun kredit və ya sığorta seçimlərinə daxil ola bilər.

API-lər bank sistemlərinə təhlükəsiz və idarə olunan şəkildə daxil olmaq üçün istifadə edilə bilər. API-nin mövcudluğu açıq və ya qapalı ola bilər. Qapalı API-lər müəssisə daxilində əlçatan olduqda, Açıq API-lər isə müəssisədən kənarda əlçatan olduqda istifadə olunur (Premchand, Choudhry, 2018).

Açıq API-lər xidmətlərin modulyar xarakter daşımaması səbəbindən müştərilərin qorunmasını çətinləşdirir. Müştəri məlumatlarının paylaşılması vəziyyəti daha da çətinləşdirir, çünki o, "giriş üçün maneələri" aradan qaldırır və rəqiblərə (xüsusilə daha kiçik banklara) müştəri məlumatlarına daxil olmaq və bu məlumatlardan "müştəri payı" əldə etmək üçün istifadə etmək imkanı verir (Zachariadis, Ozcan, 2017).

API vasitəsilə banklar əlavə gəlir mənbələri yaradaraq yeni məhsul və xidmətlər təqdim edə bilərlər. Məsələn, bu texnologiya ilə ödəniş xidmətləri, kreditlərin verilməsi və digər maliyyə xidmətləri təklif oluna bilər. Banklar API-lərdən istifadə etməklə daxili proseslərini avtomatlaşdıra və optimallaşdıra bilərlər. Bu, əməliyyat xərclərinin azalmasına və sığortanın daha səmərəli istifadəsinə gətirib çıxarır. Bundan əlavə, toplanmış müştəri məlumatları API vasitəsilə banklar üçün dəyərli aktivlərə çevrilir. Bu məlumat müştəri davranışını təhlil etmək, riskləri qiymətləndirmək və fərdiləşdirilmiş məhsullar təklif etmək üçün istifadə edilə bilər.

Açıq bankçılığın yayılması özü ilə bəzi problemlər də gətirib. Sistemin davamlılığı üçün müştəri məlumatlarının təhlükəsizliyi və məxfiliyi, kibertəhlükəsizlik riskləri, qanunlara uyğunluq prosesləri, müştəri məlumatlılığı və rəqəmsal giriş kimi məsələlər diqqətlə həll edilməlidir. Ona görə də həm banklar, həm də fintech şirkətləri bu məsələlərə ciddi diqqət yetirməlidirlər.

2. Blokçeyn texnologiyası:

Blokçeyn texnologiyası bir çox sahələrdə inqilabi dəyişikliklər etmək üçün yüksək potensiala malik internet texnologiyasıdır. Bank sənayesi və xidmət sahəsi bu texnologiya sayəsində tamamilə dəyişdirilə bilər. Bankların təxminən otuz faizi yeni rəqəmsal platforma yaratmaq üçün blokçeyn sistemindən istifadə edir.

Blokçeyn və Paylanmış Reyestr Texnologiyası (DLT), daha çox şəffaflıq, təhlükəsizlik və səmərəlilik təklif etməklə bank işində inqilab edir. Bu texnologiyalar transsərhəd ödənişlər və təchizat zəncirinin idarə edilməsi vasitəsilə qlobal ticarət və iqtisadi fəaliyyətləri təşviq edir (Alam, Azizah, Caroline, 2025). Hər şeydən əvvəl, blokçeyn texnologiyası tərəfindən təmin edilən artan inam, etibarsızlıq səbəbindən yaranan hər hansı birbaşa və dolayı xərcləri və səyləri azalda bilər və kod kimi təcəssüm olunan əməliyyat məntiqi vasitəsilə qeyri-müəyyənliyi aradan qaldıra bilər (Beck, 2018). Əlavə olaraq, ənənəvi bank proseslərindən yaranan uzlaşma müddətləri maliyyə sektoruna ildə 65 ilə 80 milyard ABŞ dolları arasında başa gəlir və blokçeyn texnologiyası bu uzlaşma vaxtlarını azaltmaq və ya hətta aradan qaldırmaq potensialına malikdir (Harsono, 2018).

Blokçeyn texnologiyası maliyyə əməliyyatlarını şəffaf və təhlükəsiz edir, eyni zamanda saxtakarlığın qarşısını alır və bank sistemlərinə inamı artırır. Bütövlükdə bank sektoru inkişaf edən kibertəhlükələrə uyğunlaşmaq və müştərilərin aktivlərini və məlumatlarını qorumaq üçün innovativ texnologiyalardan istifadədə sayıq olmalıdır. Maliyyə institutları, tənzimləyici orqanlar və kibertəhlükəsizlik üzrə ekspertlər arasında əməkdaşlıq qlobal maliyyə sisteminin bütövlüyünü və təhlükəsizliyini qorumaq üçün çox vacibdir (Alam, Azizah, Caroline, 2025).

Blokçeyn texnologiyası kredit müqavilələrini, girov qeydlərini və ödəniş tarixini saxlamaqla kredit riskini və fırıldaqçılığı azaldır. İnvestisiya portfelindəki aktivlərin hüquqlarını qorumaq üçün mülkiyyət qeydləri blokçeynində saxlanmalıdır. Bu, səhv qeyd etmə riskini aradan qaldırır. Kriptoqrafik təhlükəsizlik ödənişləri və nağd pul köçürmələrini kiberhücumlardan qoruyur və pul fırıldaqlarının qarşısını alır.

Kredit bazarında blokçeyn borcalanların maliyyə vəziyyətini görünən etməklə kreditorlara daha yaxşı qərarlar qəbul etməyə kömək edir. Kapital bazarlarında məlumatların sürətli və təhlükəsiz axını investorların inamını və qiymətqoyma səmərəliliyini artırır, bu da öz növbəsində bazar likvidliyini artırır və likvidlik böhranlarının qarşısını alır.

Kredit əməliyyatları, blokçeyn texnologiyasının vasitəçisiz və avtomatlaşdırmaya açıq quruluşu sayəsində daha sürətlidir. Ağıllı müqavilələr kreditlərin avtomatik ödənilməsinə və ödənişlərin idarə edilməsinə imkan verir. Banklar isə aktivlərini sürətli şəkildə nağdlaşdırmaq üçün qiymətli kağız əməliyyatlarında dərhal hesablaşma apara bilirlər.

Banklar blokçeyn əsaslı rəqəmsal valyutalardan istifadə edərək, Nostro-Vostro hesablarında pul saxlamaq ehtiyacını azaldaraq, dərhal beynəlxalq köçürmələr edə bilərlər. Ağıllı müqavilələr girovlaşdırılmış əməliyyatlarda avtomatlaşdırılmış risklərin idarə edilməsini təmin edir və aktivlərin tokenləşdirilməsi vasitəsilə qeyri-likvid aktivlər (məsələn, daşınmaz əmlak) daha asan ticarətə çevrilir.

Mərkəzləşdirilməmiş Maliyyə (Defi): Bank sektorunda blokçeyn texnologiyasının tətbiqi və maliyyə xidmətlərinin qeyri-mərkəzləşdirilməsi rəqəmsal bankçılığın yeni formalarının inkişafı ilə nəticələnir. Xarici maliyyə alətləri və nəzarət edilən tənzimləyici idarəetmə, qeyri-mərkəzləşdirilmiş maliyyənin (DeFi) ənənəvi maliyyə sistemini pozmaq potensialına malikdir. DeFi, ənənəvi institutlara nisbətən daha çox şəffaflıq təmin edir və mövcud maliyyə sistemi ilə üzləşir (Haberly, MacDonald-Korth, Urban, Shójcik, 2019). Blokçeyn vasitəsilə mərkəzsizləşdirmə alıcılara və satıcılara real vaxt rejimində valyuta əməliyyatları aparmağa imkan verir, əməliyyatları emal etmək üçün vasitəçilərə ehtiyacı aradan qaldırır. Bu, prosesi daha da sürətləndirir (Hillsberg, 2018).

Bankların sahib olduğu və ya blokçeynində girov kimi saxladığı nəqliyyat vasitələri və daşınmaz əmlak kimi aktivlərin qeyd edilməsi aktivlərə mülkiyyət prosesini daha şəffaf edir. Məsələn, girov qoyulmuş əmlakın mülkiyyət sənədi blokçeyndə saxlandıqda, satış və köçürmələr daha sürətli və təhlükəsiz olur. Blockchain ticarət kreditləşməsi və təchizat zəncirinin maliyyələşdirilməsi üçün maliyyələşdirmə və əməliyyatları vahid platformada birləşdirərək əməliyyatların düzgünlüyünü təmin edir. Bundan əlavə, tənzimləyici hesabatlar üçün tələb olunan məlumatlar real vaxt rejimində yeniləndikdə, banklar hesabat prosedurlarını sadələşdirir və hesabatların düzgünlüyünü artırır.

Blokçeynin bank və maliyyə xidmətlərinin gələcəyi olmasını təşviq edən mərkəzləşdirilməmiş sistem, yüksək təhlükəsizlik və avtomatlaşdırma qabiliyyəti kimi bir çox avantajlara malik olsa da, onun bir çox dezavantajları da var. Belə ki, blokçeynin, yeni texnologiya sayıldığı üçün tam mənimsənilməməsi, ətraf mühitə və davamlı inkişaf prinsiplərinə zidd olan yüksək enerji sərfiyyatı, əməliyyatların geri dönülməzliyi, sındırılma ehtimalı olan ictimai verilənlər bazası kimi bəzi çatışmazlıqları bank sektoruna birbaşa təsir göstərə bilər.

3. Maşın öyrənməsi:

Bankların üzləşdiyi əsas risklər kredit, bazar və əməliyyat riskləridir. Digər risk növlərinə likvidlik, biznes və reputasiya riski daxildir. Risklərin idarə edilməsi banklar üçün belə riskləri izləmək, idarə etmək və ölçmək üçün çox vacibdir (Apostolik, 2009). Süni intellektin tətbiqi və maşın öyrənməsi müasir bankçılıqda rəqəmsal transformasiyanın əsas hərəkətverici qüvvəsinə çevrilərək banklara öz aktivlərini (məsələn, likvid fondlar, investisiya portfelləri və kredit portfelləri) daha səmərəli idarə etməyə imkan verir.

AI və maşın öyrənməsi riskə uyğunlaşdırılmış gəlirləri və kapitalın səmərəliliyini artırır. Kredit portfelinin idarə edilməsində məlumat əsasında sürətli qərarlar verir. Buna görə də, AI balans aktivlərindən (məsələn, verilmiş kreditlər) ən yaxşı şəkildə istifadə etməyə və lazım olduqda portfeli yenidən balanslaşdırmağa kömək edir. ML vasitəsilə banklar kreditlərin gələcək performansını əvvəlcədən proqnozlaşdıraraq daha yaxşı dəyərləndirə bilir. Nəticədə problemli kreditler üçün qabaqlayıcı tədbirlər görülməsi, kreditlərin faiz dərəcəsinin bazar şəraitinə uyğunlaşması və portfelin tərkibinin vaxtında yenilənməsi kimi tənzimlənmələr həyata keçirilə bilər (Smith, 2024). Süni intellektdən istifadə edən banklar tez-tez daha az xərclə və daha sürətli kreditlər emal edə və riskli müştəriləri daha yaxşı süzərək riskləri azalda bilərlər.

Bankların qiymətli kağızlar, səhmlər, istiqrazlar, törəmə alətlər və digər törəmə alətlər kimi investisiya portfellərini gəlirlilik və risk baxımından ən yaxşı şəkildə optimallaşdırmalı olduqları digər mühüm aktiv növüdür.

Bankın portfeli üçün aktiv siniflərinin optimal nisbətinin müəyyən edilməsi, böyük məlumat dəstlərinin təhlili və bazardakı dəyişikliklərə uyğun tənzimləmələr təklif etmək ML alqoritmləri ilə həyata keçirilə bilər (Takyar, 2023).

ML modelləri eyni vaxtda insanların təhlil edə bilmədiyi bir çox amili nəzərə alaraq risklərin bölüşdürülməsi (şaxələndirilməsi) üçün daha yaxşı həllər təklif edə bilər. Məsələn, bazar dəyişkənliyində gözlənilməz artım və ya korrelyasiya dəyişikliyi proqnozlaşdırıla və portfelə müvafiq düzəlişlər edilə bilər. Əlavə olaraq, AI real vaxtda bazar tendensiyalarını izləmək və indeks portfellərində xüsusilə vacib olan ani balanslaşdırma tövsiyələri vermək üçün istifadə edilə bilər. Bu, portfel üzrə orta gəlirliliyin artmasına və risk göstəricilərinin yaxşılaşmasına (VaR, CVaR və s.) səbəb ola bilər.

Bankın likvidlik mövqeyi kompleks şəkildə bir çox amillərdən, o cümlədən maliyyələşdirmə strategiyalarından, bazar şərtlərindən və kredit portfelinin keyfiyyətindən asılıdır. Odur ki, bank hər zaman əmanətçilərin vəsaitlərindən ibarət öhdəliklərini yerinə yetirmək üçün kifayət qədər likvid aktivlərə malik olmalıdır. Maşın öyrənməsi sayəsində likvidlik riskini daha dəqiq proqnozlaşdırmaq mümkündür.

Süni intellektin likvidliyin idarə edilməsinə daxil edilməsi daha dəqiq maliyyə proqnozlarına, aktivlərin dinamik bölüşdürülməsinə və daha yaxşı risklərə nəzarət etməyə imkan verir. Bankın məlumatları real vaxt rejimində emal edərək bazardakı dəyişikliklərə qarşı proaktiv addımlar atması süni intellektin köməyi ilə mümkündür (Pattam, 2024).

Maşın öyrənmənin çatışmazlıqları onun daha çox "qara qutu" olması və nəticələrin şərh edilməsinin bəzən çətin olmasıdır. Başqa sözlə desək, onların kənar faktorlara məruz qaldıqları iddia edilir. Bu, məlumatların həddindən artıq uyğunlaşmasına və əsassız proqnozlara gətirib çıxarır. Bundan əlavə, onların izahedici dəyişənlərlə izah olunan dəyişənlər arasındakı qeyri-xətti əlaqələrə daha yaxşı uyğunlaşa bildikləri və daha geniş dəyişən toplusunu tətbiq etmək qabiliyyətlərinin daha dəqiq olduğu iddia edilir (Shakeel, 2023).

4. Böyük verilənlər:

Məlumata əsaslanan qərar qəbulu bank sənayesi tərəfindən erkən qəbul edilmişdir. Böyük verilənlər "informasiyanın əldə edilməsi, saxlanması, yayılması, idarə edilməsi və təhlili üçün qabaqcıl texnika və texnologiyalar tələb edən böyük həcmli, yüksək sürətli, mürəkkəb və dəyişkən məlumatları təsvir edən bir termindir". (TechAmerica Fondunun Böyük Məlumatlar üzrə Federal Komissiyası) (Hung, Shen, 2020).

Bank sektoru kimi müxtəlif təşkilatlarda böyük verilənlərin analitikasından istifadənin çox faydalı olduğu asanlıqla başa düşülür: bankların 12%-i böyük verilənləri təhlil edir, 25% bank bunu emal edərək artım templərini artırır, 38% bank müxtəlif yollarla genişlənir və 25% bank bizə ondan müxtəlif yollarla necə istifadə edə biləcəyimizə dair çoxlu təcrübələr verir (Gupta, Agrawal, Kansal 2019).

Böyük veri analitikası bankçılıq sektorunda təhlükəsizlik, müştəri təhlili və qərarvermə proseslərini əhəmiyyətli dərəcədə gücləndirir. Texnoloji inkişaflar fırıldaqçılıq risklərini artırsa da, analitika bu risklərin vaxtında aşkarlanmasına və qarşısının alınmasına imkan yaradır. Müştəri qazanımı və onların saxlanılması sahəsində də analitika önəmlidir. Banklar, fərdi davranışları və alış-veriş vərdişlərini izləyərək daha səmərəli və fərdiləşdirilmiş xidmətlər təqdim edə bilir. Bu, həm də müştəri məmnuniyyətini və loyallığını artırmaqda kömək edir. Çarpaz satış imkanlarının müəyyənləşdirilməsi, borc yığımının təkmilləşdirilməsi və nağd vəsaitin planlanması kimi sahələrdə də böyük veridən istifadə bankların əməliyyat effektivliyini yüksəldir. Marketinq kampaniyalarının daha düzgün hədəflənməsi və müştəri ilə əlaqənin davamlı izlənməsi isə daha strateji yanaşma imkanı yaradır. Nəhayət, müştəri dəyərinin qiymətləndirilməsi və geri bildirimlərin analizi banklara daha dərin anlayış qazandırır, uzunmüddətli münasibətlərin qorunmasına və təkmilləşdirilməsinə şərait yaradır (Gupta, Agrashal, Kansal, 2019).

Problemli kreditlərin öncədən aşkarlanması, kredit portfelinin keyfiyyətinin artırılması və bank aktivlərinin daha effektiv idarə olunması üçün banklar müştərilərin maliyyə tarixçəsi, davranış modelləri və sosial media məlumatları kimi fərqli veriləri təhlil edərək müştərilərin kredit qabiliyyətini daha dəqiq qiymətləndirə bilir. Böyük verilər həmçinin, bazar məlumatları və iqtisadi indikatorları analiz edərək investisiya portfelinin daha optimal qurulmasına şərait yaradaraq investisiya qərarlarında da aktiv istifadə olunur. Bundan başqa banklar likvidlik çatışmazlığı risklərini azaltmaqla müştərilərin depozit davranışları və əməliyyatları haqqında real zamanlı məlumatlar

sayəsində pul axınlarını qabaqcadan planlaşdıra və likvid aktivlərin optimallaşdırılmasını daha effektiv şəkildə həyata keçirə bilir.

Göyal və başqalarının fikrincə, maliyyə xidmətləri şirkətləri müştəri və hesab məlumatlarını əhatə edən böyük verilənlərin düzgün idarə edilməsində həm böyük imkanlarla, həm də əhəmiyyətli risklərlə üzləşirlər. Böyük verilənləri rəqabət məqsədi ilə başa düşmək və istifadə etmək bacarığı biznes və marketinq fəaliyyətlərində böyük verilənlərin əhəmiyyəti və gələcək biznesin davamlılığı ilə bağlıdır (Al-Dmour, Saad, 2021).

## Nəticə

Maliyyə sektorunun transformasiyasına qabaqcıl və innovativ bank texnologiyaları böyük təsir göstərir. Bu texnologiyalar bankların aktiv strukturuna, səmərəliliyinə və idarəetmə proseslərinə mühüm təsir göstərir. Rəqəmsallaşma banklara öz resurslarından daha səmərəli istifadə etməyə və əməliyyatlarını sürətləndirməyə imkan verib. Xüsusilə, mobil bankçılıq, internet bankçılıq, süni intellekt dəstək sistemləri və böyük verilənlərin analitikası kimi texnologiyalar sayəsində bankların aktiv idarə edilməsi daha dinamik və real vaxt rejimində olmuşdur. Bu texnologiyalar bank əməliyyatlarının sürətini artırmaqla yanaşı, həm də müştərilərin davranışlarını daha yaxşı təhlil etməyə, risklərin daha dəqiq qiymətləndirilməsinə və kredit portfelinin daha səmərəli qurulmasına imkan verir. Rəqəmsal bankçılıq həm sadələşdirilmiş əməliyyat proseslərinə, həm də resursdan istifadənin optimallaşdırılmasına malikdir. Bu, banklara likvid aktivlərini daha planlı şəkildə yerləşdirməyə və kredit portfelini daha səmərəli şəkildə şaxələndirməyə imkan verdi. Bundan əlavə, müştəri məlumatlarının rəqəmsal toplanması və təhlili risklərin idarə edilməsini yaxşılaşdırıb və aktivlərin keyfiyyətini artırıb. Ənənəvi bankçılıq blokçeyn texnologiyası sayəsində daha təhlükəsiz, daha şəffaf və izlənilə bilən hala gəlir. Girovlu kreditlər və investisiya portfeli kimi aktivlərin idarə edilməsi dəyişməz və mərkəzləşdirilməmiş uçot strukturu sayəsində daha etibarlı olur. Süni intellekt kreditlərin ayrılmasından tutmuş aktivlərin idarə edilməsinə qədər prosesləri optimallaşdırmaqla aktivlərin qiymətləndirilməsinə ənənəvi yanaşmaları üstələyən avtomatlaşdırılmış qərar sistemləri hazırlayır. Eyni zamanda, böyük verilənlərin analitikası banklara likvidliyin idarə edilməsini daha effektiv aparmağa, daha uyğun kredit portfelləri yaratmağa və müştəri davranışını hərtərəfli təhlil edərək problemli debitor borclarını əvvəlcədən müəyyən etməyə kömək edir. Nəticədə, müasir bank texnologiyalarından istifadə bankların aktivlərinin keyfiyyətini, likvidliyin idarə edilməsini və ümumi maliyyə dayanıqlığını artırır. Bu dəyişiklik həm əməliyyat səmərəliliyi, həm də strateji rəqabət üstünlüyü təmin etdiyi üçün banklar üçün həyati alətə çevrilib.

## Ədəbiyyat

1. Al-Dmour, H., Saad, N., Amin, E.B.(2021). The influence of the practices of big data analytics applications on bank performance: filed study. *VINE Journal of Information and Knowledge Management Systems*, 51(1), pp.119-141.
2. Alam, Y., Azizah, S. N., Caroline. (2025). Digital transformation in banking management: optimizing operational efficiency and enhancing customer experience. *International Journal of Management Science and Information Technology*, 5(1), pp.46-55.
3. Apostolik, R., Donohue, C., Shent, P., Global Association of Risk Professionals. (2009). *Foundations of Banking Risk: An Overview of Banking, Banking Risks, and Risk-Based Banking Regulation.* John Shiley.
4. Choshdhury, T., Karim, R. A., Ashanis, A., Roshnak, A. (2024). Does the size of a bank moderate the relationship between income, asset diversification and bank stability? *International Journal of Finance Studies*, 12(4), p.125.
5. Gupta, T., Gupta, N., Agrawal, A., Kansal, K. (2019). Role of big data analytics in banking. *In Proceedings of the 2019 International Conference on Contemporary Computing and Informatics (IC3I 2019)*. IEEE.
6. Haberly, D., MacDonald-Korth, D., Urban, M., Shójcik, D. (2019). Asset management as a digital platform industry: a global financial network perspective. *Geoforum*, (106), pp.167–181.

7. Harsono, H. (2018). *Bank-based blockchain projects are going to transform the financial services industry.*
8. Hillsberg, A. (2018). *Can blockchain technology impact banking? We analyse this important trend. Retrieved from* https://www.comparethecloud.net/articles/can-blockchain-technology-impact-banking-we-analyse-this-important-trend.
9. Hung, J.L., Shen, J. (2020). Big data analytics for supply chain relationship in banking. *Industrial Marketing Management*, (86), pp.144–153.
10. Laplante, P., Kshetri, N. (2021). Open banking: definition and description. *Computer*, 54(10), pp.122–128.
11. Məmmədov, Z.F. (2013). *Bank fəaliyyətinin əsasları.*
12. Pattam, A. (2024). *Enerative AI playbook — for banking: in capital markets.* Medium.com. https://arunapattam.medium.com/part-7-generative-ai-playbook-for-banking-in-capital-markets-bd7bfb97401b.
13. Premchand, A., Choudhry, A. (2018). Open banking APIs for transformation in banking. *International Conference on Communication, Computing and Internet of Things (IC3IoT)* (pp. 1–6).
14. Smith, G. (2024). *Harnessing AI in loan portfolio management.*Bankdirector.com.
15. Shakeel, H., Sharif, H., Rehman, F., Rasool, B., Mahmood, A., Maqsood, H., Kirn, H., Ali, C. N., Bilal, M. (2023). Machine learning in banking risk management – A brief overview. In *Proceedings of the 2023 4th International Conference on Computing, Mathematics and Engineering Technologies: Sustainable Technologies for Socio-Economic Development (iCoMET 2023)* (pp. 1–5). IEEE.
16. Sri Sulistyashati, U., Munashir. (2024). Decoding Big Data: Mengubah Data Menjadi Keunggulan Kompetitif dalam Pengambilan Keputusan Bisnis. *Jurnal Manajemen Dan Teknologi*, 1(2), pp. 58–71. https://doi.org/10.35870/jmt.v1i2.1114.
17. Takyar, A. (2023). *AI for portfolio management: Overview, benefits, use cases, implementation and ethical considerations*. Leewayhertz.com. https://www.leewayhertz.com/ai-for-portfolio-management/.
18. Özkan, T., İpekten, O.B. (2017). İnternet Bankcılığı Kullanımını Etkileyen Faktörler: Atatürk Üniversitesi Personeli Üzerine Bir Uygulama. *Atatürk Üniversitesi Sosyal Bilimler Enstitüsü Dergisi*, s.1-18.
19. Yoganandham, G. (2024). Transformative Impact: The Role of Modern and Innovative Banking Technologies in Driving Global Economic Growth. *Journal of Propulsion Technology*, 45(1).
20. Zachariadis, M., Ozcan, P. (2017). The API economy and digital transformation in financial services: the case of open banking. *(Swift Institute Working Paper, № 2016-001)*. SWIFT Institute.

Daxil oldu: 28.01.2025
Qəbul edildi: 07.05.2025

Bu kontekstdə Gürcüstan öz təhlükəsizlik siyasətini iki əsas istiqamətdə balanslaşdırmaq zərurəti ilə üz-üzə qalmışdır: bir tərəfdən, Avropa və NATO kimi Qərb strukturlarına inteqrasiyanı davam etdirmək arzusu, digər tərəfdən isə Türkiyə və Rusiya kimi əsas regional aktorlarla praqmatik və sabit münasibətlər qurmaq ehtiyacı. Bu ikili yanaşma Gürcüstanın regional sabitlik və milli təhlükəsizlik baxımından çevik və çoxvektorlu diplomatiyaya üstünlük verdiyini göstərir.

Digər tərəfdən, müharibə regiondakı güc mərkəzlərini yenidən formalaşdırmağa xidmət etmiş və xüsusilə, Türkiyə-Azərbaycan münasibətlərini strateji tərəfdaşlıq səviyyəsinə yüksəltmişdir. Ankara ilə Bakı arasındakı bu yaxınlaşma, ortaq tarixi, mədəni və siyasi maraqlara əsaslanmaqla yanaşı, regionda yeni təhlükəsizlik və iqtisadi ittifaqların təməlini qoymuşdur. Gürcüstan üçün bu dəyişən konfiqurasiya həm risklər, həm də strateji fürsətlər yaradır. Ölkə öz təhlükəsizlik strategiyasını qurarkən, qonşu dövlətlər və beynəlxalq güclərlə münasibətlərini balanslaşdıraraq milli maraqlarını qorumağa çalışır.

Müharibədən sonrakı dövrdə Gürcüstan strateji kursuna və beynəlxalq inteqrasiya cəhdlərinə təsir edə biləcək bir sıra mümkün ssenarilərlə qarşılaşır.

Bunlardan biri Rusiyanın bölgədə artan təsiridir. Rusiyanın regiondakı problemlərə yanaşmasında fərqliliklər olsa da, Rusiya kökündən region ölkələrinin Aİ və NATO-ya üzv olmasının qarşısını almaq istəyir, çünki region ölkələrinin Aİ və NATO-ya üzv olması ilə Rusiya mühasirəyə alınacaq və Qərb keçmiş sovet coğrafiyasına doğru bir az da genişlənəcək. Bu vəziyyət Rusiyanın həm təhlükəsizliyinə, həm də siyasi mövqeyinə xələl gətirəcək bir vəziyyətdir və Rusiyanın bunu qəbul etməsi mümkün görünmür (NATO, 2008). Xüsusilə Rusiya sülhməramlı qüvvələrinin Dağlıq Qarabağda mövcudluğu və Moskvanın əsas vasitəçi kimi ön plana çıxması, Gürcüstanın xarici siyasət seçimlərinə təsir etməyə yönəlik təzyiqləri artırır. Bu vəziyyət Tbilisinin NATO və Avropa İttifaqına inteqrasiya prosesini çətinləşdirə bilər. Gürcüstan bu mürəkkəb vəziyyətdə həm öz suverenliyini və ərazi bütövlüyünü qorumağa, həm də Qərb ölkələri ilə əlaqələrini gücləndirməyə yönəlmiş balanslı və çoxşaxəli diplomatik yanaşma ortaya qoymalıdır.

Regional Alyansların möhkəmləndirilməsi: Ankara ilə Bakı arasında dərinləşən strateji tərəfdaşlıq, Cənubi Qafqazda Rusiyanın artan təsirinə qarşı əhəmiyyətli bir tarazlaşdırıcı faktor kimi çıxış edə bilər. Bu dinamika Gürcüstana həm Türkiyə, həm də Azərbaycanla əlaqələrini genişləndirmək üçün yeni imkanlar aça bilər. Belə bir əməkdaşlıq çərçivəsi təhlükəsizlik, enerji logistikası və iqtisadi inteqrasiya sahələrində regional sinerjini artıraraq, Gürcüstanın strateji maraqlarını gücləndirə və regionun sabitliyinə və rifahına töhfə verə bilər.

Qərb Tərəfdaşlığının Genişlənməsi: Cənubi Qafqazda baş verən geosiyasi dəyişikliklər, Avropa İttifaqı və NATO kimi Qərb qurumlarının regiondakı iştirakını artırmasına səbəb ola bilər. Bu artan iştirak, Gürcüstanın transatlantik inteqrasiya yolunu dəstəkləməyə və Rusiyanın təsirini balanslaşdırmağa yönəlib (Politico, 2024).

Davam edən təhlükəsizlik çağırışları: Bütün bu müsbət perspektivlərə baxmayaraq, Gürcüstan regiondakı həll olunmamış ərazi münaqişələri – xüsusilə, Abxaziya və Cənubi Osetiya məsələləri – və ümumi qeyri-sabitlik mühiti ilə üz-üzə qalmaqda davam edir. Bu çətinliklər qarşısında effektiv sərhəd idarəçiliyi, milli müdafiə potensialının artırılması və münaqişələrin diplomatik yollarla tənzimlənməsi kimi qabaqlayıcı siyasətlər xüsusi əhəmiyyət kəsb edir.

Media və siyasi liderlərin dəstəyi ilə Azərbaycanın milli təhlükəsizliyinin təmin edilməsi istiqamətində göstərdiyi səylərə və terrorizmlə mübarizədə beynəlxalq əməkdaşlığın vacibliyinə ictimai dəstək verilib, əməliyyatın beynəlxalq hüquq normalarına uyğunluğu və regional sabitliyə töhfəsi qeyd edilib. Qarabağda konstitusiya quruluşunun bərqərar olmasına yönəlmiş əməliyyatlar hərbi cinayətkarların cinayət məsuliyyətinə cəlb edilməsi və ədalətin təmin olunması baxımından mühüm nəticələr verib. Bu proses Azərbaycanın milli təhlükəsizliyini qorumaq üçün qanuni təhlükəsizlik tədbiri kimi qiymətləndirilir (Serin, 2023). Bu baxımdan Azərbaycanın qələbəsi ilə başa çatan İkinci Qarabağ Müharibəsindən sonra Cənubi Qafqazın təhlükəsizlik arxitekturasında ciddi dəyişikliklərə səbəb oldu və bu transformasiya Gürcüstan üçün Avropa və NATO istiqamətində irəliləmədə həm yeni imkanlar, həm də əhəmiyyətli çağırışlar doğurdu. Belə mürəkkəb və sürətlə dəyişən geosiyasi şəraitdə Gürcüstanın uğurlu naviqasiyası üçün balanslı strateji yanaşma tələb olunur — bu yanaşma regional müttəfiqlik potensialından faydalanmağı və beynəlxalq aktorlarla təhlükəsizlik və sabitlik yönündə effektiv əməkdaşlıq qurmağı əhatə etməlidir. Mövcud

dəyişkənliklər göstərir ki, ölkənin xarici siyasətində məqsədlərinə çatmaq üçün diplomatik çeviklik, uyğunlaşma bacarığı və çoxşaxəli tərəfdaşlıq əsas rol oynayır.

Geosiyasi keçid dövründə Gürcüstanın Avro-Atlantik yönəlişi: Çağırışlar və potensiallar. Gürcüstanın Avropa və NATO ilə inteqrasiya cəhdlərini təhlil edərkən aydın olur ki, bu yol həm mürəkkəb təhlükəsizlik və siyasi çağırışlarla, həm də əhəmiyyətli transformasiya potensialı ilə müşayiət olunur. 2020-ci ildə baş vermiş İkinci Qarabağ Müharibəsi regiondakı geosiyasi tarazlığı kəskin şəkildə dəyişmiş və Gürcüstanın strateji prioritetlərinə birbaşa təsir göstərmişdir. Bu araşdırma, Gürcüstanın inteqrasiya prosesi çərçivəsində üzləşdiyi çoxşaxəli problemləri və imkanları araşdırmağı hədəfləyir. Bu zaman daxili siyasi proseslərin mürəkkəbliyi, xarici siyasət dilemması və iqtisadi inteqrasiyanın qarşısında duran maneələr kimi amillər xüsusi diqqət mərkəzinə alınır.

Gürcüstanın Avropa İttifaqı (Aİ) və Şimali Atlantika Müqaviləsi Təşkilatına (NATO) üzv olmaq arzusu, tarixi münaqişələrin və geosiyasi qeyri-sabitliyin səciyyələndirdiyi Cənubi Qafqaz kontekstində regional təhlükəsizlik arxitekturasına ciddi təsir göstərir. Gürcüstanın NATO və Aİ-yə üzvlük istəyi sadəcə simvolik xarakter daşımır, o, demokratik trayektoriyasını və milli suverenliyini təmin etmək üçün Qərb institutları ilə birləşmək üçün strateji seçimi əks etdirir (Shiraliyev, Hasanoğlu, 2024).

Bu qərar təkcə simvolik əhəmiyyət daşımır, eyni zamanda, İkinci Qarabağ Müharibəsinin yaratdığı yeni geosiyasi reallıqlar fonunda daha sıx regional əməkdaşlıq və dərinləşən inteqrasiya təşəbbüsləri üçün stimul rolunu oynayır.

Avropa İttifaqının Şərq tərəfdaşlığı siyasəti Gürcüstan kimi ölkələrlə münasibətləri dərinləşdirməyə yönəlib (Yüksel, Yüce, 2022). Gürcüstanın NATO-ya üzv olmaq istiqamətində atdığı ardıcıl və fəal addımlar, onun Qərb institutlarına inteqrasiya etmə niyyətini açıq şəkildə ortaya qoyur. Bu proses, həm Avropa İttifaqı (Aİ), həm də NATO daxilində əsas tərəfdaşların diqqətini cəlb etmiş və onların dəstəyi ilə müşayiət olunmuşdur. Gürcüstanın bu strategiyası yalnız onun milli təhlükəsizlik və siyasi maraqları baxımından deyil, həm də Cənubi Qafqazda ümumi sabitliyin və qarşılıqlı əməkdaşlığın möhkəmləndirilməsi kontekstində strateji əhəmiyyət daşıyır.

Avropa, Yaxın Şərq və Mərkəzi Asiya kimi mühüm geosiyasi regionların kəsişməsində yerləşən Gürcüstanın coğrafi mövqeyi, onun Aİ və NATO ilə dərinləşən münasibətlərinin regional təhlükəsizlik düzəninə təsirini daha da artırır Bu inteqrasiya səyləri, regionun daha geniş geosiyasi arxitekturasında Gürcüstanın rolunu müəyyən edən əsas amillərdən biri halına gəlmişdir.

Bununla belə, Gürcüstanın Avro-Atlantik məkanla yaxınlaşma cəhdləri onun daxili siyasi mühiti ilə sıx şəkildə bağlıdır. Demokratiyanın möhkəmləndirilməsi, qanunun aliliyi və insan hüquqlarının qorunması kimi sahələrdə aparılan islahatlar, beynəlxalq ictimaiyyətin diqqət mərkəzində qalır. Lakin siyasi qütbləşmə, məhkəmə sisteminin müstəqilliyi ilə bağlı narahatlıqlar və mətbuat azadlığı sahəsindəki problemlər Gürcüstanın imicinə mənfi təsir göstərir. Müxalif siyasətçilərin mübahisəli şəkildə həbsi və hakimiyyətin dövlət təyinatlarında sərhədləri aşması ilə bağlı ittihamlar Brüssel və NATO üzvü olan ölkələrdə ciddi narahatlıq doğurmuşdur.

Bu daxili çətinliklər təkcə Gürcüstanın demokratik imicinə xələl gətirmir, eyni zamanda onun Avropa və NATO ilə tamhüquqlu inteqrasiya perspektivlərini də zəiflədir. Aydındır ki, bu problemlərin aradan qaldırılması təkcə Gürcüstan üçün deyil, bütövlükdə Cənubi Qafqaz regionu üçün də sabitlik və inkişaf baxımından fundamental əhəmiyyət daşıyır. Gürcüstanda hüquqi dövlət və demokratik institutların gücləndirilməsi, qonşu ölkələr üçün də Avropa dəyərlərinin praktik üstünlüklərini nümayiş etdirən nümunə rolunu oynaya bilər.

Gürcüstanın xarici siyasətində qarşılaşdığı çətinliklər onun Rusiya ilə münasibətləri və ümumilikdə regional təhlükəsizlik konfiqurasiyası ilə sıx şəkildə bağlıdır. 2008-ci ildə baş vermiş Rusiya-Gürcüstan müharibəsindən sonra Moskvanın Abxaziya və Cənubi Osetiyanı müstəqil dövlətlər kimi tanıması bu regionlarda uzunmüddətli münaqişələrin dərinləşməsinə səbəb olmuşdur. Bu həll olunmamış ərazi məsələləri Gürcüstanın NATO-ya üzvlük prosesində ciddi maneə olaraq qalır. NATO-nun öz üzvləri üçün tələb etdiyi ərazi bütövlüyü prinsipi, Rusiya təsirində olan separatçı bölgələrin varlığı fonunda mürəkkəb geosiyasi ikiləm yaradır.

Bundan əlavə, 2020-ci ildə baş verən İkinci Qarabağ Müharibəsi regional təhlükəsizlik mühitində yeni balansların yaranmasına səbəb olmuş və Gürcüstanın xarici siyasətində daha ehtiyatlı davranmağa vadar etmişdir. Azərbaycanın regionda artan rolu və Gürcüstanla yaxın qonşuluq münasibətləri, Tbilisinin regional sabitliyin qorunmasında məsuliyyət daşıyan tərəf kimi fəaliyyət

göstərməsini zəruri edir. Gürcüstanın Qərb tərəfdaşları ilə sıx əlaqələr qurmaqla yanaşı, Azərbaycan və Ermənistanla münasibətləri tarazlı şəkildə idarə etmək cəhdləri, Avropa və NATO ilə inteqrasiyanın tələb etdiyi zərif diplomatik manevr bacarığını ön plana çıxarır.

Rusiya ilə davam edən geosiyasi qarşıdurmaların fonunda, Gürcüstan üçün həm Avropa İttifaqının siyasətlərinə uyğunlaşmaq, həm də NATO standartlarına cavab vermək xüsusi çətinliklər doğurur. Aİ qaydalarının tətbiqi və normativ çərçivələrin qəbul edilməsi genişmiqyaslı institusional islahatları və mühüm maliyyə sərmayələrini tələb edir ki, bu da Gürcüstanın mövcud resurslarını ciddi şəkildə sınağa çəkir. Avropa İttifaqının demokratiya, şəffaf idarəçilik və iqtisadi sabitlik sahələrindəki yüksək meyarları, Gürcüstanın bu istiqamətdə irəliləməsini dayanıqlı səylərlə müşayiət olunmağı zəruri edir və ölkənin xarici siyasətində uzunmüddətli və koordinasiyalı yanaşma tələb edir.

Gürcüstanın Avropa və NATO ilə inteqrasiya prosesində iqtisadi inkişaf və dərinləşmiş iqtisadi əməkdaşlıq həyati əhəmiyyət daşıyır. Bununla belə, ölkə xarici investisiyalardan yüksək dərəcədə asılılıq, ixrac strukturunun məhdudluğu və infrastrukturun genişlənməsinə ehtiyac kimi ciddi iqtisadi problemlərlə üzləşməkdədir. Gürcüstan iqtisadiyyatı müəyyən inkişaf göstəricilərinə malik olsa da, Avropa İttifaqının iqtisadi standartlarına cavab verə bilmək və NATO-ya üzvlük çərçivəsində tələb olunan müdafiə büdcəsini təmin etmək üçün daha davamlı və strukturlaşmış iqtisadi inkişafa ehtiyac duyur.

Bu çətinliklərin bariz nümunələrindən biri enerji sektorudur. Gürcüstanın Avropa ilə Asiya arasında enerji tranzit mərkəzinə çevrilmək arzusu onu strateji aktora çevirsə də, enerji idxalına davam edən asılılıq və enerji infrastrukturu sahəsindəki çatışmazlıqlar bu ambisiyanın reallaşması qarşısında əngəl yaradır. Bu səbəbdən, iqtisadi dayanıqlığın gücləndirilməsi, texnoloji yeniliklərin stimullaşdırılması və ümumi rəqabət qabiliyyətinin artırılması Gürcüstanın Avro-Atlantik məkanla inteqrasiyasının uğurlu nəticələr verməsi üçün zəruri şərtlərdir.

Azərbaycan baxımından isə Gürcüstanın iqtisadi cəhətdən güclənməsi təkcə regional sabitliyin təmin olunması üçün deyil, həm də ikitərəfli ticarət əlaqələrinin genişləndirilməsi, enerji sahəsində ortaq layihələrin inkişafı və infrastruktur əməkdaşlığının gücləndirilməsi üçün böyük əhəmiyyət kəsb edir. Gürcüstanın iqtisadi sahədə çətinlikləri dəf etməsi, Cənubi Qafqazda rifah və sabitliyin yeni mərhələsinin başlanğıcına çevrilə və bu region üçün inteqrasiyayönümlü model rolunu oynaya bilər.

Ümumilikdə, Gürcüstanın Avropa və NATO-ya inteqrasiya yolu çoxsaylı daxili, xarici və iqtisadi çətinliklərlə müşayiət olunsa da, bu maneələr eyni zamanda genişmiqyaslı islahatlar aparmaq və yeni strateji tərəfdaşlıqlar qurmaq üçün mühüm imkanlar da təqdim edir. Azərbaycan üçün Gürcüstanın bu yolçuluğu sadəcə qonşu ölkənin inkişaf istiqaməti deyil, həm də bütövlükdə regionda sülh, əməkdaşlıq və tərəqqiyə doğru yeni bir mərhələnin xəbərçisi ola bilər. Bu kontekstdə Gürcüstanın regional həmrəyliyi gücləndirmək və Avro-Atlantik strukturlara inteqrasiyanı reallaşdırmaq üçün mövcud geosiyasi imkanlardan strateji şəkildə yararlanması zəruridir.

Gürcüstanın strateji seçimləri. Gürcüstanın Avropa İttifaqı (Aİ) və Şimali Atlantika Müqaviləsi Təşkilatı (NATO) kimi qərb institutlarına inteqrasiya etmə arzusu onun geosiyasi yerləşməsi və son dövrlərdə baş verən mühüm hadisələr fonunda formalaşmışdır. Soyuq müharibənin başa çatması və Sovet İttifaqının dağılması, demokratik dəyərlərə, hüququn aliliyinə və bazar iqtisadiyyatına yönəlmiş islahatlara meyilli olan Gürcüstan üçün yeni bir siyasi və iqtisadi yol açmışdır.

2020-ci ildə baş verən İkinci Qarabağ Müharibəsi Gürcüstanı birbaşa əhatə etməsə də, Cənubi Qafqazda geosiyasi balansların dəyişməsinə və nəticə etibarilə Tbilisinin strateji istiqamətlərini yenidən nəzərdən keçirməsinə səbəb olmuşdur. Münaqişə bölgədəki sabitliyin nə qədər kövrək olduğunu və müxtəlif güc mərkəzlərinin təsir dairələrinin bir-biri ilə toqquşduğu mürəkkəb ittifaqlar sistemini bir daha nümayiş etdirdi. Tarix boyu regional güclər arasında strateji rəqabətə səhnə olmuş Gürcüstan, hazırda da bu güclərin təsiri altında öz yolunu müəyyənləşdirməyə çalışır. Gürcüstanın siyasi transformasiyası Qərbə inteqrasiya prosesində mühüm rol oynayıb.

Bu mənzərə Gürcüstan üçün eyni anda həm təhlükə, həm də fürsətləri ortaya çıxarır. Ölkə bir tərəfdən Avro-Atlantik strukturlarla daha sıx əlaqələr qurmaq istəyir, digər tərəfdən isə xüsusilə, 2008-ci ildə Cənubi Osetiya və Abxaziya üzərində baş vermiş münaqişədən sonra Rusiya ilə münasibətlərdə balansı qorumağa çalışır. Belə bir kontekstdə Gürcüstanın strateji seçimləri, Qərbə inteqrasiyanın dərinləşdirilməsi ilə regionda mövcud güc balansı arasında incə tarazlığı qorumaq kimi mürəkkəb diplomatik çağırışlarla müşayiət olunur.

Gürcüstanın son onillikdə davamlı şəkildə irəlilədiyi əsas strateji istiqamətlərdən biri Avropa İttifaqı və NATO ilə tamhüquqlu inteqrasiya olmaqda davam edir. Bu yol təkcə siyasi elitanın deyil, həm də cəmiyyətin geniş təbəqələrinin dəstəklədiyi bir prioritet kimi çıxış edir; çünki bu qurumlara üzvlük Gürcüstan üçün təhlükəsizlik, sabitlik və rifahın təminat yolu kimi qəbul edilir. Bu inteqrasiya sadəcə xarici siyasətin bir elementi deyil, eyni zamanda milli təhlükəsizlik strategiyasının mərkəzində duran fundamental istiqamətdir.

Bununla belə, Qərbə yönəlmiş bu kursun bəzi ciddi geosiyasi nəticələri də mövcuddur. Xüsusilə NATO ilə yaxınlaşma cəhdləri, Alyansın şərqə doğru genişlənməsini öz maraqlarına təhdid kimi dəyərləndirən Moskva ilə münasibətləri gərginləşdirmişdir. Belə bir vəziyyətdə Gürcüstan alternativ strateji tərəfdaşlıqlara yönəlməyə məcbur qalmışdır. Türkiyə və Azərbaycan ilə inkişaf edən ikitərəfli əməkdaşlıq həm iqtisadi faydalar, həm də müəyyən səviyyədə təhlükəsizlik dəstəyi vəd etsə də, bu münasibətlər də öz daxilində müəyyən mürəkkəbliklər və həssaslıqlar daşıyır.

Eyni zamanda, Gürcüstan regionda formalaşmış geosiyasi rəqabət dinamikasına birbaşa cəlb olunmamaq üçün balanslaşdırıcı mövqe tutmağa çalışır. Bu yanaşma bir tərəfdən Qərbə inteqrasiyanı davam etdirmək, digər tərəfdən isə Rusiya və digər regional güclərlə konstruktiv münasibətləri qorumaq məqsədi güdür. Bu zərif balans aktı, Gürcüstanın suverenliyini və ərazi bütövlüyünü qoruyarkən düşmənçilik ritorikasından uzaq durmaq strategiyasına əsaslanır və yüksək diplomatik çeviklik tələb edir.

Gürcüstanın təhlükəsizlik və müdafiə strategiyalarında baş verən dəyişikliklər, ölkənin daha geniş xarici siyasət vizyonunun ayrılmaz tərkib hissəsidir. 2008-ci il Rusiya-Gürcüstan müharibəsindən sonra Tbilisi hərbi və təhlükəsizlik sahəsində ciddi islahatlara başlamış və NATO ilə uyğunluğu artırmaq məqsədilə müdafiə sistemini standartlaşdırmağa çalışmışdır. Bu səylər təkcə simvolik xarakter daşımır, həm də Gürcüstanın kollektiv təhlükəsizlik prinsiplərinə sadiqliyini, Alyansla qarşılıqlı fəaliyyət qabiliyyətini və milli müdafiə potensialını real şəkildə gücləndirməyi hədəfləyən praktik yanaşmadır.

Gürcüstanın NATO-nun rəhbərlik etdiyi beynəlxalq missiyalarda, xüsusən də Əfqanıstanda həyata keçirdiyi əməliyyatlara göstərdiyi aktiv dəstək, onun Alyansın fundamental prinsiplərinə sadiqliyini və təhlükəsizlik sahəsindəki beynəlxalq öhdəliklərini yerinə yetirməyə hazırlığını nümayiş etdirir. Bununla yanaşı, bu təşəbbüslər Gürcüstanın NATO ilə əməkdaşlığa verdiyi önəmi və kollektiv müdafiə mexanizmlərinə daxil olma istəklərindəki həssas mövqeyini də ortaya qoyur. Keçmiş müdafiə naziri Tinatin Xidaşelinin sözləri ilə desək, Gürcüstanın bu dəstəyi, həm qlobal təhlükəsizlik öhdəliklərinə sədaqətinin, həm də alyansa tam üzv olmaq ümidlərinin ifadəsidir.

Bununla belə, Gürcüstan üçün NATO üzvlüyünə gedən yol hələ də ciddi maneələrlə müşayiət olunur. NATO-nun "açıq qapı" siyasətinə baxmayaraq, Gürcüstanın Abxaziya və Cənubi Osetiya ilə bağlı davam edən ərazi münaqişələri bu prosesin önündə ciddi strateji baryer olaraq qalır. Bu separatçı bölgələrin Rusiyanın hərbi-siyasi dəstəyi ilə mövcudluğunu davam etdirməsi, Gürcüstanın suverenliyi ilə yanaşı, onun Alyansa qəbul edilmə ehtimallarını da şübhə altına alır. NATO isə belə mübahisəli ərazilərə malik dövlətləri qəbul etməkdə ehtiyatlı yanaşmaqda davam edir. Bu çətin geosiyasi reallıqlar fonunda Gürcüstan təhlükəsizlik siyasətinə daha çevik və kompleks yanaşma tətbiq edir. Hərbi sahədə NATO ilə uyğunlaşma və modernləşmə addımları ilə yanaşı, daxili islahatlar və beynəlxalq əməkdaşlıq vasitəsilə ümumi müdafiə dayanıqlığını artırmağa yönəlmiş tədbirlər həyata keçirir. Bu yanaşma kibertəhlükəsizliyin gücləndirilməsi, korrupsiyaya qarşı məhkəmə və idarəetmə sistemlərində islahatlar aparılması, və iqtisadi sabitliyin təmin olunması üçün infrastruktur və sosial inkişaf sahələrinə yatırımların artırılması kimi elementləri əhatə edir. Gürcüstanın təhlükəsizlik anlayışı artıq yalnız hərbi müdafiə ilə məhdudlaşmır; o, eyni zamanda demokratik idarəçilik, iqtisadi dirçəliş və cəmiyyətin daxili harmoniyası ilə tamamlanan bir yanaşmaya çevrilmişdir.

Bundan başqa, Gürcüstanın regional diplomatik fəallığı və çoxtərəfli əməkdaşlıq təşəbbüsləri də onun Avropa İttifaqı və NATO ilə inteqrasiyasını tamamlayan mühüm sütunlardan biridir. Gürcüstan regionda sülh və sabitlik təşəbbüslərində fəal iştirak etməklə Cənubi Qafqazda iqtisadi tərəqqi və təhlükəsizlik mühitinin formalaşmasına töhfə verir. Ölkənin milli maraqları və strateji hədəfləri regionun ümumi geosiyasi sabitliyi ilə sıx şəkildə bağlı olduğundan, bu inteqrasiya yalnız Gürcüstanın deyil, bütövlükdə bölgənin gələcəyinə yönəlmiş bir vizyonun tərkib hissəsidir.

Gürcüstanın regional diplomatiyasının əsas dayaqlarından biri onun Avropa İttifaqı ilə münasibətlərində mühüm yer tutan Şərq tərəfdaşlığı təşəbbüsündə iştirakıdır. Bu proqram, Aİ ilə yanaşı altı Şərqi Avropa ölkəsinin iştirakı ilə demokratiyanın möhkəmləndirilməsi, rifahın artırılması, sabitliyin təmin olunması və qarşılıqlı əməkdaşlığın dərinləşdirilməsi məqsədi daşıyır. Şərq tərəfdaşlığı çərçivəsində Gürcüstan yalnız Aİ ilə siyasi və iqtisadi inteqrasiyasını dərinləşdirməyə çalışmır, həm də bu platforma vasitəsilə regional əməkdaşlığı və əlaqələndirməni gücləndirməyə yönəlmiş təşəbbüslərə töhfə verir.

Bununla yanaşı, Gürcüstanın regional fəallığı sadəcə bu çərçivə ilə məhdudlaşmır. Ölkə özünü Cənubi Qafqazda sülhün təşviqi və dialoqun inkişafı üçün mühüm diplomatik oyunçu kimi təqdim etməyə çalışır. Xüsusilə, İkinci Qarabağ Müharibəsindən sonra Tbilisi Azərbaycan və Ermənistan arasında dialoqu asanlaşdırmaq üçün vasitəçilik təşəbbüsləri göstərmiş, neytral danışıqlar platforması rolunu gücləndirməyə cəhd etmişdir. Gürcüstan bu yanaşma ilə regionda sabitliyin və qarşılıqlı anlaşmanın qurulmasında fəal iştirak etmə niyyətini ortaya qoyur.

Gürcüstanın diplomatik təşəbbüsləri yalnız siyasi dialoqla məhdudlaşmır; eyni zamanda regional nəqliyyat və enerji infrastrukturu layihələri ilə dəstəklənir. Bakı–Tbilisi–Qars dəmir yolu xətti və cənub qaz dəhlizi kimi təşəbbüslər, Gürcüstanı regionun əsas nəqliyyat və enerji qovşaqlarından birinə çevirərək, həm iqtisadi əlaqələrin möhkəmlənməsinə, həm də Cənubi Qafqazın Avropa və qlobal bazarlara çıxış imkanlarının genişlənməsinə şərait yaradır. Bu layihələr Gürcüstan üçün həm iqtisadi dividendlər təmin edir, həm də onun regional əməkdaşlıq strategiyasının real göstəricisinə çevrilir.

Gürcüstanın Avropa İttifaqı və NATO ilə inteqrasiya prosesində müəyyənləşdirdiyi strateji prioritetlər və uzunmüddətli baxış, ölkənin bu qurumlarla daha sıx münasibətlərdən əldə edə biləcəyi çoxşaxəli faydaları əks etdirir. Bu yanaşma siyasi islahatlar, iqtisadi modernizasiya, müdafiə sahəsində əməkdaşlıq və sosial transformasiya kimi əsas sahələrə fokuslanaraq, Gürcüstanın Avro-Atlantik məkanla uyğunlaşmasının kompleks xarakterini nümayiş etdirir.

Siyasi müstəvidə Gürcüstan, demokratik institutların möhkəmləndirilməsi və idarəetmə sisteminin Avropa standartlarına uyğunlaşdırılması istiqamətində ardıcıl səylər göstərməkdədir. Bu istiqamətdə qanunun aliliyinin təmin olunması, məhkəmə sisteminin müstəqilliyinin gücləndirilməsi, korrupsiyaya qarşı mübarizə və insan hüquqlarının müdafiəsi əsas prioritetlər kimi müəyyən edilmişdir. Sözügedən islahatlar yalnız Avropa İttifaqı və NATO ilə daha dərin inteqrasiyanın əsas şərtləri deyil, eyni zamanda Gürcüstanın daxili sabitliyi və dayanıqlı inkişafı üçün zəruri bünövrədir. Gürcüstan rəhbərliyi tərəfindən tez-tez vurğulanan "Avropaya və NATO-ya gedən yolun demokratiya, qanunun aliliyi və insan haqlarına hörmətlə döşənməsi" fikri bu siyasi kursun ideoloji dayaq nöqtəsini təşkil edir.

İqtisadi baxımdan isə Gürcüstan, Avropa İttifaqı ilə imzaladığı Dərin və Hərtərəfli Azad Ticarət Sazişi (DCFTA) çərçivəsində Avropa iqtisadi məkanına daha sıx inteqrasiya etməyi qarşısına məqsəd qoymuşdur. Bu əməkdaşlıq sadəcə ticarət dövriyyəsinin və sərmayə axınının artırılması ilə məhdudlaşmır, həm də Avropa İttifaqının texniki, hüquqi və ekoloji standartlarının qəbulunu zəruri edir. Bu uyğunlaşma Gürcüstanın rəqabət qabiliyyətini yüksəltmək, investisiya mühitini cəlbedici etmək və iqtisadi inkişafın davamlılığını təmin etmək baxımından həlledici rol oynayır.

Müdafiə və təhlükəsizlik sahəsində Gürcüstanın əsas məqsədi öz hərbi və müdafiə strukturunu NATO standartlarına yaxınlaşdırmaq, Alyansın təlim və əməliyyatlarında fəal iştirak etməklə qarşılıqlı əməliyyat qabiliyyətini inkişaf etdirməkdir. Bu cəhdlər təkcə texniki uyğunluq deyil, həm də Gürcüstanın NATO-nun kollektiv müdafiə mexanizmlərinə töhfə verməyə hazır və istəkli olduğunu nümayiş etdirən siyasi siqnaldır. Gürcüstan üçün məqsəd yalnız Alyansa üzv olmaq deyil, eyni zamanda dəyərli və funksional bir tərəfdaş kimi çıxış etməkdir.

Sosial səviyyədə isə Gürcüstanın Avro-Atlantik inteqrasiya prosesi cəmiyyətdə Avropa kimliyi və dəyərləri ilə bağlı şüurun möhkəmləndirilməsini də hədəfləyir. Bu məqsədlə həyata keçirilən təhsil proqramları, mədəniyyət mübadiləsi təşəbbüsləri və ictimai diplomatiya fəaliyyətləri geniş auditoriyalara yönəlmişdir. Bu yanaşma Gürcüstan cəmiyyətində Avropa və NATO ilə inteqrasiyanın yalnız siyasi seçim deyil, həm də xalqın istəklərini və kollektiv kimlik hissini əks etdirən dərin dəyər oriyentasiyası olduğunu göstərir.

## Nəticə

İkinci Qarabağ Müharibəsindən sonra Cənubi Qafqaz regionunda baş verən geosiyasi dəyişikliklər, Gürcüstanın Avropa İttifaqı və NATO-ya inteqrasiya prosesinə birbaşa təsir göstərmişdir. Bu müharibə yalnız regional güc balansını yenidən formalaşdırmaqla kifayətlənməmiş, həm də münaqişə riskinin yüksək olduğu bölgələrdə yerləşən kiçik dövlətlər üçün təhlükəsizlik, sabitlik və beynəlxalq müttəfiqliklərin əhəmiyyətini daha da ön plana çıxarmışdır. Bu nəticə bölməsi aparılan təhlillərin yekunlaşdırılmasını təqdim etməklə yanaşı, Gürcüstanın Avro-Atlantik inteqrasiyasına dair gələcək proqnozları da nəzərdən keçirir və siyasət formalaşdırıcılar üçün praktik tövsiyələr irəli sürür.

Tədqiqatın nəticələri göstərir ki, Gürcüstanın Aİ və NATO ilə yaxınlaşma istiqaməti hər nə qədər məqsədyönlü və prinsipial olsa da, mürəkkəb geosiyasi reallıqlarla əhatə olunmuşdur. Əsas çətinliklər Rusiya Federasiyasının regiondakı təsir imkanlarından və Gürcüstanın həm qərblə, həm də qonşu dövlətlərlə münasibətlərini balanslaşdırmaq məcburiyyətindən qaynaqlanır. Eyni zamanda, ölkə daxilində siyasi sabitliyin təmin edilməsi, demokratik institutların gücləndirilməsi və hüququn aliliyi prinsiplərinə sadiqlik də inteqrasiya prosesində həlledici faktorlardandır. Bununla belə, Gürcüstan Aİ ilə Assosiasiya Sazişi imzalamaqla və NATO-nun Sülh naminə Tərəfdaşlıq proqramında fəal iştirak etməklə artıq ciddi irəliləyiş nümayiş etdirmişdir.

Gələcəyə nəzər saldıqda, Gürcüstanın Avropa və transatlantik strukturlara inteqrasiyası həm real potensiala malikdir, həm də davamlı siyasi iradə və çevik diplomatik yanaşma tələb edir. Avropa İttifaqı və NATO-nun Gürcüstanın suverenliyi və ərazi bütövlüyünə verdiyi dəstəyin davam etməsi, bu prosesin legitimliyini və strateji əsaslarını gücləndirir. Bununla belə, dəyişkən regional konfiqurasiya Tbilisinin daha ağıllı və adaptiv yanaşma ortaya qoymasını zəruri edir. Gürcüstan bu yolun uğurlu davamı üçün yalnız geostrateji mövqeyinə deyil, həm də daxili siyasi dialoqun konstruktivliyinə, islahatlara sadiqliyinə və demokratiyanın dərinləşdirilməsinə əsaslanmalıdır. Bu amillər Gürcüstanın Avro-Atlantik məkanla daha sıx və dayanıqlı inteqrasiyasını təmin edə biləcək əsas dayaqlar olacaqdır.

Avro-Atlantik inteqrasiyaya doğru mürəkkəb və çoxşaxəli yolda irəliləmək üçün bu tədqiqat əsasında bir sıra siyasət yönümlü tövsiyələr formalaşdırmaq mümkündür. İlk növbədə, Gürcüstan demokratik islahatlara və regional sabitliyin təmininə sadiqliyini qətiyyətlə nümayiş etdirməli, Avropa İttifaqı və NATO üzvü olan ölkələrlə diplomatik münasibətlərini daha da intensivləşdirməlidir. Bu istiqamətdə təhlükəsizlik, enerji və nəqliyyat infrastrukturu sahələrində əməkdaşlığın dərinləşdirilməsi yalnız ikitərəfli münasibətləri möhkəmləndirməyəcək, eyni zamanda Gürcüstanın strateji əhəmiyyətini artıracaqdır.

Gürcüstan ölkədaxili siyasi sabitliyi gücləndirmək və Avropa normativ sisteminə uyğunlaşmaq üçün qanunun aliliyinin təmin olunması, media azadlığına hörmət və seçki proseslərinin şəffaflığı kimi sahələrdə konkret və ardıcıl islahatlara ehtiyac duyur. Bu sahələrdə atılacaq addımlar, ölkənin Aİ və NATO kimi qurumlarla dəyərlər əsasında yaxınlaşmasını daha inandırıcı edəcək və beynəlxalq etimadı artıracaqdır.

İkinci Qarabağ Müharibəsinin regionda yaratdığı yeni təhlükəsizlik reallıqları nəzərə alınaraq, Gürcüstanın müdafiə qabiliyyətini artırması və hibrid təhlükələrə qarşı dayanıqlılığını gücləndirməsi vacibdir. Bu məqsədlə NATO ilə texniki əməkdaşlıq və təlim proqramları genişləndirilməli, müasir müdafiə mexanizmləri tətbiq olunmalıdır.

Son olaraq, Gürcüstan Cənubi Qafqazda sabitlik və sülhə töhfə verən fəal vasitəçi rolunu davam etdirməlidir. Regionda dialoqu təşviq edən, əməkdaşlığa əsaslanan yanaşma inteqrasiya məqsədləri üçün əlverişli mühitin formalaşmasına yardım edəcək və Gürcüstanın diplomatik nüfuzunu artıracaqdır.

Ümumi nəticə olaraq qeyd etmək olar ki, qarşıda duran çətinliklərə baxmayaraq, Gürcüstanın Avropa İttifaqı və NATO ilə dərinləşən əlaqələri, strateji baxımdan davamlı bir istiqamət kimi formalaşmaqdadır. Diplomatik aktivlik, demokratik islahatlara sadiqlik və regional əməkdaşlıq sahəsində ardıcıl səylər vasitəsilə Gürcüstan nəinki öz vətəndaşlarının təhlükəsizliyini və rifahını təmin edə bilər, həm də beynəlxalq arenada öz mövqeyini əhəmiyyətli şəkildə möhkəmləndirə bilər.

## Ədəbiyyat

1. European Commision. (2023). *EU-Georgia Relations*. https://eeas.europa.eu
2. European Union External Action. (2014). *EU-Georgia Association Agreement. Retrieved from.* https://eeas.europa.eu
3. Ergan, E.E., Doğan, S. (2019). Avrupa Komşuluk Politikası: Avrupa Birliği'nin Doğu Komşularıyla İlişkileri. *Akademik Hassasiyetler*, 6(11), s.161–188. https://dergipark.org.tr/tr/download/article-file/679461
4. Güney Kafkasya'da Değişen Güvenlik Denklemi. *AVİM Analiz* https://avim.org.tr/tr/analiz/guney-kafkasya-da-degısen-guvenlık-denklemı.
5. İnternational Republican İnstitute. (2023). *İRİ Georgia Poll Finds Support for EU Accession High.* https://www.iri.org/news/iri-georgia-poll-finds-support-for-eu-accession-high-weariness-of-russian-presence-lack-of-faith-in-political-parties/
6. Kantarcı, H. (2022). Güney Kaskasya'daki İstikrarsızlığın ve Çatışmaların Bölgenin Güvenliğine Yansımalar. https://dergipark.org.tr/tr/download/article-file/2843254).
7. Karabulut, S.K. (2022). Gürcistan'ın Siyasal Dönüşümü: *Bağımsızlıktan Günümüze.* https://dergipark.org.tr/tr/download/article-file/2720526
8. NATO. (2025). https://www.nato.int/cps/en/natohq/topics_38988.htm
9. NATO. (2008). *NATO-Georgia Commission. Retrieved from.* (https://www.nato.int).
10. Politico. (2024). *US suspends strategic partnership with Georgia after EU membership talks halted.* https://www.politico.com/news/2024/11/30/us-suspends-partnership-georgia-00192044)
11. Serin, A.T. (2023). Rusya'nın Güney Kafkasya Politikası: Bölgesel Çatışma Alanlarında Rus Etkisi. *Selçuk Üniversitesi Sosyal Ve Teknik Araştırmalar Dergisi,* (21), s.13-25.
12. Shiraliyev, M., Hasanoğlu, M. (2024). Güvenlikleştirme teorisi bağlamında İkinci Karabağ Savaşı sonrası Azerbaycan'ın millî güvenlik paradigması. *Güvenlik Bilimleri Dergisi,* 13(2), s.277-300.
13. Yüksel, C., Yüce, H. (2022). Uluslararası Hukuk Açısından Dağlık Karabağ Sorunu ve İkinci Dağlık Karabağ Savaşı'nı Sona Erdiren Ateşkes Andlaşması. *İstanbul Hukuk Mecmuası,* 80 (3), https://doi.org/10.26650/mecmua.2022.80.3.0010.

Daxil oldu: 09.02.2025
Qəbul edildi: 16.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/83-88

**Əli Sultanlı**
Milli Aviasiya Akademiyası
doktorant
https://orcid.org/0009-0004-2426-4526
A.Sultanli@oilfund.az

# Makroiqtisadi siyasətin formalaşması mənbələri və formaları

## Xülasə

Makroiqtisadi siyasət milli iqtisadiyyatın sabitliyini, davamlı inkişafını və sosial rifahını təmin etmək məqsədilə həyata keçirilən hökumət tədbirləri sistemidir. Bu siyasətin formalaşması bir sıra nəzəri yanaşmalara və praktiki reallıqlara əsaslanır. Mənbələr sırasında iqtisadi nəzəriyyələr, beynəlxalq təşkilatların tövsiyələri, dövlətin fiskal və monetar imkanları, sosial-iqtisadi şərait, eləcə də siyasi iradə mühüm yer tutur. Siyasətin formaları isə fiskal siyasət, monetar siyasət, valyuta siyasəti, struktur siyasəti və gəlir siyasətidir. Məqalədə bu mənbələr və formalar təhlil edilir, müxtəlif iqtisadi məktəblərin mövqeyi müqayisə edilir və Azərbaycan kontekstində praktiki tətbiqləri qiymətləndirilir.
***Açar sözlər:*** *makroiqtisadi siyasət, fiskal siyasət, monetar siyasət, iqtisadi sabitlik, inflyasiya, iqtisadi artım*

**Ali Sultanli**
National Aviation Academy
PhD student
https://orcid.org/0009-0004-2426-4526
A.Sultanli@oilfund.a

# Sources and Forms of Macroeconomic Policy Formation

## Abstract

Macroeconomic policy is a system of government measures implemented to ensure the stability, sustainable development, and social welfare of the national economy. The formation of this policy is based on various theoretical approaches and practical realities. Among its sources are economic theories, recommendations from international organizations, the state's fiscal and monetary capacities, the socio-economic environment, and political will. The main forms of macroeconomic policy include fiscal policy, monetary policy, exchange rate policy, structural policy, and income policy. This article analyzes these sources and forms, compares the perspectives of different economic schools, and evaluates their practical application in the context of Azerbaijan.
***Keywords:*** *macroeconomic policy, fiscal policy, monetary policy, economic stability, inflation, economic growth*

## Giriş

Makroiqtisadi siyasət dövlətin iqtisadiyyat üzərində qurduğu strateji nəzarət vasitələrindən biridir. Onun məqsədi iqtisadi artım, məşğulluq səviyyəsinin artırılması, inflyasiyanın nəzarətdə saxlanılması, tədiyyə balansının tarazlaşdırılması və maliyyə dayanıqlığının təmin olunmasıdır. Bu siyasətin uğurla həyata keçirilməsi üçün onun formalaşmasında istifadə olunan nəzəri və praktiki mənbələrin düzgün təhlili və tətbiqi vacibdir. Makroiqtisadi siyasət, ölkə səviyyəsində iqtisadi artımın stimullaşdırılması, inflyasiyanın cilovlanması, işsizliyin azaldılması və ümumi iqtisadi sabitliyin təmin olunması üçün hökumət tərəfindən tətbiq olunan alətlər və yanaşmalar toplusudur.

 

Bu siyasətin formalaşması iqtisadi nəzəriyyələrin, institusional çərçivələrin, tarixi təcrübələrin və beynəlxalq tendensiyaların təsiri ilə həyata keçirilir.

**Tədqiqat**

XX əsrin ortalarından etibarən, Keynesçilik, Monetarizm və daha sonrakı yeni klassik yanaşmalar makroiqtisadi siyasətin formalaşmasına nəzəri baza təmin etmişdir. İqtisadi qərarların verilməsi zamanı maliyyə və pul siyasətləri əsas vasitələr olaraq çıxış edir. Bu siyasətlərin tətbiqində mərkəzi banklar, hökumət qurumları və beynəlxalq təşkilatların rolunun artması, siyasət formalarının dinamik və kontekstual olaraq dəyişməsinə gətirib çıxarmışdır.

I. Makroiqtisadi siyasətin əsas mənbələri:

Makroiqitisadi siyasət həm iqtisadi artımın təşviqinə, həm də inflyasiya, işsizlik, ödəmə balansı kimi makroiqtisadi dəyişkənlərin tənzimlənməsinə yönəlmişdir. Onun formalaşması müxtəlif elmi, praktiki və institusional mənbələrə əsaslanır və müxtəlif formalarda həyata keçirilir. Makroiqtisadi siyasətin formalaşması müxtəlif mənbələrdən qaynaqlanır.

Makroiqtisadi siyasətin əsas mənbələri arasında iqtisadi nəzəriyyələr, beynəlxalq təcrübə, statistika və milli prioritetlər xüsusi yer tutur. Klassik, keynçi və monetar yanaşmalar bu siyasətin əsas nəzəri bazasını təşkil edir. Klassik yanaşma dövlətin iqtisadiyyata müdaxiləsini minimum səviyyədə görürsə, Keyns nəzəriyyəsi aktiv dövlət müdaxiləsini zəruri sayır. Monetaristlər isə pul təklifi və inflyasiyanın idarə olunmasını ön plana çəkirlər. Bu nəzəri əsaslar praktiki olaraq milli iqtisadiyyatlarda istifadə edilən siyasət formalarının seçilməsində mühüm rol oynayır. Praktiki baxımdan, makroiqtisadi siyasətin formalaşmasında statistika orqanlarının verdiyi real vaxt məlumatları və beynəlxalq təşkilatların – MKB, ÜTT və Dünya Bankının tövsiyələri də vacibdir. Həmçinin, ölkələrin sosial-iqtisadi prioritetləri, siyasi sistemin tələbləri və seçici gözləntiləri də bu siyasətin yönünü formalaşdırır.

Keynesçilik iqtisadi tsikllərin idarə olunmasında dövlətin aktiv iştirakını zəruri hesab edir. Keynesin fikrincə, "hökumət, ümumi tələb səviyyəsini tənzimləməklə iqtisadi sabitliyi təmin edə bilər" (Keynes, 1936). Hökumət xərcləri və vergi siyasəti vasitəsilə iqtisadiyyatın stimullaşdırılması və ya cilovlanması həyata keçirilir. Keynesin tövsiyələrinə əsasən, böhran dövrlərində dövlət xərcləri artırılmalı, artım dövrlərində isə azaldılmalıdır. Buna qarşı olaraq, monetaristlər xüsusilə, Milton Friedman pul təklifinin sabit və öncədən müəyyən edilmiş qaydalar çərçivəsində idarə olunmasını təklif etmişdir (Friedman, 1968).

Makroiqtisadi siyasətin forması, ölkənin tarixi təcrübəsi və sosial-iqtisadi quruluşundan asılı olaraq fərqlənə bilər. Məsələn, 2008 maliyyə böhranından sonra Avropa İttifaqında daha sərt büdcə qaydaları qəbul edildi ki, bu da siyasətin "austerity" modelinə yaxınlaşmasına səbəb oldu (Krugman, 2012).

Beynəlxalq Valyuta Fondu (IMF), Dünya Bankı və Dünya Ticarət Təşkilatı kimi qurumlar ölkələrin makroiqtisadi siyasətlərinə təsir göstərməkdədir. Onların tövsiyələri və şərtli kredit proqramları daxili siyasətlərin formalaşmasına birbaşa təsir edir. Mərkəzi banklar, xüsusilə qiymət sabitliyini təmin etməklə, inflyasiya gözləntilərini idarə edən əsas tərəflərdən biridir. Məsələn, Avropa Mərkəzi Bankı və ABŞ Federal Ehtiyat Sistemi siyasət .

Mankiv makroiqtisadiyyatı "iqtisadiyyatda cəmi gəlir, məşğulluq, qiymətlər və iqtisadi artım kimi ümumi səviyyədə dəyişkənlikləri araşdıran elm sahəsi" kimi izah edir. Onun düşüncə tərzinə görə iqtisadi artım uzunmüddətli dövrdə bir ölkənin həyat səviyyəsinin yüksəlməsinin əsas determinantıdır. Sabit makroiqtisadi mühit aşağı inflyasiya, sabit faiz dərəcələri, balanslı büdcə artımı təşviq edir. Mankiv dövlət siyasətinin xüsusən, fiskal və pul siyasətinin – iqtisadi artıma təsirini vurğulayır və qeyd edir ki, düzgün idarə olunan siyasət investisiyaları təşviq edir, bu isə məhsuldarlığın və artımın əsas mənbəyidir (Mankiv, 2019).

Samuelson və Nordhaus klassik və keynçi yanaşmaların iqtisadi siyasətə təsirini müqayisə edərək dövlət müdaxiləsinin zəruriliyini vurğulayır və iqtisadi artımı "əhalinin həyat səviyyəsinin yüksəlməsi üçün əsas şərt" kimi dəyərləndirirlər. Onların fikrincə, iqtisadi artım həm istehsal gücündə, həm də əmək məhsuldarlığında davamlı yüksəlişi tələb edir. Texnoloji irəliləyiş, kapitalın yığımı və insan kapitalının inkişafı iqtisadi artımın əsas mənbələridir. Onlar ictimai sərmayələrin,

yəni təhsil, infrastruktur və tədqiqat xərclərinin uzunmüddətli artım üçün mühüm olduğunu qeyd edirlər (Samuelson, Nordhaus, 2010).

Makroiqtisadi siyasətin əsas formalarına fiskal, monetar, valyuta və xarici ticarət siyasətləri daxildir. Fiskal siyasət dövlətin büdcə gəlirləri və xərcləri vasitəsilə iqtisadi fəaliyyətə təsir göstərir. Monetar siyasət isə əsasən Mərkəzi Bank tərəfindən pul təklifi və faiz dərəcələri üzərindən həyata keçirilir. Valyuta siyasəti milli valyutanın sabitliyinin qorunması və rəqabət qabiliyyətinin təmin edilməsinə yönəlmişdir. Xarici ticarət siyasəti isə idxal-ixrac tarazlığının qorunması və iqtisadi açıq strategiyaların tətbiqinə xidmət edir.

Blanchard makroiqtisadi artımı istehsal potensialının genişlənməsi və iqtisadi dövrlərdən kənarda davamlı inkişaf kimi şərh edir. O, potensial ÜDM və real ÜDM fərqini ön plana çəkir və bu fərqin daraldılması üçün siyasətlərin düzgün yönəldilməsinin vacibliyini vurğulayır. Blanchard qeyd edir ki, makroiqtisadi sabitlik (yəni inflyasiyanın idarə olunması, dövlət borcunun effektiv tənzimlənməsi) artım üçün zəruri şərtdir (Blanchard, 2021).

Əhmədov qeyd edir ki, makroiqtisadi artım təkcə statistik göstərici deyil, həm də ölkənin sosial-iqtisadi inkişafını və siyasi sabitliyini təmin edən əsas amildir. O, keyfiyyətli artım anlayışına önəm verir, yəni yalnız ÜDM-in artması deyil, bu artımın bərabər bölgüsü, ətraf mühitə təsiri, məşğulluğa təsiri də nəzərə alınmalıdır (Əhmədov, 2012).

Yekun olaraq bu müəlliflərin ortaq qənaəti budur ki, iqtisadi artım makroiqtisadi siyasətin həm nəticəsi, həm də hədəfidir. Sabit makroiqtisadi mühitin qurulması artımı təşviq edir, iqtisadi artım isə dövlətə bu sabitliyi qorumaq və inkişaf etdirmək üçün əlavə alətlər təqdim edir.

Pul siyasəti əsasən mərkəzi banklar vasitəsilə həyata keçirilir. Faiz dərəcələrinin tənzimlənməsi, açıq bazar əməliyyatları və ehtiyat normativləri bu siyasətin başlıca alətləridir. Pul siyasəti inflyasiyanın tənzimlənməsi və iqtisadi artımın stabilləşdirilməsi üçün əhəmiyyətlidir. İqtisadi artım mərkəzi bankların faiz siyasətinə birbaşa təsir göstərir:Yüksək artım inflyasiyanı yüksəldə bilər, bu zaman faiz dərəcələri artırıla bilər. Aşağı artım və ya durğunluq şəraitində isə faizlər azaldılır, kreditləşmə təşviq edilir.

Araşdırmalardan bəlli olur ki, uzunmüddətli iqtisadi artımı təmin etmək üçün institusional islahatlar, təhsil, əmək bazarı və texnoloji inkişaf sahəsində tədbirlər bu siyasətin əsasını təşkil edir. İxracat təşviqləri, gömrük tarifləri, valyuta məzənnələrinin idarə olunması ölkənin makroiqtisadi tarazlığına təsir göstərən əsas siyasət vasitələrindəndir. Beləliklə, iqtisadi artım makroiqtisadi siyasətin həm məqsədi, həm də əməliyyatda istiqamətləndiricisi rolunu oynayır. Artımın sürəti, keyfiyyəti və davamlılığı hökumətin tətbiq etdiyi siyasət alətlərinə birbaşa təsir edir. Bu səbəbdən, makroiqtisadi siyasət strategiyaları iqtisadi artım meyllərinə əsaslanaraq çevik və qabaqlayıcı şəkildə qurulmalıdır.

2. Azərbaycanın makroiqtisadi siyasəti: neft gəlirlərinin idarə olunması və fiskal dayanıqlığın təmin olunması

Azərbaycanın makroiqtisadi siyasəti XX əsrin sonlarından etibarən neft sektorundan asılılıq fonunda formalaşmışdır. Neft və qaz sektorundan əldə olunan gəlirlər ölkənin ümumi daxili məhsulunun (ÜDM) və ixracatının əsas hissəsini təşkil etmişdir. Bu səbəbdən Azərbaycan hökumətinin makroiqtisadi siyasəti uzun müddət ərzində neft gəlirlərinin effektiv idarə olunmasına və fiskal sabitliyin qorunmasına yönəlmişdir.

E.Süleymanov Azərbaycan iqtisadiyyatı nümunəsində iqtisadi artımla makroiqtisadi sabitlik arasındakı qarşılıqlı əlaqə təhlil olunur. Onun nəticələrinə görə neft gəlirləri əsasında əldə edilən artım iqtisadi sabitliyi təmin etsə də, uzunmüddətli sabitlik üçün bu gəlirlərin şaxələndirilməsi və qeyri-neft sektorunun inkişafı vacibdir. Artım müvəqqəti xarakter daşıyarsa və struktur islahatları ilə müşayiət olunmazsa, bu zaman inflyasiya təzyiqləri, büdcə asılılığı və iqtisadi dalğalanmalar qaçılmaz olur (Mankiv, 2019).

Neft gəlirlərindən asılı olan ölkələr üçün başlıca makroiqtisadi çağırışlardan biri "resurs lənəti" (resource curse) və Hollandiya xəstəliyidir (Dutch disease). Sachs və Warner bu anlayışı izah edərək qeyd edirlər ki, təbii sərvətlərdən yüksək gəlir əldə edən ölkələrdə digər sektorlarda inkişafın geriləməsi, institusional keyfiyyətin zəifləməsi və iqtisadi sabitliyin pozulması halları müşahidə olunur.

Azərbaycan bu riskləri nəzərə alaraq 1999-cu ildə Azərbaycan Neft Fondunu (ARDNF) təsis etmişdir. Bu fondun əsas məqsədi neft gəlirlərini şəffaf və uzunmüddətli fiskal siyasət çərçivəsində idarə etmək, gələcək nəsillər üçün ehtiyat yaratmaq və iqtisadiyyatın qeyri-neft sektoruna dəstək verməkdir. Əldə olunan təcrübə göstərir ki, bu siyasət müəyyən qədər uğurlu olmuşdur. Alimlərin fikrincə, fiskal siyasət yalnız gəlirləri paylaşmağa deyil, həm də vergi bazasını genişləndirməyə və qeyri-neft sektorunda gəlir əldə etməyə yönəlməlidir. Bununla bağlı Dünya Bankının 2023 hesabatında da vurğulanır ki, Azərbaycanın fiskal dayanıqlığını gücləndirmək üçün dövlət investisiya layihələrinin səmərəliliyinin artırılması, dövlət-özəl tərəfdaşlığı mexanizmlərinin inkişafı və qeyri-neft sektorunun vergitutma bazasının genişləndirilməsi vacibdir.

Aşağıdakı qrafikdə 2010–2022-ci illər ərzində Azərbaycanın neft gəlirləri və dövlət büdcəsinin kəsiri arasındakı əlaqə əks olunmuşdur. Qrafikdən göründüyü kimi, neft gəlirlərindəki kəskin dəyişikliklər büdcə tarazlığına birbaşa təsir edir. Məsələn, 2015–2016-cı illərdə neftin qiymətinin kəskin enməsi nəticəsində dövlət gəlirləri azalmış, bu isə büdcə kəsirinin artmasına səbəb olmuşdur. Bu fakt makroiqtisadi siyasətin davamlılığı üçün fiskal ehtiyatların və diversifikasiya strategiyalarının vacibliyini ön plana çıxarır.




2020-ci ildə COVID-19 pandemiyasının və qlobal enerji bazarındakı dalğalanmaların təsiri ilə həm neft gəlirləri azalmış, həm də büdcə kəsiri daha da dərinləşmişdir. Buna qarşı olaraq, 2022-ci ildə neft qiymətlərindəki artım büdcə balansını nisbətən stabilləşdirmişdir. Bu təhlil Azərbaycanın fiskal siyasətində neft asılılığının ciddi şəkildə nəzərə alınmalı olduğunu və fiskal dayanıqlığın təmin olunması üçün institusional və struktur islahatların davam etdirilməsinin vacibliyini göstərir.

Yuxarıda göstərilənlərdən belə nəticəyə gəlmək olar ki, Azərbaycanın makroiqtisadi siyasətində neft gəlirlərinin səmərəli və uzunmüddətli idarə olunması üçün mühüm addımlar atılsa da, struktur asılılıq hələ də qalmaqdadır. Müstəqil Mərkəzi Bank siyasəti, Neft Fondunun institusional gücü və fiskal qaydaların tətbiqi gələcəyə ümidverici istiqamətlərdir. Azərbaycan Respublikasında makroiqtisadi siyasət neft gəlirlərinin idarə olunması, qeyri-neft sektorunun inkişafı, fiskal dayanıqlığın təmin edilməsi və inflyasiyanın nəzarətdə saxlanması istiqamətində qurulmuşdur. Dövlət Neft Fondu vasitəsilə gəlirlərin sabitləşdirilməsi və gələcək nəsillər üçün ehtiyat toplanması məqsəd qoyulmuşdur.




Qrafik 1-də 2018–2023-cü illər ərzində ümumi daxili məhsul (ÜDM) və qeyri-neft ÜDM artım tempinin illik dəyişimi göstərilmişdir. Qrafikdən görünür ki, 2020-ci ildə həm ÜDM (-4.3%), həm də qeyri-neft ÜDM (-2.7%) azalma müşahidə olunmuşdur. Bu azalma COVID-19 pandemiyası və onun yaratdığı iqtisadi məhdudiyyətlər ilə əlaqəlidir. 2021-ci ildən başlayaraq iqtisadi canlanma baş vermiş, xüsusilə qeyri-neft sektorunda artım tempi 7.2%-ə çatmışdır. Bu müsbət dinamika 2022-ci ildə daha da güclənmiş və qeyri-neft ÜDM-də rekord 9.1% artım qeydə alınmışdır. Bu artım dövlətin qeyri-neft sektoruna yönəltdiyi dəstək tədbirləri, kənd təsərrüfatı, turizm və sənaye sahələrinə qoyulan investisiyalar nəticəsində mümkün olmuşdur. 2023-cü ildə isə artım tempi nisbətən yavaşlayaraq 3.2% (ÜDM) və 5.8% (qeyri-neft ÜDM) olmuşdur. Bu, qlobal iqtisadi qeyri-müəyyənliklərin və enerji qiymətlərindəki dəyişkənliyin təsiri ilə izah oluna bilər.



Qrafik 2-də illik inflyasiya göstəriciləri ilə Mərkəzi Bankın müəyyən etdiyi uçot dərəcəsinin dəyişimi müqayisəli şəkildə təqdim edilmişdir. İnflyasiya göstəriciləri 2021-ci ildən başlayaraq sürətlə artmağa başlamış və 2022-ci ildə 13.9%-ə çatmışdır. Bu yüksəliş dünya üzrə ərzaq və enerji qiymətlərinin artması, tədarük zəncirindəki pozulmalar və regional qeyri-sabitliklə bağlıdır. Uçot dərəcəsi isə 2018-ci ildə 9.75% olduğu halda, 2020-ci ilə qədər ardıcıl azaldılmış və 6.25%-ə qədər enmişdir. Bu dövrdə Mərkəzi Bank iqtisadi fəallığı stimullaşdırmaq məqsədi ilə yumşaq monetar siyasət yürütmüşdür. Lakin inflyasiyanın artması ilə əlaqədar 2022-ci ildən etibarən uçot dərəcəsi yenidən artırılmış və 2023-cü ildə 8.25%-ə çatdırılmışdır. Bu, inflyasiya gözləntilərini idarə etmək və pulun dəyərini qorumaq üçün atılmış addımdır.

Bu qrafiklər göstərir ki, Azərbaycanın monetar siyasəti çevik və vəziyyətə uyğunlaşdırıla bilən şəkildə həyata keçirilir. Mərkəzi Bank inflyasiyanın struktur səbəblərlə deyil, əsasən xarici mənşəli təzyiqlərlə bağlı olduğunu nəzərə alaraq həm faiz siyasətində, həm də pul kütləsinin idarə edilməsində balanslı mövqe nümayiş etdirmişdir.

Eyni zamanda "Azərbaycan 2030" strategiyası çərçivəsində qeyri-neft sektorunun gücləndirilməsi əsas prioritetlərdən biridir. Fikrimcə, bu siyasətlərin effektivliyini təmin etmək üçün aşağıdakı addımların atılması vacibdir:

- Qeyri-neft sektorunun makroiqtisadi siyasətdə payının artırılması;
- ARDNF və dövlət büdcəsi arasında daha şəffaf və məsuliyyətli əlaqənin qurulması;
- Sosial xərclərin nəticəyönlü şəkildə planlaşdırılması;
- Büdcə prosesində ictimai iştirakçılığın və hesabatlılığın gücləndirilməsi.

## Nəticə

Makroiqtisadi siyasət ölkənin iqtisadi həyatının bütün sahələrinə təsir göstərən çoxşaxəli və strateji bir tənzimləmə vasitəsidir. Onun formalaşması üçün həm nəzəri biliklərə, həm də praktiki təhlillərə əsaslanmaq zəruridir. Azərbaycanda aparılan makroiqtisadi siyasət son illərdə qeyri-neft sektorunun inkişafı, büdcə gəlirlərinin diversifikasiyası, inflyasiyanın azaldılması və maliyyə dayanıqlığının təmin olunması istiqamətində uğurlu nəticələr vermişdir. Bununla belə, qeyri-neft sektorunda rəqabət qabiliyyətinin artırılması, innovasiya əsaslı iqtisadiyyatın formalaşması və fiskal intizamın gücləndirilməsi kimi məsələlər növbəti mərhələlərdə diqqət mərkəzində saxlanmalıdır. Beynəlxalq təcrübə göstərir ki, çevik, proaktiv və elmi əsaslara söykənən makroiqtisadi siyasət ölkənin uzunmüddətli iqtisadi rifahı üçün əsas şərtlərdən biridir.

## Ədəbiyyat

1. Blanchard, O., Johnson, D.R. (2017). *Macroeconomics.* Pearson.
2. Beynəlxalq Valyuta Fondu. (2023). *World Economic Outlook Report*.
3. Əhmədov, H. (2012). *Makroiqtisadiyyat: nəzəriyyə və praktika*. ADİU
4. Friedman, M. (1968). The Role of Monetary Policy. *American Economic Review.* 58(1), pp.1–17.
5. Keynes, J.M. (1936). *The General Theory of Employment, Interest and Money.* Macmillan.
6. Krugman, P.  (2012). *End This Depression Now*.
7. Mishkin, F.S. (2019). *The Economics of Money, Banking, and Financial Markets*. Pearson.
8. *Milli İqtisadiyyat və İqtisadiyyatın əsas sektorları üzrə Strateji Yol Xəritəsi*. (2016).
9. Mankiv, N.G. (2019). *Macroeconomics*. Worth.
10. Süleymanov, E.L. (2015). İqtisadi artımın makroiqtisadi sabitliklə əlaqəsi. *Azərbaycan Milli Elmlər Akademiyası İqtisadiyyat İnstitutu Elmi Əsərləri*, 3(1), s. 45–56.
11. https://ru.wikipedia.org/wiki/Qubernator
12. https://tr.wikipedia.org/wiki/Vali

Daxil oldu: 08.02.2025
Qəbul edildi: 16.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/118-121

**Nüşabə İsmayılova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0004-2412-0268
nusaba-331@mail.ru

# Dilçiliyin sosiolinqvistik aspektdə öyrənilməsi

## Xülasə

Sosiolinqvistikanın başlıca problemi "insan və cəmiyyət"dir. Lakin dil strukturunun müxtəlifliyi də daima onun diqqət mərkəzindədir. Sosiodilçilik sayəsində biz dillə cəmiyyət arasında əlaqəni daha geniş öyrənirik. İnsanlar cəmiyyətdə müxtəlif sahələrdə, müxtəlif insanlarla fərqli şəkildə, müxtəlif dildə ünsiyyət qururlar. Məsələn, sözsüz ki, bir rəhbərlə işdə danışdığımız tərzdə dostlarımızla danışmırıq və ya tanımadığımız şəxslə ailə üzvümüz kimi rahat ünsiyyət qurmuruq. Sosiolinqvistik yanaşmada hətta qadın ilə qadının, kişi ilə kişinin və ya əks cinslilərin bir-biri ilə danışığına diqqət yetirsək, tamam fərqli məqamları aşkar edə bilərik

Dilin ictimailiyi onun cəmiyyəti öyrənən elm sahəsi olan sosiologiya ilə bağlılığına dəlalət edir. Çoxmillətli bir cəmiyyəti təsəvvür edək. Burada yalnız dilin cəmiyyətdən asılığı deyil, dillərin qarşılıqlı təsiri və əlaqəsi, hansının daha əsas, digərlərinin asılı vəziyyətdə olması məsələsi də problem olaraq qarşıya çıxır. Bu, dil və cəmiyyət məsələsinin problemlərindən biridir. Dilin çoxcəhətli olması çoxdan hər kəsə məlumdur.

***Açar sözlər:*** *sosiolinqvistika, bilinqvizm, diqlossiya, dil siyasəti*

**Nushaba Ismayilova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0004-2412-0268
nusaba-331@mail.ru

# Studying Linguistics from a Sociolinguistic Aspect

## Abstract

The main problem of sociolinguistics is "man and society". However, the diversity of language structure is always in its focus. Thanks to sociolinguistics, we study the relationship between language and society more broadly. People communicate in different areas of society, with different people, in different languages. For example, of course, we do not talk to our friends the way we talk to a manager at work, or we do not communicate comfortably with a stranger as if we were our family member. In the sociolinguistic approach, if we even pay attention to the way women talk to women, men to men, or people of the opposite sex talk to each other, we can discover completely different points

The sociality of language indicates its connection with sociology, which is a scientific field that studies society. Let's imagine a multinational society. Here, not only the dependence of language on society, but also the mutual influence and relationship of languages, which one is more basic and the others are dependent, are also a problem. This is one of the problems of the issue of language and society. The multifaceted nature of language has long been known to everyone.

***Keywords:*** *sociolinguistics, bilingualism, diglossia, language policy*

## Giriş

Sosiolinqvistikanın ümumi qəbul olunmuş tərifi yoxdur. Sosiolinqvistika anlayışı ilə bağlı dilçilikdə müxtəlif fikir və mülahizələrin olması da göstərir ki, bu anlayışın müəyyən edilməsində fikir ayrılığı mövcuddur.

Adətən, bu elmin tərifini bu cür verirlər: “Sosiologiya və linqvistikanın vəhdətindən yaranan, bütün rəngarəng sosial amillərin dilə və dilin cəmiyyətə təsirini öyrənən elm sosiolinqvistikadır”.

Məlumdur ki, sosiolinqvistika əsas iki elmin: sosiologiya və dilçiliyin qovşağında yaranmışdır. Onun həmhüdud olması əksər alimlər tərəfindən qəbul edilir. Lakin bu, sosiolinqvistikada dilçiliyin və ya sosiologiyanın hansının daha çox olması məsələsini izah etmir. Onunla professional sosioloqlar, ya dilçilər məşğul olurlar. Qeyd etmək lazımdır ki, sosiolinqvistika terminini ilk dəfə işlətmiş alim sosioloq olsa da, müasir sosiolinqvistika dilçiliyin bir sahəsidir. Çünki XX əsrin sonlarına doğru sosiolinqvistikanın obyekti, qarşısında duran məsələlər müəyyənləşir, bu elmin dilyönümlü təbiəti aşkar görünür. Sosiolinqvistlər sosioloqlardan bir sıra metodlar götürüblər. Məsələn, kütləvi müayinə, anket yazmaq, şifahi sorğu, intervyu və s. Lakin sosiolinqvistlər bu metodları dilin öyrənilməsi məsələlərinə tətbiq edərək istifadə edirlər və bu metodların əsasında məhz dil faktları və dil daşıyıcıları ilə iş üçün metodik üsullar hazırlanır. Müxtəlif ölkələrin alimlərin işlədikləri sosiolinqvistik istiqamətlər fərqli metodoloji oriyentasiyası ilə səciyyələnir (Belikov, Krysin, 2001). Sosiolinqvistikanın əcnəbi istiqamətlərindən bəzisi, məsələn, ABŞ-da nitq fəaliyyətinin biheviorist modelinə, sosial təsirin simvolik-interaktiv nəzəriyyəsi, fenomoloji sosiologiyaya yönəlir. Digər ölkələrdə işlənən sosiolinqvistika, hər şeydən əvvəl, tarixi materializm, cəmiyyətin sosial strukturu, sosial sistemlər nəzəriyyəsi, şəxsiyyətin sosiologiyasına və s. əsaslanır.

**Tədqiqat**

Sosiolinqvistlərin diqqəti dilin daxili quruluşuna deyil, onun insanlar tərəfindən necə istifadə olunmasına yönəlmişdir. Bu zaman dilə təsir edən hər bir faktor nəzərə alınır. İki və ya üç dilin işləndiyi cəmiyyətlərdə sosiolinqvistlər bir neçə dilin qarşılıqlı fəaliyyət mexanizmini tədqiq etməlidir. Sosiolinqvistikanın dil icması, dil situasiyası, sosial-kommunikativ sistem, bilinqvizm, diqlossiya, dil siyasəti kimi bir sıra əsas anlayışları vardır. Bundan başqa, bəzi anlayışlar diçiliyin başqa-başqa sahələrindən, dil norması, nitq fəaliyyəti, nitq aktı, dillərin kontaktı, sosiologiyadan isə cəmiyyətin sosial quruluşu, sosial status, sosial faktor və s. alınmışdır.

Sosial-kommunikativ sistem dildə bir-biri ilə funksional tamamlayan kodların cəmidir. Belə ki, ədəbi dilin hər bir üslubi-elmi, rəsmi-işgüzar, publisistik-özünəməxsus funksiyalara malikdir (Krysin, 1989). Bu funksiyalar digər üslublara xas deyil, ancaq bir – birini tamamlayır, cəmiyyətin bütün kommunikativ tələbatlarını ödəyən sistem yaradır. Bu və ya digər dil ittifaqına xidmət edən sosial – kommunikativ sistemin komponentləri bir-biri ilə müəyyən münasibətdədir. Dil ittifaqının mövcudluğunun hər mərhələsində bu münasibətlər bir qədər sabitdir. Ancaq bu, onların dəyişə bilməyəcəkləri anlamına gəlmir. Ölkədə siyasi şəraitin dəyişməsi, dövlət quruluşunun dəyişməsi, iqtisadi dirçəliş və s. sosial-kommunikativ vəziyyətin az və ya çox dərəcədə təsir edə bilər. Dil ittifaqının fəaliyyətinin hər hansı mərhələsindəki sosial-kommunikativ sistemin komponentləri arasındakı funksional münasibətlər dil situasiyasını formalaşdırır. “Dil situasiyası” anlayışı, adətən, böyük ittifaqlara – ölkə və respublikalara tətbiq olunur. Bu anlayış üçün zaman faktoru vacibdir.

Dil situasiyası həyatın, varlığın formasıdır. Ərazi-sosial münasibətlər və funksional əlaqələr; coğrafi-regional, yaxud siyasi-administrativ əlamətlər dil situasiyasının aparıcı əlamətlərindəndir. Hər bi dövlətin özünəməxsus dil situasiyası və dil siyasəti mövcuddur. Dil siyasəti və situasiyasını aydınlaşdırmaq üçün tarixi dövr və mərhələ nəzərdən keçirilməlidir. Məsələn: Sovet dövründə müttəfiq respublikalarda dil siyasəti daha çox xalqlar dostluğu və əməkdaşlığa yönəlmişdi, bu da cəmiyyətin dil situasiyasına müxtəlif üsullarla, vasitələrlə təsir göstərirdi. Sovet hakimiyyətinin süqutundan sonra dil siyasəti müstəqillik uğrunda mübarizənin bir qolunu təşkil etmişdi. Dilin dövlət siyasətinin tərkib hissəsi olduğunu nəzərə alsaq, bunun təbii hal olduğunu qeyd etməliyik. Dil siyasəti cəmiyyətin bütün üzvlərini əhatə etdiyi halda, müvəffəqiyyətli hesab etmək olar.

Sosiolinqvistikanın başlıca problemlərindən olan sosial diferensiasiya dilin bütün səviyyələrində müşahidə olunur. Dilin sosial differensiasiyasının strukturu çoxşaxəlidir və sosial təbəqələnmənin şərtləndirdiyi stratifikativ diferensiasiya, həmçinin sosial şəraitin çoxcəhətliliyinin şərtləndirdiyi situativ diferensiasiyanı əhatə edir. Qeyd etmək lazımdır ki, “dil və millət” məsələsi problemlə sıx əlaqədardır. Müasir sosiolinqvistikada dilin mədəniyyətlə əlaqəsi məsələsinə çox diqqət yetirilir. Dillə mədəniyyətin komponentləri arasındakı əlaqələr ikitərəfli xarakter daşıyır. Müxtəlif

mədəniyyətlərin kəsişməsi prosesi öz əksini leksik alınmalarda tapır (Məmmədov, 2017, Rəcəbov, 1993, Rüstəmov, 2007).

Sosial-kommunikativ sistemi təşkil edən dillər və dialektlər funksional olaraq paylanmışdır. Belə ki, cəmiyyət üzvləri olan insanlar müəyyən kommunikasiya vasitələrinə malik olurlar və bu vasitələrdən ünsiyyətin şərtlərini nəzərə alaraq istifadə edirlər. Yəni ədəbiyyatçılar bədii üsluba, elm adamları elmi üsluba və s. müraciət edirlər. Bundan başqa, çoxmillətli ölkələrdə ikidillilik də mövcuddur. İkidillilik termini dilçilik elmində bilinqvizm termini ilə yanaşı işlənir. Bilinqvizm latın Sosiolinqvistikanın başqa elmlərlə həmhüdud anlayışları 15 mənşəli sözdür, bir ölkədə eyni zamanda iki dildən istifadə edilməsini ifadə edir. İkidilliliyin yaranmasının bəzi səbəbləri:

a) Qarışıq ailələrdə qeyri-millət nümayəndəsi olduğuna görə övladlar iki dildə danışırlar; b) əmək kollektivlərinin milli tərkibinin müxtəlifliyi əsasında ikidillilik meydana çıxır; c) təhsildə, ictimai təşkilatlarda başqa dildən istifadə etməklə bağlı ikidillilik yaranır; d) elmi və mədəni əlaqələr aparılarkən çoxdillilik formalaşır və s. (Vakhtin, Golovko, 2004, s.246).

İkinci dilin mənimsənilməsi halına daha çox məktəbdə əcnəbi dilin öyrənilməsi ilə bağlı rast gəlinir, belə ki, əcnəbi dillər və milli azlıqların dilləri məktəb proqramına daxil olur. Bir çox ölkələrdə insanlar evdə dialekt və ya yerli dildə, rəsmi şəraitdə isə dövlət dilinin ədəbi dil variantında danışırlar. Bu dil situasiyası diqlossiya adlanır. Diqlossiya etnik cəhətdən yaxın olan dillərin paralel işlədilməsidir. Məsələn, almandilli İsveçrədə gündəlik ünsiyyətdə dialekt, məktəbin yuxarı siniflərində, rəsmi ünsiyyətdə və televiziyada alman dili istifadə olunur. Əgər cəmiyyətdə diqlossiya mövcuddursa, əksəriyyət müxtəlif dərəcədə ikidilli olur. Diqlossiya hadisəsi sabit deyil, dillər müxtəlif səviyyələrdə qarışmaq ənənəsinə malikdir və dillər genetik baxımdan nə qədər yaxın olsalar, o qədər tez baş verir. “ Diqlossiya hadisəsinin bir neçə forması meydana gəlmişdir:

1) Bir xalqın tarixən iki ədəbi dildən istifadə etməsi. Yunanıstanda vaxtilə iki ədəbi dil formalaşmışdır. Bunlardan biri yeni eranın əvvəllərində yaranmış yunan ədəbi dilidir... ikincisi isə daha sonralar formalaşmış yeni yunan ədəbi dilidir.

2) Bir neçə xalqın öz ana dili ilə yanaşı, ümumi qohum dildən istifadə etməsi... Bütün ərəb xalqları elm, mədəniyyət, ədəbiyyat, din, təhsil və sair sahələrdə bu ədəbi dildən istifadə edirlər. Lakin bununla bərabər, hər bir ərəb xalqının fərqlənən danışıq dili də mövcuddur.

3) İki müstəqil qohum dildən istifadə olunması... Litva respublikasında yaşayan latışlar ailədə latış dilində, ictimai yerlərdə isə litva dilində danışırlar. Bu qohum dillərin hər ikisi genetik cəhətdən Hind-Avropa dilləri ailəsinin baltik qrupuna daxildir. (Vakhtin, Golovko, 2004, s.249).

Ünsiyyət qurduğumuz şəxsdən asılı olaraq, eyni mövzunu, eyni məsələni fərqli şəkildə ifadə edə bilirik. Bu, eyni şey haqqında müxtəlif cür danışmağa imkan verən ünsiyyət vasitələrinə malik olmaq, dilin variativliyi, dəyişkənliyidir (Vakhtin, Golovko, 2004). Variativlik dilin mühüm xüsusiyyətlərindən biridir və danışana öz fikirlərini həm rahat şəkildə, həm də müxtəlif üsullarla ifadə etməyə imkan verir. Dili hərtərəfli yaxşı bilən insanlar dilin variativliyindən daha yaxşı faydalana bilirlər. Sosiolinqvistika nöqteyi-nəzərindən dilin variativliyi ona görə diqqətəlayiq hadisədir ki, fərqli dil variantları dil daşıyıcılarının sosial fərqləri və nitq ünsiyyətinin fərqli şəraitlərindən asılı olaraq istifadə oluna bilər (Van, Teun, 2008).

XX əsrin yarısında geniş yayılmış sosiolekt termini milli dilin hüdudları çərçivəsində hər hansı bir sosial qrupa məxsus olan dil özəlliklərinin cəmidir (Desheriev, Protchenko, 1972). Bu sosial qrup peşə, sinif, yaş və s. ilə əlaqədar ola bilər. Sosiolektə misal olaraq əsgər və ya məktəbli jarqonunu, hippilərin arqosunu və s. göstərə bilərik. Sosiolektlər kommunikasiyanın bütöv sistemini təşkil etmir. Bu sözlər, söz birləşmələri, sintaktik konstruksiyalar, vurğu şəklində özünü göstərən nitq xüsusiyyətləridir.

Arqo və jarqon sözləri fransız, slenq isə ingilis mənşəlidir. Bu terminlər bəzən sinonim kimi işlənə bilir. Ancaq bu anlayışları dəqiqləşdirmək daha məqsədəuyğun olar. Belə ki, arqo hər hansı bir sosial qrupun öz nitqini digərləri üçün anlaşılmaz etmək üçün istifadə etdiyi gizli dildir (Həsənova, 2017, Kərimov, 2015, Qurbanov, 1993). “Slenq” termini daha çox qərbin linqvistik ənənələri üçün səciyyəvidir. Jarqon terminınə uyğun gəlir. Slenq və jarqon arqo kimi gizli xarakter daşımır. Arqo, jarqon və slenq sosiolektin müxtəlif formalarıdır. Onların hər birinin özəlliyi bu və ya digər qrupun professional xüsusiləşməsi, qalan cəmiyyətdən seçilməsi ola bilər. Kompüter jarqonu professional

şəkildə seçilən dildir, oğru arqosu, tələbə slenqi – sosial baxımdan seçilən subkodlardır. Bəzən qrup həm professional, həm sosial baxımdan seçilə, hər ikisinin xüsusiyyətlərinə malik ola bilir. Buna əsgər jarqonunu misal göstərə bilərik. Belə ki, hərbi iş bir peşədir, bu peşə ilə məşğul olanlar qalan cəmiyyətdən kifayət qədər fərqlənən həyat yaşayırlar.

## Nəticə

Yuxarıda sadalananlardan belə nəticə çıxarmaq olar ki, sosiolinqvistika dilçilik, sosiologiya, sosial psixologiya və etnoqrafiyanın qovuşuğunda meydana çıxmış həmhüdud elm sahəsi olmaqla, dilin sosial təbiəti, ictimai funksiyaları, sosial faktorların dilə təsir mexanizmi, eləcə də dilin cəmiyyət həyatında oynadığı rol kimi problemlər kompleksini öyrənir. Müxtəlif mədəniyyətlərin əlaqəsinin şərtləndirdiyi leksik alınmalar və ümumi dillərin əlaqəsi prosesinin tədqiqinə diqqət ayrılır. Sosiolinqvistikanın problemləri içərisində dövlət, sinif, ictimai qruplaşma tərəfindən dillərin və dil variantlarının mövcud funksional bölgüsünü saxlamaq və ya dəyişmək üçün yenisini gətirmək, yaxud köhnə dil normalarını saxlamaq üçün qəbul edilmiş tədbirlərin cəmi kimi dil siyasəti problemi xüsusi yer tutur.

## Ədəbiyyat

1. Belikov, V.I, Krysin, L.P. (2001). *Sotsiolingvistika: Uchebnik dlya vuzov*.
2. Desheriev, YU.D., Protchenko, I.F. (1972). *Osnovnye aspekty issledovaniya dvuyazychiya i mnogoyazychiya. Problemy dvuyazychiya i mnogoyazychiya*. Nauka.
3. Həsənova, F. (2017). *Dil və sosial struktur: Azərbaycan nümunəsi*.
4. Kərimov, F. (2015). *Diskurs və ideologiya: dilin cəmiyyətdəki rolu.* Gənclik.
5. Krysin, L.P. (1989). *Sotsiolingvisticheskie aspekty izucheniya sovremennogo russkogo yazyka*. Nauka.
6. Qurbanov, A.M. (1993). *Ümumi dilçilik*. (II cild). Maarif.
7. Məmmədov, T. (2017). *Dil və mədəniyyətlərarası əlaqələr: kommunikasiya və sosial struktur*.
8. Rəcəbov, Ə.Ə. (1993). *Dil, şüur, cəmiyyət, tarix*. Azərbaycan Dövlət Nəşriyyatı.
9. Rüstəmov, Y. (2007). *Fəlsəfənin əsasları*. Nurlan.
10. Van, D., Teun A. (2008). *Discourse and Context: A Sociocognitive Approach.*
11. Vakhtin, N.B, Golovko, E.V. (2004). *Sotsiolingvistika i sotsiologiya yazyka: uchebnoe posobie*. Izdatel'skii tsentr.
12. Vikipediya – *svobodnaya ehntsiklopediya*. URL:http://ru.wikipedia.org

Daxil oldu: 31.01.2025
Qəbul edildi: 10.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/122-126

**Rüfət Qədimov**
Azərbaycan İdman Akademiyası
https://orcid.org/0009-0003-1279-2092
rufatqedim@gmail.com

# Fiziki tərbiyənin sağlam həyat tərzinin inkişafına təsiri: elmi-təcrübi yanaşma

## Xülasə

Müasir dövrdə əhalinin sağlam həyat tərzinin formalaşdırılması sosial və ictimai prioritetlər sırasında xüsusi yer tutur. Bu istiqamətdə fiziki tərbiyə mühüm rol oynayır, çünki o yalnız bədən sağlamlığının qorunması deyil, eyni zamanda psixoloji və sosial rifahın təmin olunmasında da təsirlidir. Təqdim olunan elmi-təcrübi araşdırmada fiziki tərbiyənin sağlam həyat tərzinin formalaşmasına olan təsiri müxtəlif aspektlərdən təhlil olunur. Araşdırmanın əsas məqsədi fiziki tərbiyə vasitəsilə fərdlərdə sağlam vərdişlərin aşılanması və bu prosesin effektivliyinin qiymətləndirilməsidir.

Tədqiqat zamanı məktəb və ali təhsil müəssisələrində aparılan praktiki müşahidələr və sorğular əsasında fiziki tərbiyənin fərdlərin həyat tərzinə olan real təsirləri öyrənilmişdir. Nəticələr göstərir ki, müntəzəm fiziki fəaliyyətlə məşğul olan şəxslərdə stress səviyyəsi aşağı olur, immun sistemləri daha güclü olur və sosial adaptasiya qabiliyyəti yüksək səviyyədə inkişaf edir. Eləcə də, fiziki tərbiyənin uşaqlarda və gənclərdə məsuliyyət hissinin, əməksevərlik vərdişlərinin və intizamlı davranışın formalaşmasına müsbət təsiri olduğu müəyyən edilmişdir.

Araşdırma həmçinin fiziki tərbiyənin təkcə idman fəaliyyəti kimi deyil, daha geniş mənada – həyat tərzinin ayrılmaz tərkib hissəsi kimi nəzərdən keçirilməsinin vacibliyini vurğulayır. Elmi-təcrübi nəticələr göstərir ki, fiziki tərbiyə mədəniyyətinin cəmiyyətə sistemli şəkildə aşılanması uzunmüddətli sağlamlıq strategiyalarının mühüm komponentidir.

***Açar sözlər:*** *fiziki tərbiyə, sağlam həyat tərzi, məktəb, rejim qaydaları, gigiyenik qaydalar, qidalanma*

**Rufat Qadimov**
Azerbaijan Sports Academy
https://orcid.org/0009-0003-1279-2092
rufatqedim@gmail.com

# The Impact of Physical Education on the Development of a Healthy Lifestyle: a Scientific-Practical Approach

## Abstract

In modern times, the formation of a healthy lifestyle of the population occupies a special place among social and public priorities. In this direction, physical education plays an important role, since it is effective not only in protecting physical health, but also in ensuring psychological and social well-being. The presented scientific-practical study analyzes the impact of physical education on the formation of a healthy lifestyle from various aspects. The main goal of the study is to instill healthy habits in individuals through physical education and to assess the effectiveness of this process.

During the study, the real effects of physical education on the lifestyle of individuals were studied based on practical observations and surveys conducted in schools and higher education institutions. The results show that people who engage in regular physical activity have lower stress levels, stronger immune systems, and a high level of social adaptation.

It was also determined that physical education has a positive effect on the formation of a sense of responsibility, hardworking habits, and disciplined behavior in children and young people.

The study also emphasizes the importance of considering physical education not only as a sports activity, but in a broader sense - as an integral part of lifestyle. Scientific and empirical results show that systematically instilling a culture of physical education in society is an important component of long-term health strategies.

***Keywords:*** *physical education, healthy lifestyle, school, regimen rules, hygiene rules, nutrition*

## Giriş

Müasir dövrdə sağlam həyat tərzi anlayışı yalnız xəstəliklərin qarşısının alınması ilə məhdudlaşmır, eyni zamanda fərdin ümumi psixofizioloji rifahının və sosial funksionallığının təmin olunması ilə də sıx bağlıdır. Bu baxımdan fiziki tərbiyənin rolu əvəzsizdir. Fiziki tərbiyə təkcə bədənin fiziki inkişafını deyil, həm də şəxsiyyətin psixoloji və mənəvi formalaşmasını təmin edən kompleks bir prosesdir. Məqalənin məqsədi – fiziki tərbiyənin sağlam həyat tərzinin formalaşmasına və inkişafına olan elmi-təcrübi təsirini araşdırmaqdır.

Sağlam həyat tərzinin əsası fərdi və düzgün qurulmuş gün rejimi təşkil edir. Çünki gündəlik düzgün təşkil edilmiş rejim qaydaları, insanın sağlam böyüməsinə, onun zehni, əqli inkişafına, iş rejimi və istirahətin düzgün bolünməsinə, vaxtında qidalanmasına, gündəlik fiziki hazırlıqla məşğul olmasına, gigiyenik qaydalara vaxtında və mütəmadi nəzarətinə və s. zəmin yaradan əsas faktordur. İnsan gündəlik rejim qaydalarına nəzarət etməyi qarşısına məqsəd qoysa, tədricən bu proses vərdiş forması alacaqdır.

Gün rejimi müxtəlif formalarda təşkil edilə bilər. Bunun üçün ilk növbədə insan iş və asudə vaxtları dəqiqləşdirilməlidir. Sonra isə il ərzində gorüləcək vacib işlərin siyahısı və təxmini vaxtları müəyyənləşdirilməlidir. Daha sonra isə aylar və həftələr ərzində vacib işlərin planlaşdırılması həyata keçirilməlidir.

Yuxarıda göstərilən il, ay və həftə ərzində vacib işlər dəqiqləşdiriləndən və təxmini planlaşdırılandan sonra, asanlıqla gün rejimini saatlara bölməklə vacib olan işləri, asudə vaxtlarından səmərəli istifadəni, qidalanma və yuxu rejim qaydalarını və s. nəzarətdə saxalmaq mümkündür.

**Tədqiqat**

Gün rejim qaydalarına ailə tərkibinin birlikdə nəzarət etməsi daha effektiv və asan başa gəlir. Çünki birlikdə gündəlik rejimin yaradılması, ailə üzvülərinin, səhər vaxtında oyanmasını, səhər gigiyenasını – gimnastikasını, qidalanmasını, işə, baxçaya, məktəbə, univerisitetə, işə və s. vaxtında getməsini, və gün ərzində ailənin birlikdə (istisna hallar olmadıqda) nahar və şam etməsini təmin edir. Həmçinin, asudə vaxtlarının da birlikdə maksimum təşkili, gəzintilər, doğmalara baş çəkmək, birlikdə məişət işləri ilə məşğul olmaq planlaşdırıla bilər. Bu formada təşkil olunan gün rejimi ailədə mehribançılıq, birgə fəaliyyət, birlik, gələcək işlərin planlaşdırılmasına yüksək həvəs, çətinliklərin dəf edilməsində casarətin və stimulun maksimum artmasına böyük təkan verir.Əgər biz sağlam həyat tərzi yaşamaq istəyiriksə, ilk növbədə hər bir günümüzü düzgün dəyərləndirməliyik. Bunun üçün biz həftələri günün rejim qaydalarına uyğun olaraq cədvəllərə bölməliyik. Cədvəldə, yuxu saatları, iş vaxtları, qidalanma, fəal istirahət və xüsusi tədbirlərin də daxil edilməsi ilə yaradılmış cədvəl əsasında günün rejim qaydalarını bölməklə vaxtını səmərəli və mənalı keçirmiş olarsınız. Belə olan halda biz həm öz işlərimizi vaxtında yerinə yetirmiş olarıq, həm də öz sağlamlığımızın qeydinə qalarıq. Bu cür həyat tərzi sürən insan istənilən nəaliyyətləri, arzuladığı həyat şəraitini əldə etməklə yanaşı yaşadığı ömrü mənalı sürər (Məcidov, 2016).

Digər tərəfdən gün rejiminin cədvəl formasında bolünməsi bəzi insanlar tərəfindən müsbət qarşılanır və tətbiq edilir. Cədvəldə asan formada davamlı olaraq gündəlik iş və məşğuliyyət rejimini tətbiq etməklə, insanlar öz günlərini faydalı və gələcək karyeraları üçün faydalı formada sərf edə bilərlər.

*Məktəblilər üçün gündəlik rejim qaydaları.* Məktəbli üçün gündəlik rejimin təşkili və rejimin gözlənilməsi həm təhsili, həm də sağlam inkişafı üçün çox vacibdir. Rejim məktəbliyə intizamlı olmağa, diqqətini dərslərində cəmləməyə kömək edir. Mütəxəssislər, xüsusilə də, birinci sinif

şagirdləri üçün rejimin gözlənilməsini məsləhət görürlər (Quliyev, 2002, s.108). Rejimsiz yaşayan məktəblilər əsəbi olur, dərslərində digərlərindən geridə qalırlar. Belə şagirdlər gün ərzində gümrah qala bilmir və tez yorulur və şagirdin xeyri üçün gündəlik rejim tərtib olunmalı və gözlənilməlidir. Məktəblinin sağlamlığı onun necə yatması, qidalanması, hərəkət etməsindən çox asılıdır (Azərbaycan Respublikasının Ümumtəhsil Məktəbləri üçün fiziki tərbiyə fənni üzrə təhsil proqramı, 2013).

Həmçinin, onların fəal istirahətləri valideyin tərəfindən maksimum təmin edilməlidir. Çünki fiziki baxımdan aşağı sinif şagirdlərində əzələlərin və orqanizmin quruluşu son dərəcə zəif formada olur. Bu da onların tez yorulmasına və gələcəkdə qamət əyriliklərinin yaranmasına yol aça bilər.

Onlarda yuxu çatışmazlığı müşahidə edildikdə qanında spesifik hormonların yaranması dayanır, bu da şagirdin zehni və fiziki inkişafında özünü göstərir. Bu səbəbdən də məktəblilərə imtahan vaxtı, çox dərs oxuduqda yuxusunu heç olmasa bir saat artırmaq məsləhət görülür (Bal`sevich, 2006; Minaev, 1989).

Təxminən 2-3 saat yuxudan doymayan uşaqların dərs oxumaq qabiliyyəti yuxudan doyan uşaqlara nisbətən 30 faiz azalır. Uşaq yuxudan tam doysun deyə müəyyən qaydalara riayət olunmalıdır. Bəzən onlar tez yata bilmir. Bu ona görə baş verir ki, şagirdlərdə gecə vaxtı güclü emosiyalar yaranır, həyəcanlı oyun oynayır və ya filmə baxır. Bunun əvəzinə gecə vaxtı onlarda xeyirli vərdişlər formalaşdırmaq lazımdır. Axşam duş qəbul etməli, təmiz havada sakit gəzməli, kitab oxumalı və ya həzin musiqi dinləməlidir.

Şagird dərslərini hazırlaması üçün rahat otağı və ya otaqda bir guşəsi olmalıdır. Yazı stolu elə yerləşdirilməlidir ki, gün işığı yaxşı düşsün. Əgər şagird sağ əllə yazırsa, işıq soldan, sol əllə yazırsa, sağdan düşməlidir. Gün işığının düşmə vaxtı bitdikdə otaq süni işıqla yaxşı işıqlandırılmalıdır. Lakin işıq düz uşağın gözünə düşməməlidir.

Məktəbli üçün çantanın düzgün seçilməsidə önəmlidir. Çantanın enli və uzunluğunu dəyişdirə biləcəyiniz, yumşaq altlıqlı kəmərləri olmalı, bel hissəsinə dirənən yeri düz qalmalı və əyilməməlidir.

Məktəblinin sağlam inkişafı üçün hərəkətli olmasına, təmiz havada vaxt keçirməsinə də xüsusi diqqət vermək lazımdır. Məktəblilər üçün gündəlik rejimin gözlənilməsi qısa müddət ərzində təhsil alma səviyyəsinə, əhvalına və sağlamlığına müsbət təsir edir.

Sağlam həyat tərzinin əsas faktorlardan biri də düzgün və vaxtında qəbul edilən qida rejiminə ciddi riayət etməkdir. Çünki qida orqanizmin inkişafında, böyüməsində, insan ömrünün uzadılmasında, həyati bacarıqların formalaşmasında enerji mənbəyi rolunu oynayır (Aksović, 2021).

*Ekaloji faktorlar*. Ekologiya (latın dilindən tərcümədə: οικος (oykos) - ev, daxma, — ev, təsərrüfat və λόγος (logiya) – elm, öyrənmək) canlı və cansız təbiətin qarşılıqlı münasibətini öyrənən elmdir. İnsanın həyatında və fəaliyyətində təbiətin rolunu qiymətləndirmək olduqca çətindir. Təbiət insanların yaşayış mühiti vəzifəsini görür, onun vəziyyəti cəmiyyətin rifah və inkişaf səviyyəsini təyin edir.

*Təbii faktorlar* – ərazinin iqlim, geoloji və bioloji xüsusiyyətlərinin insana təsirini səciyyələndirir (Åstrand, 1964).

Beləliklə, bəşəriyyətin rifahı, firavanlığı və insanların əsas hüququnu həyata keçirmək (o cümlədən yaşamaq hüququ) üçün iki aspekt təbii mühit və insanın özü yaratdığı mühit mühüm əhəmiyyət kəsb edir. İnsan həyata qədəm qoyduğu vaxtdan daima həyat uğrunda, təbiətin əlverişsiz şəraiti ilə, təbii fəlakətli faktorlara qarşı mübarizə aparmaq ehtiyacı ilə qarşılaşmışdır. Əmək alətlərinin hazırlanması mədəniyyətinə yiyələnməklə, qida, ərzaq istehsal etməklə, yurd salmaqla insan özünü mühitin əlverişsiz faktorlarından xeyli dərəcədə təcrid edə bildi. Bu zaman insanın tələbatı getdikcə artaraq istehsalın genişləndirilməsi və intensivləşdirilməsi tələb olunurdu (Quliyev, 1994). İnsan özünün əzələ enerjisindən getdikcə az istifadə etməklə təbii materiallardan və enerji mənbələrindən daha çox istifadə etməyə başlayır. İnsan təbiətə uyğunlaşmaqdan daha çox özü onu dəyişdirməyə başladı. Təbiəti dəyişdirmək istiqamətində insan fəaliyyəti onun üçün nisbətən yeni həyat şəraitinin yaranmasına səbəb oldu, yeni "ikinci təbiət" - insan tərəfindən süni yaradılan və onun köməyi ilə saxlanılan süni su hövzələri, əkin sahələri, meşə əkinləri və s. insan tərəfindən yaradılan təbii həyatla analoqu olmayan süni dünya – şəhərlər, binalar, asfalt, beton, sintetika və s. meydana gəldi. Bunun nəticəsində insanı əhatə edən təbii və süni mühit o qədər tez dəyişməyə başladı ki, insan orqanizmi bu dəyişilmələrin çoxuna adaptasiya olunmağa belə macal tapa bilmir. Bu isə

xəstələnmənin strukturunda dəyişmənin yaranmasına və kütləvi şəkildə yeni xəstəlikləin əmələ gəlməsinə səbəb oldu. Bu vəziyyətdən çıxmaq üçün insan və təbiət arasında birgə təkamül yaratmaq, yəni insan fəaliyyətinin ətraf mühiti dəyişdirmə sürəti və miqyasını elə nizamlamaq lazımdır ki, insan məskunlaşdığı yerin dəyişməsinə uyğunlaşmağa macal tapsın.

*Genetikanın* bir elm sahəsi kimi tibbə tətbiqi XX əsrin əvvələrində Mendel qanunlarının təkrar kəşfi ilə başlamışdır.

*İrsi xəstəliklər* —insanda gen və xromosom mutasiyaları ilə nəticələnən xəstəliklərdir. Bir çox hallarda "irsi xəstəlik" termini "anadangəlmə" termini ilə eyniləşdirilir. Anadangəlmə inkişaf qüsurları anadangəlmə infeksiyaların və xarici mühit faktorların təsiri altında baş verir. Bu xəstəlik uşaq doğularkən artıq mövcud olur və onun səbəbi həm irsi, həm də xarici mühit faktorlarının təsiri ilə əlaqədardır. İrsi xəstəliklərin heç də hamısı anadangəlmə deyildir. Onların bəziləri insan həyatının birinci ilində bəziləri isə gənc və daha yaşlı dövrlərdə təzahür edir (Musayev, 2004).

Ölkə vətəndaşlarının sağlam doğulmasında, böyüməsində yaşadığı ömür ərzində qarşıya çıxan xəstəliklərin aradan qaldırılmasında səhiyyənin bir başa rolu mövcuddur. Elə bir insan tapmaq olmaz ki, yaşadığı həyatı boyu bir dəfə də olsun səhiyyə sahəsinə müraciət etməmiş olsun. Səhiyyə hər bir insanın həyatında ayrılmaz və sağlamlığının ən güvəndiyi sahədir. Təəssüflər olsun ki, bəzi hallarda səhiyyə təminatının aşağı olması və ya savadsız tibb işçiləri ilə də tez-tez rastlaşırıq. Səhiyyə təminatının aşağı olması və ya səhiyyədə olan çatışmamazlıq insanların sağlamlıqlarının müdafiəsində ən təhlükəli problemlərin meydana gəlməsinə yol aça bilər.

Məktəblərdə fəaliyyət göstərən tibb məntəqələrinin işi, şagirdlərin, müəllim və digər işçilərin sağlamlıqlarının qeydinə qalmaqdır. Gözlənilməz hadisələr, (xüsusilədə fiziki tərbiyə dərslərində) zədələnmələr, zamanı qarşıya çıxan ilkin tibbi yardımlarda bu tibb məntəqələrinin rolu vacib və əvəz edilməzdir.

Nəzərə alsaq ki, məktəblərdə təhsil alan azyaşlılar ölkə gələcəyinin təminatçılarıdır, vəzifəli şəxslərində bu kimi işlərə ciddi yanaşamasını bir vətəndaş kimi özünə borc hiss etməsi vacibdir.

*Bədən quruluşu və onun formalaşdırılması*. Bədən quruluşu insanın həyatında, sağlamlığında, əmək qabiliyyətində və psixologiyasında böyük rol oynayır. Bədən qurluşuna baxmaqla həmin insanın hansı fiziki və iradi gücə malik olmasını müəyyən etmək mümkündür. İdeal bədən qurluşuna malik olmaq hər bir insanın arzusudu. Fiziki hazırlıq, bədən tərbiyəsi və düzgün qidalanma bu arzunun reallaşmasına təkan verən əsas amildir (Nərimanov, 2004; Volkov, 2006).

Fiziki inkişaf səviyyəsindən asılı olmayaraq istənilən yaş qrupuna aid olan insanlar öz bədənlərinin möhkəmləndirilməsi ilə məşğul ola bilərlər. Yadda saxlamaq lazımdır ki, bədənin möhkəmləndirilməsi fasiləsiz və sistemli şəkildə aparılmalıdır**.** Bədənin möhkəmləndirilməsi üzrə 2-3 ay ərzində aparılan prosedurlar daha sonra saxlanılarsa, orqanizm yaxın 3-4 həftə (uşaqlarda isə 5-7 gün) ərzində öz möhkəmliyini itirmiş olur. Buna görə də əgər hər hansı bir səbəbdən siz uzun müddət ərzində bədənin möhkəmləndirməsi prosedurlarını saxlamış olsanız, bunu davam etdirmək üçün yenə də lap əvvəldən başlamaq lazım gələcək (Allender, 2006).

Bədənin möhkəmləndirilməsinin prosesinin əsasında sistematikliyə əməl etməkdən savayı, bunu tədricən yerinə yetirmək də çox vacibdir. Bədənin möhkəmləndirilməsi yalnız o halda müsbət nəticə verəcəkdir ki, bu zaman tətbiq olunan prosedurların qüvvəsi və müddəti yavaş-yavaş artırılmış olsun.

## Nəticə

Sosial ünsürlərə insanların yoxsulluq dərəcəsi, keyfiyyətli təhsil alması, səmərəli və təmiz ətraf mühitdə yaşaması və insanlarla münasibəti daxildir. Qeyd etdiyimiz hər üç amil birlikdə mövcud olduqda insanların sağlam yaşaması mümkündür. Bunlardan əgər hər hansı biri çatışmırsa, tam şəkildə sağlam olmaq qeyri-mümkündür.

Fiziki sağlamlıq insanların sağlam bədənə malik olması deməkdir. Fiziki sağlamlığı qorumaq üçün müntəzəm fiziki fəaliyyətlə məşğul olmaq (idman), düzgün qidalanmaq və normal istirahət etmək lazımdır.

Sosial rifah insanların normal şəkildə yaşaması üçün tələb olunan şəraitin və vasitələrin lazımı şəkildə mövcud olmasıdır.

Əqli sağlamlıq insanların koqnitiv və emosional rifahı və əqli pozğunluqlarının olmaması anlamına gəlir. Əqli sağlamlıq "insanların öz bacarıqlarını dərk etməsi, həyatda baş verən streslərə müqavimət göstərməsi, məhsuldar olaraq fəaliyyət göstərməsi və öz cəmiyyətinə töhfə vermək bacarığının olması" kimi xarakterizə edilir.

**Ədəbiyyat**

1. *Azərbaycan Respublikasının Ümumtəhsil Məktəbləri üçün fiziki tərbiyə fənni üzrə təhsil proqramı (Kurikulumu).* (2013). I-XI Siniflər.
2. Aksović, N. (2021). Methodological-organizational forms of work in physical education teaching. *Italian Journal of Sports Rehabilitation and Post urology*.
3. Allender, S., Cowburn, G., Foster, C. (2006). Understanding participation in sport and physical activity among children and adults: a review of qualitative studies. *Health Education Research*, 21 (6).
4. Åstrand, P.O. (1964). *Aerobic work capacity. In Proceedings of the conference on oxygen in the animal organism*. Pergamon Press Limited.
5. Bilge, N. (2006). *Turkiye'de beden egitimi ogretmeninin yetistirilmesi. (Physical education teacher training in Turkey).* Kultur Bakanligi Yayinlari.
6. Bal'sevich, V.K. (2006). *Sportivnyi vektor fizicheskogo vospitaniya v rossiiskoi shkole*. Teoriya i praktika fizich. kul'tury i sporta.
7. Quliyev, B.S. (2002). Fiziki tərbiyə dərsinin səmərəliliyini yüksəltməyin bəzi şərtləri. *Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin 82-ci elmi konfransının materialları*. ADPU.
8. Quliyev, B.S. (1994). *Tələbələrin orta məktəbin I-VIII siniflərində bədən tərbiyəsi və kütləvi idman işlərinin təşkilinə hazırlanması məsələləri.* ADPU-nəşr.
9. Məcidov, N. (2016). *Bədən tərbiyəsinin nəzəriyyəsi və metodikası*. I hissə.
10. Minaev, B.N. (1989). *Osnovy metodiki fizicheskogo vospitaniya shkol'nikov*.
11. Musayev, İ.B. (1991). *Fiziki tərbiyənin əsasları*.
12. Nərimanov, B.Ə. (2004). *İdman gimnastikası*. "Müəllim" nəşr.
13. Volkov, V.M. (2006). K probleme razvitiya dvigatel'nykh sposobnostei. *Teoriya i praktika fizicheskoi kul'tury*, №5

Daxil oldu: 09.02.2025
Qəbul edildi: 17.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/127-131

**Günay Hadiyeva**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0000-2436-7286
gunaygadieva45@gmail.com

# Təhsil və elm sahəsində nitq mədəniyyətinin formalaşmasının sosiolinqvistik aspektləri

### Xülasə

Məqalədə cəmiyyətdə ana dilinin, nitqinin, mədəniyyətinin formalaşmasında sosial amillərin əhəmiyyəti araşdırılır. Əsas diqqət təhsil və elm sahəsində nitq mədəniyyətinin aşağı olmasının səbəblərinin təhlilinə verilir. Müasir dilçilər pedaqoji ictimaiyyət və dövlət tərəfindən qorunmasının zəruriliyini əsaslandırırlar. Dil insanlar arasında əsas ünsiyyət vasitəsi, insan fəaliyyətinin bütün sahələrində dünyanı dərk etmək vasitəsi kimi cəmiyyətin mənəvi, intellektual, maddi və digər tələblərinə daim həssaslıqla yanaşır. Cəmiyyətin həyatında baş verən hər şey istər-istəməz dildə, o cümlədən dövrün elmi dünyagörüşündə öz əksini tapır. İstənilən etnik dil başqa dillərlə qarşılıqlı əlaqədə olmadan ayrı-ayrılıqda mövcud ola bilməz. Dillərin qarşılıqlı əlaqəsi, müxtəlif tarixi dövrlərdə bir-birinə təsiri güclənə və ya zəifləyə, təmas formaları və təmasda olan dillərin tərkibi dəyişə bilər. Lakin bu proseslərin inkişaf istiqamətini müəyyən edən əsas amillər həmişə konkret dil birliyinin inkişafı üçün siyasi, sosial-iqtisadi, elmi-texniki, sosial-mədəni və digər şərtlər olaraq qalır.

***Açar sözlər:*** *nitq mədəniyyəti, dil, sosiolinqvistik amillər, elm və təhsil, dövlət*

**Gunay Hadiyeva**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0000-2436-7286
gunaygadieva45@gmail.com

# Sociolinguistic Aspects of the Formation of Speech Culture in the Field of Education and Science

### Abstract

The article examines the importance of social factors in the formation of the culture of native speech in society. The main attention is paid to the analysis of the reasons for the low culture of speech in the field of education and science. Modern linguists justify the need for its protection by the pedagogical community and the state. Language, as the main means of communication between people, a means of understanding the world in all spheres of human activity, is always sensitive to the moral, intellectual, material and other requirements of society. Everything that happens in the life of society is inevitably reflected in the language, including the scientific worldview of the era. Any ethnic language cannot exist separately without interaction with other languages. The interaction of languages, their influence on each other in different historical periods can strengthen or weaken, the forms of contact and the composition of the languages in contact can change. However, the main factors determining the direction of development of these processes always remain political, socio-economic, scientific-technical, socio-cultural and other conditions for the development of a specific language community.

***Keywords:*** *speech culture, language, sociolinguistic factors, science and education, state*

## Giriş

XX-XXI əsrlərin informasiya inqilabı yalnız milli dillərin inkişaf istiqamətlərini əvvəlcədən müəyyən etmədi, həm də məlumatın daha təsirli və səmərəli ötürülməsi, onun qavranılması və ünvana təsirinin öyrənilməsi ilə əlaqəli olan dilçilik sahələrinin sürətli inkişafını müəyyən etdi. Dilçiliyin linqvoqlobalistika, korpus linqvistikası, media dilçiliyi kimi müasir istiqamətləri cəmiyyətin həyatında dilin rolunun əsaslı şəkildə dəyişməsinin nəticəsidir. Hər bir müasir dilin özünəməxsus xüsusiyyətləri və cəmiyyətdə fəaliyyət problemləri var. Bununla belə, müəyyən linqvistik cəmiyyətlərin müəyyən inkişaf dövrlərində (adətən mürəkkəb, dönüş nöqtələri) onların dilləri təkcə dilçilərdən deyil, həm də dövlətdən qorunmağa ehtiyac duyur.

**Tədqiqat**

Hazırda Azərbaycan dilinin və dünyanın bir sıra dillərinin ilk növbədə, təhsil və elm sahəsində linqvistik təhlükəsizliyi təmin etmək lazımdır. Milli ədəbi dillər həm ingilisdilli alınmaların (jarqonlar, terminologiya, jurnalistikadan klişelər və s.) faktiki olaraq bütün funksional üslublara aktiv şəkildə nüfuz etməsindən, həm də ana dili danışanlarının doğma nitq mədəniyyətinə biganəlikdən qorunmağa ehtiyac duyur. Ana dilinə qayğıkeş münasibət xalqın mədəniyyətinin əsas göstəricilərindən biridir. Dilə dövlət qayğısı o deməkdir ki, hökumət cəmiyyətin mənəvi-əxlaqi inkişafında iştirak edir, sadəcə olaraq ictimai münasibətləri tənzimləmir. “Azərbaycan Respublikasında dövlət dili haqqında” haqqında 30 sentyabr 2002-ci il tarixli, 365-IIQ nömrəli Azərbaycan Respublikasının qanunu Azərbaycan dilinin dövlət dili olaraq işlədilməsini öz müstəqil dövlətçiliyinin başlıca əlamətlərindən biri sayır, onun tətbiqi, qorunması və inkişaf etdirilməsinin qayğısına qalır, dünya azərbaycanlılarının Azərbaycan dili ilə bağlı milli-mədəni özünüifadə ehtiyaclarının ödənilməsi üçün zəmin yaradır (“Azərbaycan Respublikasında dövlət dili haqqında” haqqında 30 sentyabr 2002-ci il tarixli, 365-IIQ nömrəli Azərbaycan Respublikasının qanunu, s.1). Bu Qanun Azərbaycan Respublikası Konstitusiyasına uyğun olaraq Azərbaycan Respublikasında Azərbaycan dilinin dövlət dili kimi hüquqi statusunu nizamlayır.

Habelə, “Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında” Azərbaycan Respublikası Prezidentinin 01.11.2018-ci il tarixli Fərmanında qeyd olunur ki, müasir Azərbaycan dili mükəmməl qrammatik quruluşa, zəngin lüğət tərkibinə və ifadə vasitələrinə malikdir (Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında” Azərbaycan Respublikası Prezidentinin 01.11.2018-ci il tarixli Fərmanı, s.1). Bununla yanaşı, dilimizin hüdudsuz imkanlarından yetərincə və düzgün istifadə edilməməsi halları hələ də kifayət qədər geniş yayılmışdır. Televiziya və radio kanallarında, internet resurslarında, mətbu nəşrlərdə və reklam daşıyıcılarında ədəbi dilin normalarının kobud şəkildə pozulması, leksik və qrammatik qaydalara əməl edilməməsi, məişət danışığından istifadə olunması, əcnəbi söz və ifadələrin yersiz işlədilməsi az qala adi hala çevrilmişdir. Bu sahədə hüquqi tənzimləmənin və daimi nəzarətin olmaması dil pozuntularının azaldılması və aradan qaldırılması istiqamətində təsirli tədbirlər görməyə imkan vermir.

Azərbaycan dilinin qorunması son dərəcə mühüm dövlət vəzifəsidir çünki o, ölkədə təhsilin əsası, millətin ünsiyyət və konsolidasiyası vasitəsidir, onun özünəməxsusluğunu təmin edir. Azərbaycan dilinin mövqelərinin möhkəmləndirilməsi istiqamətində çoxşaxəli, genişmiqyaslı tədbirlər həyata keçirilir. Məktəblərdə və universitetlərdə Azərbaycan dilinin və ədəbiyyatının tədrisi, nitq mədəniyyəti, cəmiyyətin müasir tələblərinə uyğun professor-müəllim heyətinin hazırlanmasının təkmilləşdirilməsi, dil və mədəniyyətlərin qarşılıqlı əlaqəsi, bədii ədəbiyyatın və xüsusi ədəbiyyatın tərcüməsi və s. məsələlərin əsaslı müzakirəsinə həsr olunmuş mütəmadi olaraq müxtəlif forumlar keçirilir.

Vahid nitq rejiminin tətbiqi o demək deyil ki, təhsil müəssisəsində hamı eyni şəkildə danışmalıdır. Bununla belə, Azərbaycan dilində həm yazılı, həm də şifahi mətnlərin yaradılması üçün ədəbi dilin müasir normalarına uyğun vahid standartlar olmalıdır. Vahid nitq rejimi nitq kontekstini, nitq mühitini yaradır, təlim nəticələrini müəyyənləşdirir və öyrənənlərin sosiallaşmasına kömək edir (Cəfərov, Həsənzadə, 2021, s.29). Azərbaycan dili ölkədə rəsmi işlərin aparıldığı dildir, dövlət dili və ali təhsil müəssisələrində tədrisin aparıldığı dildir. Azərbaycan dilini yaxşı bilmək müxtəlif millətlərin nümayəndələrinə elmi və istehsalat fəaliyyətinin bütün sahələrində özlərini reallaşdırmağa

və mülki qurumlarda iştirak etməyə imkan verir. Çoxmillətli ölkəmiz üçün Azərbaycan dili həm də təhsil vasitəsi, vahid vətəndaş cəmiyyətinin formalaşması üçün əsasdır.

Daha ciddi problem, fərdin dil davranışının sosial (hətta psixoloji) aspektləridir, məsələn, bu problemə laqeydlikdə, həm gündəlik səviyyədə, həm də təhsil və sonrakı peşə fəaliyyəti prosesində linqvistik nihilizmdə ifadə olunur. Nitq mədəniyyəti linqvistik şəxsiyyətin özünü dərk etməsindən başlayır. O, müəyyən bir səviyyədə yaranır, inkişaf edir və saxlanılır ki, orada ana dili danışan insanlar necə danışıb yazdıqlarına, nitqinin müxtəlif sosial mühitlərdə necə qəbul edildiyinə diqqət yetirirlər. Yalnız belə şəraitdə insanın dil şüuru və bütövlükdə cəmiyyətin milli mentaliteti formalaşır.

Eyni zamanda ictimai nitqdə əsas nitq səhvlərinə aşağıdakıları aid edir:

- rəqəmlərdən imtina edə bilməmək;
- artıq keyfiyyəti (xüsusiyyəti) üstün dərəcədə adlandıran sözlərin üstünlüyü (ən uyğun, ən adekvat, ən optimal, ən unikal və s.);
- “doldurucu” sözlərdən istifadə (məsələn, “kifayət qədər” – kifayət qədər yaxşı);
- ədəbi dilin normalarının müəyyən milli icmada nitqin vəziyyətinə uyğunlaşdırılması (İvanova, 2015, s.55).

Müasir dilçilik “dil” və “nitq” anlayışlarını bir-birindən fərqləndirir. Dil düşüncələri, hissləri, iradələri ifadə etmək vasitəsi olan və insanlar arasında ünsiyyət üçün istifadə olunan fonetik, leksik və qrammatik vasitələr sistemidir. Nitq müəyyən dil şərtlərindən və ünsiyyət vasitələrinin seçilməsi ilə xarakterizə olunan dildən istifadə edilən ünsiyyət növüdür (Mikhailenko, 2012, s.43). Uzunmüddətli müşahidələrin göstərdiyi kimi, indiki dövrdə xüsusən də gənclərin nitq mədəniyyətinin aşağı olmasının səbəbi də ingilis dilindən alınma sözlərin intensiv artmasıdır. Mətndə həddən artıq alınma sözlər (ifadələr) şəklində ingilisdilli maddi formada (onlayn, startap), eləcə də transliterasiya, transkripsiya və s. (trend, klaster, trafik, mesaj, məzmun, moderator, başlıq və bir çox başqaları) əmələ gələn linqvistik vahidlər şəklində istifadə olunur.

Müasir Azərbaycan dilinin bütün funksional üslublarında həddindən artıq rus və ingilis dilində alınma sözlərin meydana gəlməsini ilk növbədə təhsilin beynəlmiləlləşməsi ilə əlaqələndirilir. Bunun nəticəsi təkcə təhsilin deyil, həm də cəmiyyətin həyatının digər sahələrinin (elm, istehsal fəaliyyəti, kütləvi mədəniyyət, media, reklam, məişət, istirahət, idman) “ruslaşması”, “amerikanlaşması” idi. Bu xarici amillər təkcə dildə olan çoxsaylı alınma sözlərin müasir Azərbaycan dilinin əsas funksional üslublarına (elmi, rəsmi-işgüzar, publisistik, danışıq) nüfuz etməsini müəyyən etmir, həm də onların dildə möhkəmlənməsi, dilin strukturuna daxil olması üçün sosial və psixoloji şərait yaradır (Rəcəbli, 2019, s.86).

Bu gün insanlar, xüsusən də tələbələr gündəlik həyatın, iş yerinin, təhsil və istirahət yerlərinin “texnikiləşdirmə”, “texnologiyalaşma”, “qadjetləşmə”, “internetləşmə” və s. müasir insanların əsas ünsiyyət vasitəsi və məkanı, çox vaxt iş və təhsil yeri olan sosial şəbəkələr də nitq mədəniyyətinin aşağı düşməsinə şərait yaradır. Vaxt qıtlığı şəraitində linqvistik diqqətsizlik normaya çevrilir ki, bu da mətnlərdə müəllifin absurd abbreviaturalarında və söz birləşmələrində, jarqon və danışıq lüğətinin istifadəsi, çoxlu sayda qrammatik, orfoqrafiya, durğu işarələri və digər xətaların olması ilə özünü göstərir (Nguyen, 2022, s.183).

İnternetin yaranması məlumat əldə etmək imkanları haqqında anlayışımızı kökündən dəyişdi. Onun inkişafının xətti prosesi hipertekstuallıqla, yəni daimi mətn seçmək azadlığı ilə əvəz olundu. Hipertekstuallığın ardınca informasiya-kommunikasiya texnologiyalarının artan inkişaf tempi sayəsində təhsildə ildən-ilə daha çox mövqe tutan idrak prosesinə interaktivlik daxil edilmişdir, ənənəvi tədris üsulları getdikcə yeniləri ilə əvəz olunur. Bir çox tədqiqatların göstərdiyi kimi, informasiya-kommunikasiya texnologiyaları əsasında informasiya əldə etmə, öyrənmə və ünsiyyətin bütün bu formaları, xüsusən də distant təhsil təkcə ana dilinin deyil, həm də xarici dillərin, o cümlədən ingilis dilinin nitq mədəniyyətinin yüksəldilməsinə heç bir töhfə vermir (Bayyurt, 2013, s.73). Çünki onlar öyrənmənin əsas subyekti olan müəllimi, eləcə də şəxsi (insan) ünsiyyət imkanlarını istisna edir.

Nitq mədəniyyəti problemi ali təhsil və elm sahəsində xüsusilə aktuallaşıb. Alimlər, yəni elmlə peşəkarcasına məşğul olan mütəxəssislər arasında məlumat mübadiləsi elmi ünsiyyətin əsas məqsədidir. Elmi sahədə məlumat dedikdə, bəşəriyyət tərəfindən toplanmış, şifahi formada ifadə olunan biliklər, o cümlədən ətraf aləmdə yeni əlaqələri və qanunauyğunluqları müəyyən etmək üçün ilkin məlumatlar, əldə edilən yeni biliklər və s. başa düşülür. Tədqiqatçılar öz tədqiqatlarının nəticələrini mütəmadi olaraq elmi nəşrlərdə və digər əsərlərdə təqdim etməlidir. Eyni zamanda, yazılı

çoxqatlı bir təcrübə yaradır. Bu elementlər sadəcə texniki komponentlər kimi deyil, həm də mənalı dramaturji vasitələr kimi çıxış edirlər. Xüsusən də, səsin və səssizliyin münasib balansı tamaşaçı ilə mənəvi əlaqənin qurulmasında və obrazların psixoloji dərinliyinin ötürülməsində həlledici rol oynayır.

Amerikalı rejissor Stiven Spilberqin yaradıcılığı bu kontekstdə xüsusi əhəmiyyət daşıyır. Onun rejissorluğu ilk baxışda klassik Hollivud üslubuna yaxın görünə bilər, lakin əslində, səslə işləmə tərzi baxımından o müasir kinematoqrafiyada özünəməxsus və dərin sistem yaradır. Onun filmlərində musiqi və səssizlik bir çox hallarda vizual təsvir qədər, bəzən isə ondan da artıq dərəcədə hekayənin strukturuna və emosional dinamikasına təsir göstərir. Spilberqin estetik yanaşması səsin yalnız müşayiətçi bir funksiya daşımadığını, əksinə, hadisələrin mənalandırılmasında və tamaşaçı təəssüratlarının yönləndirilməsində aktiv rol oynadığı prinsipə əsaslanır. Bu yanaşmanın ən bariz təzahürlərindən biri rejissorun uzun illər ərzində məşhur bəstəkar Con Vilyams ilə qurduğu məhsuldar əməkdaşlıqla müşahidə olunur. Spilberqin səsə yanaşması "bədii həqiqətə sadiqlik prinsipi" üzərində qurulub. Onun məqsədi sadəcə hekayə danışmaq deyil, həqiqətin emosional hissini yaratmaqdır (McBride, 2011, s.287)

## Tədqiqat

Musiqinin xarakter və atmosfer yaratması. Spilberqin ilk diqqətçəkən tammetrajlı televiziya filmi olan *"Duel"* (Duel, 1971) rejissorun səs dramaturgiyasına yanaşmasının erkən və təməl nümunələrindən biri kimi qiymətləndirilə bilər. Filmin əsas süjet xətti minimal hekayə quruluşuna malik olsa da, məhz səsin estetik və dramaturji istifadəsi bu sadəliyi psixoloji baxımdan dərin və gərgin bir filmə çevirir. Burada səs həmçinin, atmosferin qurulması, emosional tonun idarə edilməsi və görünməyən təhlükənin konkret hissə çevrilməsi üçün əsas alətə çevrilir.

Filmdə antoqonist, yük maşınının sürücüsü, demək olar ki, heç zaman tam olaraq göstərilmir. Onun fiziki yoxluğu vizual olaraq boşluq hissi yaratsa da, bu boşluq mühərrik səsi, təkərlərin sürtünməsi, havanı yarıb keçən siqnal səsləri və qəfil sürətlənmə sədaları ilə tamamlanır. Bu nöqteyi-nəzərdən, yük maşını filmdə sadəcə nəqliyyat vasitəsi yox, eyni zamanda "psixoloji təhdid" və "görünməyən şər" obrazıdır və bu obraz tamamilə səs vasitəsilə yaradılır. Mühərrikin zəhmli uğultusu, uzun və qəsdən uzadılmış səssizlikdən sonra gələn qəfil səs partlamaları tamaşaçının emosional sabitliyini pozur və onların gərginliyini yüksəldir. Bu səs manipulyasiyası nəticəsində film boyu tamaşaçılar qəhrəmandan çox daha əvvəl təhlükəni hiss edir. Bu isə klassik dramaturji ironiyanın səs üzərində qurulmasına bir nümunə ola bilər. Rejissor burada musiqidən imtina edərək, ətraf səslərin və akustikanın dominant olduğu realist bir səs mühiti yaradır. Bu qərar həm də filmin mövzusuna uyğun səs atmosferi formalaşdırır. Qəhrəmanın nəfəsinin sürətlənməsi, avtomobilin içindəki titrəyiş səsləri və təkərin yollardakı xışıltısı tamaşaçının da bu qorxunu tam hiss etməsinə səbəb olur. Yəni, səs "eşidilən" olmaqla bərabər, həm də "hiss edilən" bir element kimi çıxış edir. Səssizliklə səsin ardıcıl işlənməsi təhlükənin daim mövcud olduğu hissini gücləndirir. Eyni zamanda, tamaşaçı ilə qəhrəman arasında bağ yaradır. Bu film rejissorun erkən dövrlərindən etibarən səsi aktyor qədər canlı və rol oynayan bir komponent kimi qəbul etdiyinin sübutudur.

Stiven Spilberqin müasir blokbasterin atası sayılan "Çənələr" (Jaws, 1975) filmi də kino tarixində musiqinin təhlükə obrazı kimi işlənildiyi ən güclü nümunələrdən biridir. Con Vilyamsın bəstələdiyi və sadəcə iki notdan ibarət olan əsas musiqi motivi zamanla təkcə bu filmə deyil, ümumilikdə, qorxu və gərginlik hissinin sinoniminə çevrilmişdir. Bu sadə, lakin effektiv melodiya sayəsində Spilberq vizual olaraq görünməyən bir təhlükəni, səsin özünü təhlükə kimi təqdim etməklə tamaşaçının şüuraltısına yerləşdirir.

Filmin ilk hissələrində köpəkbalığı, demək olar ki, vizual olaraq görünmür, onun varlığı, yalnız suyun səthindəki dalğalanma, qurbanın çığırtısı və Vilyamsın musiqisi ilə hiss olunur. Spilberq bu mexanizmdən istifadə edərək tamaşaçının təxəyyülünü aktivləşdirir, qorxunu göstərmək əvəzinə eşitdirməklə daha dərin psixoloji təsir yaradır. Görünməyən təhlükə, musiqi vasitəsilə real bir varlığa çevrilir. Tamaşaçı musiqini eşidən andan etibarən nə vaxt, harada hücum baş verəcəyinə dair gərgin gözləmə vəziyyətinə salınır.

Ən diqqətəlayiq cəhətlərdən biri də odur ki, bu əsas musiqi motivi yalnız köpəkbalığı göründüyü və ya hücum etdiyi anlarda səslənmir. Bəzən o, sadəcə yaxınlaşan təhlükənin siqnalı kimi işlədilir. Bu isə musiqini sadəcə fon üçün element olmaqdan çıxararaq, hekayənin içində aktiv rol oynayan, informasiya daşıyan struktura çevirir. Musiqi burada sadəcə emosional atmosfer yatarmır, həm də

tamaşaçıya məkan və zaman haqqında əlavə məlumat verir, yəni köpəkbalığının gəlişinə tamaşaçılar personajlardan əvvəl hazır olurlar. Vilyamsın bu ikonik motivi minimalistdir, lakin bu minimalizm təhlükənin sadəliyini və qaçılmazlığını simvollaşdırır. Musiqinin tempinin tədricən artması gərginliyin kulminasiyaya çatması ilə paralel formada irəliləyir. Bu musiqi həm də dramaturju strukturun ritmini müəyyənləşdirir. Nəticə etibarilə, bu filmdə səs şüuraltı psixoloji reaksiya doğuran dramaturji bir aktyordur. Spilberq burada musiqinin kinematoqrafik dildə simvol və metafor kimi istifadə imkanlarını tam şəkildə dəyərləndirərək səsin hekayə danışma potensialını maksimuma çatdırır.

Rejissorun *"Üçüncü növ yaxın təmaslar"* (Close Encounters of the Third Kind, 1977) filmində isə səs kommunikasiya vasitəsi, dilin alternativi kimi çıxış edir. Bu ekran əsərində yadplanetlilərlə insanlar arasında ilk əlaqənin məhz musiqi vasitəsilə qurulması, səsin bəşəri ünsiyyət forması kimi təqdim olunması, rejissorun səsə həmçinin fəlsəfi, estetik komponent kimi yanaşdığını sübut edir. Filmin kulminasiya nöqtəsində yer alan beş notdan ibarət melodiya semiotik baxımdan həm simvolik, həm də ritualistik məna daşıyır. Rejissor burada musiqini dilin estetik ekvivalenti kimi qurur. Burada səs birləşdirən, körpü rolunu oynayan bir elementə çevrilir.

Rejissorun yaradıcılığına nəzər saldıqda, daha bir maraqlı nümunə diqqəti cəlb edir. Bu, *"Bənövşəyi günlər"* (The Color Purple, 1985) filmidir. Filmin baş qəhrəmanı Silinin səssizliyi, onun uzun illər susaraq hər şeyi içində yaşaması patriarxal sistemin qadın bədəninə və səsinə tətbiq etdiyi nəzarətin nəticəsidir. Filmin ilk hissəsində Silinin demək olar ki, heç bir sahədə danışmaq haqqı yoxdur. Onun səsi həyat yoldaşı və cəmiyyət tərəfindən əngəllənmişdir. Bu səssizlik həm sosiopolitik, həm də psixoloji bir təcrid formasıdır. Qəhrəmanın daxili oyanışı və öz şəxsiyyətini bərpa etməsi isə musiqi və səs vasitəsilə mərhələli şəkildə qurulur. Filmin erkən səhnələrində musiqi zəifdir, bu Silinin daxili səssizliyini simvollaşdırır. Silinin həyatı bu mərhələdə ritmsiz və ahəngsizdir. Musiqinin ilk güclü giriş nöqtəsi Şaq obrazı ilə gəlir. Şaq ilə tanışlığı Silinin həyatına ilk dəfə qadın səsini gətirir. Bu filmdə musiqi qadınların içində boğulmuş səsin bərpa olunmsının, fərdi azadlığın və mədəni müqavimətin təcəssümüdür. Həmçinin musiqi burada emosional reaksiyalar doğurur, həm də obrazların daxili dəyişimini stimullaşdıran aktyor funksiyasını daşıyır.

Stiven Spilberqin ən qiymətli işlərindən sayılan *"Şindlerin siyahısı"* (Schindler's list, 1993) filmi Holokostun kinematoqrafik təqdimatı baxımından, təsvir dili ilə yanaşı, səsin yoxluğu və musiqinin varlığı ilə qurulan dərin emosional və mənəvi atmosferlə də seçilir. Bu film həm də sübut edir ki, bəzən bir sükut və ya musiqi səsi minlərlə sözün ifadə edə bilmədiyi faciəni çatdıra bilər. Spilberq burada musiqini və səssizliyi, eyni zamanda, tarixi travmanın etik və estetik təcəssümü kimi istifadə edir.

Con Vilyamsın bəstələdiyi əsas leytmotivi, məşhur skripka melodiyası matəm, mərhəmət və günah hisslərini daşıyan simvolik bir axındır. Bu musiqi qəhrəmanların yaşadıqlarını müşayiət etməklə bərabər, həm də tamaşaçının vicdanına yönələn poetik bir sual kimi səslənir: "İnsanlıq və ədalət haradaydı?" Musiqinin incəliyi, təmkinli tempi və çarəsiz titrəyən notları Holokostun səssiz harayını əks etdirir.

Filmdəki səssizlik atmosferi əks etdirməklə yanaşı, həmçinin boşluq yaradır, düşüncə üçün yer açır və diskomfort hissi oyadır. Məsələn, Auşvitz həbs düşərgəsinə göndərilənlərin gözlədiyi səhnələrdə sükut zamanın dayanması qədər əzablıdır. Bu səssizlik tamaşaçını vizual informasiya ilə deyil, vicdanla baş-başa buraxır. Bu filmdə musiqi, səs və səssizlik xatırlatmağa, hiss etdirməyə və utandırmağa xidmət edir.

Təsir gücü ilə tamaşaçı yaddaşına həkk olunmuş digər ekran əsərlərindən biri *"Yura dövrü parkı" (Jurassic Park, 1993)* filmidir. Maraqlıdır ki, dinozavrların necə real səs çıxardığı heç kəsə məlum olmadığı üçün Spilberq və səs rejissoru Geri Ridstorm müxtəlif heyvan səslərini, fil, balina, timsah, aslan və s. birləşdirərək, real olmadığı halda son dərəcə inandırıcı və qorxulu səslər yaratmağa nail olmuşlar.

Filmin kulminasiyasında səs və musiqi arasında kontrapunktual əlaqə qurulur. Dinozavrların xaotik hərəkətləri ilə orkestrin dramatik yüksəlişi arasında yaranan kontrast tamaşaçının gərginliyi ilə azadlıq hissini eyni anda yaşamasını təmin edir.

Rejissorun *"Sıravi Ryanı xilas etmək"* (Saving Private Ryan, 1998) filmindəki açılış səhnəsi, Normandiya sahilində baş verən döyüş kino tarixində səs dizaynının ən dramatik və realistlik nümunələrindən biri kimi qəbul olunur. Ancaq səhnənin emosional təsir gücünü yalnız gurultular,

partlayışlar, çığırtılar və silah səsləri deyil, bir anda yaranan tam səssizlik formalaşdırır. Bu səssizlik travmanın yaşanma mexanizmi kimi təqdim olunur. Kapitan Millerin qulağının batması ilə bağlı səssiz anlar, tamaşaçının da həmin şok halını yaşamasına şərait yaradır. Zaman donur, səs ölür və yalnız nəfəsin, iç sarsıntının ritmi qalır. Bu anlarda Spilberq tamaşaçını hadisənin iştirakçısına çevirmir, hadisənin özünə çevirir.

Spilberqin səsə yanaşması etikadır, tamaşaçının baxmaqdan çox məsuliyyət daşımasını təmin etmək məqsədi daşıyır (Kowalski, 2008, s.145)

Stiven Spilberqin yaradıcılığı kino dilində səsin və səssizliyin estetik və dramaturji gücünü bənzərsiz şəkildə dəyərləndirməsi ilə seçilir. Bununla yanaşı, Spilberqin digər filmlərində də səs üzərində qurulan incə dramaturgiya müşahidə olunur. *"Azlıq hesabatı"* (Minority Report, 2002) filmində texnoloji səslər və yüksək tezlikli ambientlər gələcək distopiyasının fonunu qurur *"Post"* (The Post, 2017) və *"Casuslar körpüsü"* (Bridge of Spies, 2015) kimi siyasi dramlarında isə Spilberq musiqidən çox səssizlik və dialoq arasındakı mikro pauzaları önə çəkir.

## Nəticə

Stiven Spilberqin kino dili, sadəcə vizual təsvirlərlə deyil, həm də eşidilən elementlərlə, musiqi, səssizlik və səslərin öz strukturu ilə formalaşan çoxqatlı bir ifadə sistemidir. Onun rejissorluğu səsi müşayiət səviyyəsindən çıxararaq, hekayənin özü qədər canlı dramaturji vasitəyə çevirir. Musiqi, səs və səssizlik onun filmlərində hadisələrin axarına təsir edən, personajların daxili dünyasını açan, tamaşaçının empatik iştirakını təmin edən əsas tərkib hissələrindən birinə çevirir. Spilberq üçün səs, görünməyən, deyilməyənin, ancaq hiss edilənin ifadəsidir. Rejissorun səsə olan bu həssas yanaşması onun tamaşaçını emosional olaraq daxili reaksiya verən, mənəvi münasibət quran və əxlaqi seçimlərlə qarşılaşan bir subyektə çevirmək istəyindən qaynaqlanır. Ənənəvi kino strukturunda səs çox zaman vizualın xidmətinə işləyir. Lakin Stiven Spilberqin kino poetikasında səs eyni zamanda, həm mənəvi, həm etik, həm də fəlsəfi funksiya daşıyır. Səssizlik bəzən qışqırıqdan daha çox danışır, musiqi isə bəzən sözlərdən daha çox izah edir. Bu yanaşma rejissorun dərin və empatiya mərkəzli baxış bucağından yaranır. Spilberq filmlərində səs, bəzən travmanın, bəzən ümidin, bəzən isə müqavimətin poetik daşıyıcısıdır. Səssizlik qorxunu artırır, musiqi duyğuları və hissləri formalaşdırır, arxa plandakı səslər isə reallığı daha yaxın və hiss edilən edir. Bu səbəbdən, onun filmləri vizual olduğu qədər, akustik yaddaşımıza da həkk olunur. Onun kinosu bəzən bizə baxmağı, çox zamansa qulaq asmağı öyrədir. Elə bəlkə də bu səbəbdən rejissorun filmləri eşidildiyi qədər, həm də hiss edilir.

## Ədəbiyyat

1. Alba, F. (2017). *El cine fantástico de Spielberg*. Ediciones Encuentro.
2. Buckland, W. (2006). *Directed by Steven Spielberg: Poetics of the Contemporary Hollywood Blockbuster,* Continuum.
3. Friedman, L. D. (2006). *Citizen Spielberg*. University of Illinois Press
4. Hoberman, J. (2011). *An Army of Phantoms: American Movies and the Making of the Cold War*. The New Press.
5. Kowalski, D. A. (Ed.). (2008). *Steven Spielberg and Philosophy: We're Gonna Need a Bigger Book*. The University Press of Kentucky.
6. Kalinak, K. (2010). *Film Music: A Very Short Introduction.* Oxford University Press.
7. McBride, J. (2011). *Steven Spielberg: A Biography (2nd ed.).* University Press of Mississippi.
8. Minuz, A. (2014). *Steven Spielberg*. ll Castoro.
9. Morris, N. (2007). *The Cinema of Steven Spielberg: Empire of the Light.* Wallflower Press.
10. MacCabe, C. (2003). *Steven Spielberg.* British Film Institute.
11. Schober, A., & Olson, D. (Eds.). (2016). *Children in the Films of Steven Spielberg.* Lexington Books.
12. Wasser, F. (2010). *Steven Spielberg's America.* Polity Press.

Daxil oldu: 14.02.2025
Qəbul edildi: 20.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/161-164

**Çimnaz Hüseynova**
Azərbayan Dövlət İqtisad Universiteti
magistrant
https://orcid.org/0009-0008-3997-3826
chimnazh00@gmail.com

# Səhmlərə qoyulan investisiyalar üzrə risklərin statistik metodlarla qiymətləndirilməsi üsulları

**Xülasə**

İnvestisiya qərarlarının qəbul edilməsində risklərin düzgün qiymətləndirilməsi vacib əhəmiyyət kəsb edir, xüsusilə səhmlərə qoyulan investisiyalar yüksək gəlir potensialı ilə yanaşı, əhəmiyyətli risklər də daşıyır. Bu araşdırma, səhmlərin risklərini qiymətləndirmək üçün istifadə olunan əsas statistik metodları – standart kənarlaşma, varians analizi, beta əmsalı və Value-at-Risk (VaR) metodlarını barədə məlumatlar təqdim edir. Bu metodlar, səhmlərin qiymət dəyişkənliyini ölçmək və bazar riskini təhlil etmək üçün investorlar üçün vacib alətlərdir. Risklərin düzgün qiymətləndirilməsi, investorların daha məlumatlı və strateji qərarlar qəbul etmələrini təmin edir, sərmayələrin qorunması və optimallaşdırılması üçün imkanlar yaradır. Hər bir metodun tətbiqi, investorların riskləri effektiv şəkildə idarə etməsinə və sərmayələrini minimum itki ilə qorumasına kömək edir.

***Açar sözlər***: *səhm, investisiya, statistik metodlar, risklər, qiymətləndirmə*

**Chimnaz Huseynova**
Azerbaijan State Economic University
Master student
https://orcid.org/0009-0008-3997-3826
chimnazh00@gmail.com

# Procedures of Assessing Risks in Stock Investments Using Statistical

**Abstract**

Accurate assessment of risks is crucial in making investment decisions, especially since investments in stocks carry significant risks along with high return potential. This study presents information on the main statistical methods used to assess the risks associated with stocks, including standard deviation, variance analysis, beta coefficient, and the Value-at-Risk (VaR) method. These methods are important tools for measuring stock price volatility and analyzing market risk. Proper risk assessment enables investors to make more informed and strategic decisions, providing opportunities for the protection and optimization of investments. The application of each method helps investors effectively manage risks and protect their investments with minimal losses.

***Keywords***: *stock, investment, statistic methods, risks, assesment*

## Giriş

İnvestisiya qərarlarının qəbul edilməsində risklərin düzgün qiymətləndirilməsi mühüm əhəmiyyət kəsb edir. Xüsusilə, səhmlərə qoyulan investisiyalar, yüksək gəlir potensialı ilə yanaşı, eyni zamanda əhəmiyyətli risklər daşıyır (Soltanova , 2018). Səhmlərin qiymət dəyişkənliyi, iqtisadi və siyasi faktorlar, bazarların təbii volatilliyi kimi amillər investorlar üçün böyük qeyri-müəyyənliklər yaradır (Kapital Bank, 2023). Bu qeyri-müəyyənlikləri dəqiq qiymətləndirmək və idarə etmək üçün müxtəlif statistik metodlar mövcuddur ki, bunlar da investorlara risklərin ölçülməsi və idarə olunması yönündə kömək olur.

Bu araşdırmanın əsas məqsədi, səhmlərə qoyulan investisiyaların risklərinin statistik metodlarla qiymətləndirilməsinin əsas prinsiplərini, metodologiyalarını və praktik tətbiqlərini ətraflı şəkildə təqdim etməkdir. Riskin düzgün qiymətləndirilməsi, investorların daha düzgün qərarlar qəbul etmələrini təmin edir, beləliklə, sərmayələrini qorumaq və optimallaşdırmaq üçün effektiv strategiyalar tətbiq etməyə imkan verir.

**Tədqiqat**

1. Risk ölçülməsinin əsas statistik metodları:

Risklərin ölçülməsi və qiymətləndirilməsi müasir maliyyə nəzəriyyəsində geniş istifadə olunan statistik alətlər vasitəsilə həyata keçirilir. Statistik metodlar investorların riskləri daha dəqiq ölçmələrini və gələcəkdəki qiymət dəyişikliklərini proqnozlaşdırmalarını təmin edir (Greiner, 2013, s.41). Səhmlərin risklərini qiymətləndirmək üçün istifadə olunan əsas statistik metodlar aşağıdakılardır:

1.1. Standart kənarlaşma və varians analizi:

Standart kənarlaşma, səhmlərin gəlirlərinin orta dəyərindən nə qədər dəyişkən olduğunu ölçən ənənəvi və ən çox istifadə edilən metodlardan biridir. Bu göstərici, səhmin qiymətinin nə qədər dalğalandığını və onun gəlirlərinin nə qədər dəyişkən olduğunu müəyyənləşdirir (Hull, 2015, s.201). Yüksək standart kənarlaşma, səhmin gəlirlərinin daha yüksək volatilliyə, yəni, qiymət dəyişkənliyinə sahib olduğunu və bununla əlaqədar olaraq daha yüksək risklə əlaqəli olduğunu göstərir. Bu metod, səhmin gəlirlərinin nə qədər qeyri-sabit olduğunu və gələcəkdəki qiymət hərəkətlərini proqnozlaşdırmağa çalışır. Riyazi olaraq, standart kənarlaşma dispersiyanın kvadrat köküdür, bu da səhmin qiymətindəki dəyişikliklərin nə qədər böyük olduğunu təhlil etməyə imkan verir (Meagher, 2023). Bir səhmin standart kənarlaşması nə qədər yüksəkdirsə, o səhmin qiymətindəki dalğalanmalar da o qədər böyük olur və buna görə də risk daha yüksək olur.

Varians isə səhmlərin qiymətlərinin orta qiymətdən nə qədər uzaqlaşdığını ölçən digər statistik bir göstəricidir. Varians analizi, səhmin qiymət dəyişikliklərinin nə qədər fərqli olduğunu və qiymətlərin orta səviyyədən nə qədər sapdığını təhlil edir. Varians, səhmin gəlirlərinin paylanmasının nə qədər geniş olduğunu və bu dəyişkənliyin nə qədər risk yaratdığını müəyyənləşdirməyə kömək edir. Bu göstərici həmçinin, investorların portfellərini qiymətləndirərkən əhəmiyyətli rol oynayır, çünki səhmlərin qiymət dəyişkənliyi və dalğalanması portfelin ümumi riskinə təsir edir (Hayes, 2024).

Markowitz-in müasir portfel nəzəriyyəsi, investorların portfellərindəki aktivlərin riskini qiymətləndirmək üçün varians və kovaryans anlayışlarından istifadə edir. Bu nəzəriyyə, portfelin ümumi riskinin, portfeli təşkil edən səhmlərin və digər aktivlərin variansları və kovaryansları əsasında hesablanmasını təklif edir. Əgər səhmlər bir-biri ilə müsbət kovaryans göstərirsə, bu zaman onların qiymətləri eyni istiqamətdə hərəkət edəcək və portfelin ümumi riskini artıracaq (Kazımlı, Quliyev, 2011, s.98). Lakin, əgər səhmlər arasında mənfi kovaryans varsa, bu o deməkdir ki, səhmlərin qiymətləri fərqli istiqamətlərdə hərəkət edəcək və bu vəziyyət portfeli daha az riskli edəcək.

1.2. Beta əmsalının təhlili:

Səhmlərə qoyulan investisiyaların risklərini düzgün qiymətləndirmək və idarə etmək, investorların bazar dəyişikliklərinə adaptasiya olmalarına və risklərini minimuma endirmələrinə kömək edir. Bu məqsədlə istifadə olunan ən əhəmiyyətli göstəricilərdən biri də beta əmsalıdır. Beta əmsalı, səhmin riskini ölçmək üçün geniş tətbiq edilən bir göstəricidir və xüsusilə, maliyyə dünyasına aid olan Kapital Aktivlərinin Qiymətləndirilməsi Modeli (CAPM) çərçivəsində vacib yer tutur.

Beta əmsalı, səhmin gəlirləri ilə bazar gəlirləri arasındakı əlaqəni göstərir və bazar hərəkətləri ilə səhmin necə dəyişdiyini təhlil etməyə imkan verir (Liberto, 2024). Bu əmsal, investora səhmin bazar dalğalanmalarına necə reaksiya verdiyini, yəni bazarın ümumi dəyişikliklərinə qarşı səhmin nə qədər riskli olduğunu öyrənmək imkanı tanıyır. Daha yüksək beta əmsalı olan səhmlər bazar hərəkətlərinə daha həssasdır, digər tərəfdən, daha aşağı beta əmsalı olan səhmlər bazar dəyişikliklərindən daha az təsirlənir.

Beta əmsalının müstəqil və asılı dəyişənlər arasında əlaqəni göstərməsi investorlar üçün çox faydalıdır. Bu əmsalın dəyəri 1-dən böyük olan səhmlər bazarın qiymət dəyişikliklərinə daha çox

həssasdır və bununla əlaqədar daha yüksək risk daşıyır. 1-dən kiçik olan səhmlər isə bazar qiymətlərinin dəyişməsinə daha az reaksiya verirlər və daha az risklidir.

1.3. Value-at-Risk (VaR) metodu:

Maliyyə risklərinin qiymətləndirilməsində geniş istifadə edilən bir yanaşmadır və investorların müəyyən bir etibarlılıq səviyyəsində maksimum itkini qiymətləndirməsinə kömək edir. VaR, səhmlərin və digər maliyyə alətlərinin riskini müxtəlif ehtimal səviyyələrində təhlil etməyə imkan verir və üç əsas yanaşma ilə tətbiq olunur: parametrik yanaşma, tarixi simulyasiya və Monte-Karlo simulyasiyası (Hüseynova, 2024, s.123).

Parametrik yanaşma, VaR metodunun ən sadə və ən çox istifadə edilən növüdür. Bu yanaşma, səhmlərin gəlir paylanmasının normal paylanma fərziyyəsinə əsaslanır və gələcəkdəki riskləri qiymətləndirmək üçün bu paylanma təhlil edilir. Parametrik yanaşmada, səhmlərin gəlir paylanması normal paylanma fərziyyəsinə uyğun olaraq qəbul edilir ki, bu da səhmlərin qiymətlərinin simmetrik olaraq paylandığını və təbii olaraq mərkəz ətrafında sıxlaşdığını göstərir (Parametric VAR, thefinanalytics.com).

Tarixi simulyasiya yanaşması, keçmiş məlumatları təhlil edərək bazar şəraitini qiymətləndirir. Bu metod, xüsusən bazar şokları və yüksək volatillik dövrlərində daha etibarlıdır. Keçmiş dövrlərin məlumatları əsasında gələcək riskləri qiymətləndirir, amma yalnız əvvəlki şərtlər əsasında işləyir və yeni bazar şoklarını nəzərə almır.

Monte-Karlo simulyasiyası çoxsaylı simulyasiyalar vasitəsilə ehtimal paylanmalarına əsaslanan risk qiymətləndirmələri təqdim edir. Bu yanaşma, qeyri-normal paylanmaları və bazar şoklarını qiymətləndirməkdə daha faydalıdır, amma çoxsaylı ehtimal ssenariləri və simulyasiyalar proses zamanı zəruri olduğundan, tətbiqi mürəkkəb və zaman tələb edən ola bilər (Kenton, 2024).

## Nəticə

Səhmlərə qoyulan investisiyaların risklərini düzgün qiymətləndirmək və idarə etmək, investorlar üçün mühüm əhəmiyyət kəsb edir. Bu məqsədlə statistik metodlar, investorların riskləri daha dəqiq ölçmələrinə və gələcəkdəki qiymət dəyişikliklərini proqnozlaşdırmalarına kömək edir (Chen, 2024). Bu araşdırmada, risk ölçülməsi üçün istifadə olunan əsas statistik metodlar – standart kənarlaşma və varians analizi, beta əmsalı, və Value-at-Risk (VaR) metodologiyasının tətbiqləri geniş şəkildə izah edilmişdir.

Standart kənarlaşma və varians analizi, səhmlərin qiymət dəyişkənliyini qiymətləndirmək üçün ənənəvi və geniş istifadə olunan üsullardır, investorların portfellərinin risklərini qiymətləndirməkdə mühüm rol oynayır. Beta əmsalı, səhmlərin bazar dəyişikliklərinə necə reaksiya verdiyini ölçərək, bazar riskinin investorlar tərəfindən daha yaxşı başa düşülməsinə kömək edir. VaR metodu isə, investorların mümkün zərərlərini müxtəlif ehtimal səviyyələrində təhlil etməyə imkan verir və risk idarəetməsində əvəzsiz bir alət olaraq qalır.

Bu metodlar, investorların daha məlumatlı və strateji qərarlar almasına imkan tanıyır. Bununla yanaşı, heç bir statistik metod bütün riskləri tamamilə aradan qaldıra bilməz, lakin bu alətlərin düzgün tətbiqi investorlara risklərini minimuma endirmək və sərmayələrini qorumaq üçün effektiv strategiyalar tətbiq etməyə imkan verir.

## Ədəbiyyat

1. Aşurbəyli-Hüseynova, N. (2024). *Maliyyə risklərinin idarə edilməsi.* MSV.
2. Chen, J. (2024). *Risk: What It Means In Investing, How To Measure And Manage It* Investopedia.com. https://www.investopedia.com/terms/r/risk.asp
3. Greiner, S. (2013). *Investment Risk and Uncertainty: Advanced Risk Awareness Techniques for the Intelligent Investor*. Wiley Finance.
4. Hayes, A. (2024). *Portfolio Variance: Definition, Formula, Calculation, and Example* Investopedia.com https://www.investopedia.com/terms/p/portfolio-variance.asp.
5. Hull, J.C. (2015). *Risk Management and Financial Institutions*. Wiley Finance.

6. Kazımlı, X., Quliyev, İ. (2011). *İqtisadi risklərin qiymətləndirilməsi və idarə edilməsi.* İqtisad Universiteti.
7. Kenton, W. (2024). *Understanding Value at Risk (VaR) and how it is computed.* Investopedia.com https://www.investopedia.com/terms/v/var.asp.
8. Kapital Bank. (2023). https://www.kapitalbank.az.bloqlar.maliyye/investisiya-fealiyyeti-nedir.
9. Liberto, D. (2024). *What Beta means When Considering a stock's risk*. Investopedia.com.
10. Meagher, P. (2023). *STD Deviation in Finance: Application and Examples.* Learnsignal.com. https://www.learnsignal.com/blog/standard-deviation-finance-applications-examples/.
11. Parametric Value-at-Risk: *A Quantitative Method to Risk Assessment*. thefinanalytics.com https://www.thefinanalytics.com/post/parametric-approach-for-quantifying-value-at-risk.
12. Soltanova, K. (2018). *Səhmlər, səhm nədir?* Banco.az https://banco.az/az/news/sehmler-sehm-nedir.

Daxil oldu: 28.01.2025
Qəbul edildi: 17.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/165-167

**Suray Ömərova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
https://orcid.org/0009-0001-7735-9041
surayomrova@gmail.com

# Uilyam Şekspirin məşhur pyesləri Azərbaycan səhnəsində


## Xülasə

Azərbaycan teatr tarixinə nəzər yetirdikdə görürük ki, məşhur ingilis dramaturqu Uilyam Şekspirin pyesləri ötən əsrin əvvəllərindən Azərbaycan teatrlarında hazırlanmağa başlanmışdır. İntibah dövrünün görkəmli nümayəndələrindən hesab edilən U.Şekspirin əsərlərində humanizm, azadlıq ideyaları əsas yer tutur. Azərbaycanda keçən əsrin başlanğıcından etibarən U.Şekspirin əsərləri tərcümə edilmişdir və istedadlı aktyorlar tərəfindən səhnədə oynanılmışdır. Keçmişdən günümüzə qədər teatr rejissorlarımız U.Şekspirin əsərlərinə tez-tez müraciət ediblər. Adil İsgəndərov, Mehdi Məmmədov, Tofiq Kazımov, Azər Paşa Nemətov, Vaqif İbrahimoğlu, Bəhram Osmanov U.Şekspirin məşhur pyesləri əsasında maraqlı tamaşalar hazırlayıblar. Dramaturqun əsərləri insan ruhunun dərinliklərinə təsir etdiyinə görə teatr tamaşaçıları üçün maraqlı olmuşdur. Qeyd edə bilərik ki, U.Şekspirin əsərləri bu gün də öz aktuallığı ilə seçilir. Dramaturqun "Maqbet", "Otello", "Romeo və Cülyetta", "On ikinci gecə", "Hamlet", "Kral Lir" kimi pyesləri səhnəmizdə ən çox qoyulan tamaşalardandır. Müasir dövrdə də U.Şekspirin əsərləri əsasında fərqli üslubda tamaşalar hazırlanır və dahi dramaturqun pyesləri teatrlarımızın repertuarını zənginləşdirir.


***Açar sözlər:*** *pyes, dramaturq, teatr tarixi, rejissor, aktyor, humanizm*

**Suray Omarova**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/0009-0001-7735-9041
surayomrova@gmail.com

# William Shakespeare's Famous Plays on the Azerbaijani Stage


## Abstract

When we look at the history of Azerbaijani theatre, we see that the plays of the famous English playwright William Shakespeare began to be staged in Azerbaijani theatres from the beginning of the last century. The ideas of humanism and freedom play a central role in the works of W.Shakespeare, a prominent representative of the Renaissance period. Since the beginning of the last century, the works of W.Shakespeare have been translated and performed on stage by talented actors in Azerbaijan. From the past to the present, our theatre directors have frequently turned to the works of W.Shakespeare. Adil Isgandarov, Mehdi Mammadov, Tofiq Kazimov, Azer Pasha Nematov, Vagif Ibrahimoglu, Behram Osmanov have staged interesting performances based on W.Shakespeare's famous plays. The works of the playwright have been interesting for the theatre audience because they affect the depths of the human soul. We can note that W.Shakespeare's works are still distinguished by their relevance today. The playwright's plays such as "Machbeth", "Othello", "Romeo and Juliet", "Twelfth night", "Hamlet", "King Lear" are among the most frequently staged productions in our theatre. The plays of the great playwright W.Shakespeare continue to be staged in different styles even in modern times and enriching the repertoire of our theatres.


***Keywords:*** *play, playwright, history of theatre, director, actor, humanism*

## Giriş

Dünyaca məşhur olan Uilyam Şekspirin pyesləri Azərbaycan teatrının inkişafına əsaslı təsir etmişdir. Dramaturqun əsərlərinin tərcüməsində ilk olaraq rus dilindən, sonrakı dövrlərdə isə ingilis dilində olan mənbələrdən istifadə olunmuşdur. Azərbaycanda realist teatr üslubunun yaranmasında və formalaşmasında U.Şekspirin əsərləri mühüm yer tutmuşdur. Məşhur teatr aktyorlarımızdan Ələsgər Ələkbərov, Barat Şəkinskaya, Hökümə Qurbanova, Səməndər Rzayev və başqaları dramaturqun tanınmış pyeslərinin uğurlu ifaçılarından idi. Müasir dövrdə Azərbaycan teatrında U.Şekspirin əsərləri rejissorlar tərəfindən eksperimental, modern yanaşmalarla səhnələşdirilir. Rejissorlar dramaturqun qlobal mövzulu əsərlərini cəmiyyətin problemləri ilə əlaqələndirir və aktual məsələləri tamaşa zamanı vurğulamış olurlar.

**Tədqiqat**

U.Şekspirin məşhur "Kral Lir" əsəri 1941-ci ildə Azərbaycan Dövlət Akademik Milli Dram Teatrının səhnəsində tamaşaya qoyulur. Səhnə əsəri Mirzə İbrahimovun tərcüməsi əsasında izləyicilərə təqdim edilmişdi. Monumentallığı ilə seçilən tamaşa realist-psixoloji faciə janrında səhnələşdirilmişdir. Sidqi Ruhulla, Mərziyə Davudova, Ələsgər Ələkbərov, Fatma Qədri, Qəmər Topuriya, Barat Şəkinskaya kimi o dövrün dahi aktyorlarının çıxış etdiyi tamaşanın quruluşçu rejissoru Aleksey Qripiç, rejissoru isə Şəmsi Bədəlbəyli idi. Qeyd edilən "Kral Lir" tamaşası teatr tariximizdə əhəmiyyətli səhnə əsərlərindəndir.

Azərbaycan milli rejissurasında yeni ifadə formalarının, üslubların yarandığı zaman Milli Dram Teatrında "On ikinci gecə" pyesi dahi rejissor Mehdi Məmmədovun quruluşunda 1946-cı ildə tamaşaya hazırlanır. Dövrün məşhur teatr rəssamı Sergey Yefimenko səhnə tərtibatının müəllifi idi. Səhnə əsərinin musiqi bəstəkarı isə Tofiq Quliyev olmuşdur. B.Şəkinskaya, H.Qurbanova, İ.Dağıstanlı, Ə.Sultanov, L.Bədirbəyli kimi aktyor heyətinin olduğu tamaşa teatr ictimaiyyətində hadisəyə çevrilməyi bacarır. Səhnə əsərində rejissor lirik ifadə vasitələrindən geniş istifadə etmişdir. Komik məqamlarla dramatik ünsürlər harmonik şəkildə izləyicilərə təqdim edilirdi (Rəhimli, 2013).

U.Şekspirin dünyanın bir çox teatrlarında səhnələşdirilmiş və müasir dövrdə də toxunduğu mövzulara görə öz aktuallığını qoruyub saxlayan "Otello" əsərinə rejissor Adil İsgəndərov 1949-cu ildə müraciət etmişdir. Teatr tariximixdə monumentallığı ilə seçilən səhnə əsərləri hazırlamış rejissora "Otello" tamaşası böyük uğur gətirir, hətta onu ölkə hüdudlarından kənarda da tanıtmış olur. U.Şekspirin faciəsi əsasında təqdim edilmiş tamaşada baş rol ifaçısı Ələsgər Ələkbərov idi. Tərəf-müqabili, Dezdemona rolunu Barat Şəkinskaya, Yaqo rolunu isə Rza Əfqanlı ifa edirdi. Onların oyun tərzində romantik ruh, həyatilik, lirizm öz əksini tapmışdı. Adil İsgəndərovun dahi bəstəkar Qara Qarayevlə, istedadlı rəssamlar Nüsrət Fətullayev və Bədurə Əfqanlıyla birgə əməkdaşlığı nəticəsində ərsəyə gəlmiş "Otello" teatr mədəniyyətimizdə xüsusi yer tutmuşdur. Adil İsgəndərovun quruluşunda "Otello" daxili həqiqəti və realizmi ilə seçilirdi.

Tofiq Kazımovun rejissurasında U.Şekspirin əsərləri tamamilə yeni üslubda təqdim edilir. Rejissor məşhur "Antoni və Kleopatra" pyesini 1964-cü ildə Milli Dram Teatrının səhnəsində tamaşaya hazırlayır. Ümumiyyətlə bu əsər siyasi motivləri özündə barındırmasına, mürəkkəb quruluşuna, dramatizminə görə dramaturqun digər pyeslərindən olduqca fərqlənir. Məhəbbət və hakimiyyət xətləri əsərdə paralel şəkildə inkişaf edir. Tofiq Kazımovun bu tamaşasında baş rolları Hökümə Qurbanova və Əli Zeynalov ifa etmişdir. Onların personajları təbiiliyi ilə, həyatiliyi ilə seçilirdi. Tamaşanın səhnə tərtibatında minimalizm hökm sürürdü. Səhnədə tamaşa zamanı səsləndirilən musiqilərdə qərb və şərq musiqilərinin elementlərindən istifadə edilmişdi. Tamaşanın musiqi tərtibatı Qara Qarayevə aid idi. Səhnə əsərinin rəssamı Tahir Salahov isə tamaşanın obrazlarına diqqəti yönəldən geyim, tərtibat yaratmışdı. "Antoni və Kleopatra" tamaşasında səhnə əsərinin rejissoru Tofiq Kazımovun, bəstəkar Qara Qarayevin və rəssam Tahir Salahovun əməkdaşlığı uğurlu alınmışdı.

Tofiq Kazımov 1968-ci ildə U.Şekspirin ən məşhur pyeslərindən hesab edilən "Hamlet" əsərini tamaşaya hazırlayır. Səhnə əsərində Hamlet rolunun ifaçısı isə dahi aktyor Həsən Turabov idi. Onunla birgə sözügedən səhnə əsərində Ə.Zeynalov, Ş.Məmmədova, A.Pənahova, S.Rzayev və digər aktyorlar iştirak edib. Həsən Turabovun ifasında Hamlet mürəkkəb, ürkək, tərəddüd keçirən, lakin

iradəli, dözümlü gənc kimi təqdim edilir. Aktyorun səsləndirdiyi monoloqda Hamletin mübarizədə dönməz, inadcıl və iradəli olması öz əksini tapmışdı (Rəhimli, 2013).

Müasir dövr Azərbaycan teatrında Vaqif İbrahimoğlunun 2002-ci ildə YUĞ Teatrında hazırladığı "Otello" tamaşası öz quruluşu ilə seçilirdi. Səhnədə sadəcə üç personaj var idi. Bunlardan Otello rolunun ifaçısı Məmmədsəfa Qasımov, Dezdemona rolunun ifaçısı Yaqut Paşazadə, Yaqo rolunun ifaçısı isə Qasım Nağıydı. Tamaşa eyni zamanda üç dinin kəsişməsi kimi də yozulurdu. Bu tamaşa da öz fərqli və orijinal yozumu ilə teatr camiəsində xüsusi yer tutur.

Rejissor Azər Paşa Nemətovun 2002-ci ildə hazırlamış olduğu "Hamlet" tamaşası onun ən uğurlu tamaşalarından hesab edilir. U.Şekspirin əsəri əsasında hazırlanmış tamaşada baş rolu Fuad Poladov canlandırırdı. Minimalist səhnə tərtibatında seyrçilərə təqdim edilmiş tamaşada Sənubər İsgəndərli, Rafael Dadaşov, Səyavuş Aslan kimi istedadlı aktyorlar iştirak edirdi. Fuad Poladovun Hamleti lirik hissləri olan məsum gənc idi. Tamaşa Akademik Milli Dram Teatrının səhnəsində uzun müddət nümayiş olundu.

2019-cu ildə rejissor Gümrah Ömər Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin aktyor sənəti üzrə təhsil alan tələbələri ilə birgə U.Şekspirin "Otello" pyesi əsasında "Otello əfsanəsi" tamaşasını hazırlayır. Bu tamaşa ilə heyət Rusiyanın incəsənət universitetlərindən olan VQİK və QİTİS-in təşkil etdiyi festivallarda mükafatlar qazanmışdır. Mistik ballada janrında təqdim edilmiş səhnə əsərində rejissor postdramatik teatr elementlərindən istifadə etmişdir. Tamaşanın bəzi hissələrində müasir dövrə uyğunlaşmalar da var idi. "Otello əfsanəsi" teatr ictimaiyyəti tərəfindən uğurlu səhnə işi hesab edildi.

## Nəticə

Dahi Şekspir ümumbəşəri və hər dövrə xitab edən mövzulara toxunduğu üçün onun əsərləri bu gün də öz aktuallığını qorumuş və saxlamışdır. Azərbaycan teatrında böyük bir aktyor və rejissor nəslinin formalaşmasında U.Şekspirin dramaturgiyası böyük rol oynayıb. Müasir dövrdə gənc rejissorlarımız və aktyorlarımız U.Şekspirin dramaturgiyasına böyük maraqla yanaşır. Bu da o deməkdir ki, dahi Şekspirin əsərləri hələ uzun müddət teatrların səhnəsində nümayiş ediləcəkdir.

## Ədəbiyyat

1. Əlizadə, M. (2008). *Dördüncü ölçünün rənləri.* El nəşriyyatı.
2. Məmmədli, Y.Ə. (1999). *Rejissorlarla üz-üzə…* Araz nəşriyyatı.
3. Rəhimli, İ. (2013). *Azərbaycan Dövlət Akademik Milli Dram Teatrı. Üç cilddə II-ci cild.* Təhsil.
4. Rəhimli, İ. (2002). *Azərbaycan milli teatrının poetikası.* Qapp-Poliqraf.
5. Rəhimli, İ. (2004). *Azərbaycan teatrının estetik prinsipləri.* Çaşıoğlu.
6. Rəhimli, İ. (2005). *Azərbaycan teatr tarixi.* Çaşıoğlu.
7. Rəhimli, İ. (1984). *Dramaturgiya və teatr.* İşıq.
8. Rəhimli, İ. (2013). *Səhnəyə qovuşan cığırlar (Səhnə korifeyləri. 120 portret-oçerk).* Aspoliqraf.
9. Rəhimli, İ. (2010). *Zaman zaman içində (Vaqif İbrahimoğlu haqqında).* Mütərcim.
10. Talıbzadə, A. (2009). *Mehdi müəmması və ya sənətdə konseptual hamletizm.* Elm və Təhsil.
11. Talıbzadə, A. (2015). *Teatral freskalar.* Elm və Təhsil.
12. Vəliyev, Ə. (2009). *Əqidə, Ruh və Teatr.* Stil Matbaacilik.

Daxil oldu: 30.01.2025
Qəbul edildi: 14.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/168-171

**Aytac Hadızadə**
Xəzər Universiteti
magistrant
https://orcid.org/0009-0002-7058-5473
asleymanli@mail.ru

# Mebel şirkətlərinin sosial media fəaliyyətlərində illər üzrə dəyişmələrin müqayisəli təhlili

## Xülasə

Son illərdə rəqəmsal transformasiya və istehlakçı davranışlarında baş verən dəyişikliklər fonunda mebel sektorunda fəaliyyət göstərən şirkətlərin sosial mediada aktivliyi strateji önəm kəsb etməyə başlamışdır. Bu tədqiqatda əsas məqsəd mebel şirkətlərinin sosial media fəaliyyətlərinin 2015-2025-ci illər ərzində necə dəyişdiyini, hansı tendensiyaların müşahidə olunduğunu və bu dəyişikliklərin şirkətlərin marketinq və brend idarəçiliyi üzərində hansı təsirləri yaratdığını müqayisəli şəkildə təhlil etməkdir. İlkin mərhələdə, 2015-2018-ci illərdə mebel şirkətləri sosial medianı əsasən məhsul şəkillərinin yerləşdirilməsi, endirim kampaniyalarının paylaşılması və məhdud müştəri qarşılıqlı əlaqələri üçün istifadə edirdi. Bu dövrdə kontent sadə, bəzən isə qeyri-strukturlaşdırılmış idi və sosial media daha çox informasiya ötürmə vasitəsi kimi xidmət edirdi. 2019-2021-ci illərdə isə sektorda rəqəmsal brendləşmə meyilləri güclənməyə başladı. Instagram, Facebook və YouTube kimi platformalarla yanaşı TikTok və Pinterest kimi vizual kontent əsaslı şəbəkələrə inteqrasiya artdı. Kontentin vizual keyfiyyəti və dizayn dəyərləri yüksəldi.

***Açar sözlər:*** *rəqəmsal marketinq strategiyaları, sosial media inkişaf dinamikası, istehlakçı davranışları və trendlər, brend idarəçiliyi və vizual kimlik, interaktivlik və analitik alətlər*

**Aytaj Hadizadeh**
Khazar University
Master student
https://orcid.org/0009-0002-7058-5473
asleymanli@mail.ru

# Comparative Analysis the Changes of Furniture Companies' in Social Media Activities Over the Years

## Abstarct

In recent years, the social media activity of companies operating in the furniture sector has begun to assume strategic importance against the backdrop of digital transformation and changes in consumer behavior. The main objective of this study is to comparatively analyze how the social media activities of furniture companies have changed over the years 2015-2025, what trends have been observed, and what effects these changes have had on the marketing and brand management of companies. In the initial stage, in 2015-2018, furniture companies used social media mainly for posting product images, sharing discount campaigns, and limited customer interactions. During this period, the content was simple and sometimes unstructured, and social media served more as a means of transmitting information. In 2019–2021, digital branding trends began to strengthen in the sector. In addition to platforms such as Instagram, Facebook, and YouTube, integration with visual content-based networks such as TikTok and Pinterest has increased. The visual quality and design values of the content have increased.

***Keywords:*** *digital marketing strategies, social media development dynamics, consumer behavior and trends, brand management and visual identity, interactivity and analytical tools*

## Giriş

Müasir dövrdə sosial media platformaları bizneslər üçün yalnız kommunikasiya vasitəsi deyil, həm də strateji marketinq alətinə çevrilmişdir. Xüsusilə mebel sənayesi kimi vizual təqdimatın böyük rol oynadığı sahələrdə sosial medianın əhəmiyyəti daha da artmaqdadır (Provoke Insights, 2024, s.19). İstifadəçilərin gündəlik həyatında sosial şəbəkələrin dominant mövqeyə sahib olması mebel şirkətlərini bu sahəyə daha çox resurs ayırmağa və rəqəmsal platformalarda güclü iştirak göstərməyə vadar etmişdir. Texnologiyanın sürətli inkişafı, platformaların funksional imkanlarının genişlənməsi və istehlakçıların davranış meyillərinin dəyişməsi bu şirkətlərin sosial mediada fəaliyyət strategiyalarını hər il təkmilləşdirməsinə səbəb olmuşdur. Bu kontekstdə, illər üzrə sosial media fəaliyyətlərində baş verən dəyişiklikləri təhlil etmək mebel sektorunun kommunikasiya strategiyalarındakı təkamülü anlamaq baxımından mühüm əhəmiyyət daşıyır. Eyni zamanda, bu mövzu çərçivəsində diqqət yetirilən əsas istiqamətlərdən biri də sosial medianın brend imicinə təsiri və auditoriya ilə emosional bağ qurmaq imkanlarıdır (Zhang, Zhu, Wang, Reng, Yan, 2022, s.23). Mebel şirkətləri üçün yalnız məhsulun keyfiyyəti deyil, onun təqdimat forması və müştəri ilə qurulan interaktiv əlaqə də satışlara və uzunmüddətli brend loyallığına birbaşa təsir göstərir. Bu baxımdan, sosial media fəaliyyətlərinin illər üzrə necə dəyişdiyini izləmək, yalnız texnoloji baxımdan deyil, həm də strateji idarəetmə və marketinq baxımından önəmlidir.

**Tədqiqat**

Tədqiqatda müxtəlif zaman kəsiklərində tətbiq olunan məzmun növləri, paylaşım tezliyi, platforma seçimləri və auditoriya reaksiyaları analiz edilərək dəyişikliklərin ardıcıllığı ortaya qoyulur. Həmçinin bu dəyişikliklərin səbəbləri – texnologiyanın yenilənməsi, rəqabətin güclənməsi, istehlakçı gözləntilərinin artması və pandemiya kimi xarici faktorların rolu ayrıca qiymətləndirilir. Ümumilikdə bu mövzu, mebel sənayesində fəaliyyət göstərən şirkətlərin rəqəmsal məkanlarda necə fərqləndiyini, hansı üsullarla auditoriya cəlb etdiyini və illər üzrə dəyişən strategiyaların uğur dərəcəsini anlamaq üçün əhəmiyyətli əsas yaradır. Tədqiqat nəticələri həm nəzəri, həm də praktik kontekstdə şirkətlər üçün yönəldici rol oynaya bilər (Miquido, 2024, s.46).

Rəqəmsal Platformalarda Mebel Şirkətlərinin Aktivliyinin Transformasiyası. Qlobal texnoloji inkişaf və istifadəçi davranışlarında baş verən dəyişikliklər nəticəsində biznes strukturlarının rəqəmsal məkana adaptasiyası zərurətə çevrilmişdir. Bu proses təkcə texnoloji keçid deyil, həm də strateji və funksional transformasiyadır. Mebel sektoru isə bu dəyişimin vizual və emosional yönlərinin daha qabarıq göründüyü sahələrdən biridir. Məhz bu səbəbdən rəqəmsal platformalarda fəaliyyət göstərmək, yalnız informasiyanın ötürülməsi deyil, eyni zamanda dəyərlərin paylaşılması, istifadəçi təcrübəsinin yaradılması və marka identifikasiyasının gücləndirilməsi anlamına gəlir. Mebel şirkətləri üçün rəqəmsal platformalar – sosial şəbəkələr, veb saytlar, onlayn kataloqlar və reklam menecment sistemləri – satış və tanıtım kanallarını genişləndirməklə yanaşı, istehlakçı ilə iki istiqamətli ünsiyyət imkanı yaradır (İsmayılov, 2020; Quliyev, 2018). Bu isə ənənəvi marketinqdən fərqli olaraq dinamik və çevik yanaşma tələb edir. Artıq təkcə məhsulu nümayiş etdirmək kifayət etmir; müştəri ilə real zamanlı qarşılıqlı əlaqə, vizual cəlbedicilik və fərdi təkliflərin təqdim olunması zəruridir. Bu tədqiqat, mebel sektorunda fəaliyyət göstərən şirkətlərin illər ərzində rəqəmsal platformalarda hansı mərhələlərdən keçdiyini və bu keçidin biznes nəticələrinə necə təsir etdiyini araşdırır (IBISWorld, 2025, s.81).

Eyni zamanda, rəqəmsal aktivliyin təkamülünü müəyyən etmək üçün şirkətlərin müxtəlif dövrlərdə istifadə etdiyi texnologiyalar, məzmun növləri və platforma strategiyaları müqayisəli şəkildə təhlil edilir. Bu yanaşma, sektorda baş verən rəqəmsal transformasiyanın mahiyyətini və davamlı inkişaf perspektivlərini anlamağa imkan verir. Bu transformasiya təkcə texnoloji vasitələrin dəyişməsi ilə məhdudlaşmır; eyni zamanda mebel şirkətlərinin biznes modelində, müştəriyə yanaşmasında və brend dəyərinin formalaşdırılmasında əsaslı dəyişikliklər baş vermişdir. Rəqəmsal platformalar şirkətlərə daha geniş auditoriyaya çatmaq, bazar rəqabətində önə çıxmaq və istehlakçıların ehtiyaclarına daha çevik reaksiya vermək imkanı yaratmışdır. Bu imkanlardan effektiv istifadə edən şirkətlər fərqlənərək sektorda lider mövqelərini möhkəmləndirmişlər.

**Cədvəl 1.** 2015-2025-ci illərdə mebel şirkətlərinin sosial media aktivliyinin dinamikası

| İl | Aktiv sosial media hesabı olan şirkətlərin nisbəti (%) | Orta aylıq paylaşım sayı | İzləyici artımı (%) | Video kontent istifadəsi (%) | İnteqrativ kampaniya sayı |
|---|---|---|---|---|---|
| 2015 | 32% | 5 | 4% | 12% | 2 |
| 2017 | 48% | 9 | 8% | 25% | 5 |
| 2019 | 63% | 14 | 12% | 38% | 9 |
| 2021 | 78% | 18 | 20% | 56% | 14 |
| 2023 | 86% | 21 | 27% | 72% | 19 |
| 2025 (proqnoz) | 92% | 25 | 33% | 81% | 25 |

**Mənbə:** IBISWorld. (2025). Furniture stores in the US - Market research report (2015–2030). https://www.ibisworld.com/united-states/industry/furniture-stores/1016/

Bu cədvəl 2015-2025-ci illər ərzində mebel şirkətlərinin sosial media üzərində fəaliyyət göstəricilərində baş verən dəyişiklikləri əks etdirir. İlkin mərhələlərdə (2015-2017) sosial media aktivliyi nisbətən zəif olmuş, paylaşım sayı və izləyici artımı aşağı səviyyədə qalmışdır. 2019-cu ildən etibarən sosial media platformalarına inteqrasiya və rəqəmsal marketinqə yönəlik strategiyalar artmış, bu isə həm paylaşım tezliyinə, həm də izləyici artımına təsir göstərmişdir. Xüsusilə video kontent istifadəsinin payı 2021-ci ildən sonra ciddi şəkildə yüksəlmişdir ki, bu da vizual təqdimatın və interaktivliyin əhəmiyyətinin artması ilə əlaqəlidir. Eyni zamanda inteqrativ kampaniyaların sayı artaraq brendin çoxplatformalı idarə edilməsinin ön plana keçdiyini göstərir. 2025-ci ilə dair proqnozlar bu artımın davamlı olacağını və rəqəmsal platformalarda iştirakın artıq mebel sektorunda standart strategiyaya çevriləcəyini göstərir.

Rəqəmsal platformaların sürətlə inkişafı ilə birlikdə mebel sənayesində fəaliyyət göstərən şirkətlər daha geniş auditoriyalara çıxış əldə etmiş, kommunikasiya imkanlarını yeni səviyyəyə yüksəltmişlər. Ənənəvi reklam vasitələrindən fərqli olaraq, sosial media kanalları vasitəsilə müştəri ilə birbaşa, tez və qarşılıqlı əlaqəyə əsaslanan ünsiyyət formalaşmışdır. Bu isə şirkətlərə yalnız məhsul təqdimatı deyil, həm də brendin hekayəsini anlatmaq, müştəri fikirlərinə cavab vermək və sadiqlik yaratmaq üçün zəmin yaratmışdır (Wolfenden, 2023, s.19; Chaffey, 2009). Mebel sektoru vizual estetikanın ön planda olduğu sahələrdən biridir və bu səbəbdən sosial media məzmunlarının keyfiyyəti, dizayn dili və vizual təqdimat forması satış strategiyalarında həlledici rol oynamağa başlamışdır. Şirkətlər arasında fərqlənmə artıq yalnız məhsul çeşidi ilə deyil, həm də kontent yaratma bacarığı ilə müəyyən olunur. Rəqabət üstünlüyü əldə etmək üçün innovativ təqdimat formalarına – 3D turlar, animasiyalar, istifadəçi təcrübələrinə əsaslanan videolar və interyer dizayn simulyasiyalarına üstünlük verilir (Dinath, 2019, s.28).

## Nəticə

Araşdırmalar göstərir ki, mebel şirkətləri üçün sosial media platformalarında aktivliyin transformasiyası sadəcə texnoloji dəyişiklik deyil, eyni zamanda strateji yenilənmə və kommunikasiya modelində əsaslı dəyişikliyin göstəricisidir. 2015-2025-ci illər ərzində bu şirkətlərin sosial mediadan istifadə formaları təkamül edərək, passiv təqdimatdan interaktiv və analitik əsaslı marketinq yanaşmalarına keçid etmişdir. Əvvəlki illərdə sadə məhsul şəkilləri və elanlara əsaslanan paylaşımlar üstünlük təşkil edirdisə, son dövrlərdə kontent strategiyaları daha məqsədli, fərdiləşdirilmiş və vizual baxımdan yüksək keyfiyyətli formaya keçmişdir. Bu dəyişiklik, istifadəçilərin artan gözləntiləri və platforma alqoritmlərinin yenilənməsi ilə paralel şəkildə inkişaf

etmişdir. Xüsusilə video məzmunların, real vaxtda qarşılıqlı əlaqələrin və çoxkanallı kampaniyaların artması rəqəmsal transformasiyanın başlıca elementləri olmuşdur. Bundan əlavə, rəqəmsal platformalarda toplanan məlumatların təhlili şirkətlərə daha dəqiq qərarlar verməyə, bazar ehtiyaclarına tez reaksiya göstərməyə və məhsul təkliflərini çevik şəkildə formalaşdırmağa imkan yaratmışdır. Beləliklə, sosial media artıq yalnız reklam vasitəsi deyil, strateji idarəetmənin və brend formalaşdırmanın ayrılmaz hissəsinə çevrilmişdir.

## Ədəbiyyat

1. Chaffey, D. (2009). *E-Business and E-Commerce Management: Strategy, implementation and practice*. 4th ed. Essex: Prentice Hall.
2. Cheptea, A., & Réquillart, V. (2019). The role of trade in the development of the global value chain: A framework for analysis. *Journal of Economic Surveys*, 33(1), 229-250. https://doi.org/10.1111/joes.12305
3. Dinath, W. (2019). The use of social media strategies to enhance consumer engagement in a small furniture-manufacturing organisation. *The International Journal of Multi-Disciplinary Research.* https://www.researchgate.net/publication/331277206_The_Use_of_Social_Media_Strategies_to_Enhance_Consumer_Engagement_in_A_Small_Furniture-Manufacturing_Organisation
4. Dinson. (2017). *Dinsons Fine Furniture. Available from*: http://www.dinsons.co.za/ (Accessed: 5 March 2017).
5. IBISWorld. (2025). *Furniture stores in the US - Market research report* (2015–2030). https://www.ibisworld.com/united-states/industry/furniture-stores/1016/
6. İsmayılov, R. (2020). Ticarət siyasətləri və onların iqtisadiyyata təsiri. *İqtisadiyyat elmləri üzrə elmi məqalələr*, 12(3), 45-58.
7. Quliyev, E. (2018). Beynəlxalq ticarət axınlarının analizi: müasir yanaşmalar. *Bakı Dövlət Universitetinin Xəbərləri*, 64(2), 103-110.
8. Miquido. (2024). *Top furniture eCommerce trends*: AI, AR & more. https://www.miquido.com/blog/furniture-ecommerce-trends/
9. Mion, G., & Zhu, S. C. (2020). International trade and regional disparities: Evidence from Chinese cities. *The Economic Journal*, 130(631), 1610-1642. https://doi.org/10.1111/ecoj.12666
10. Provoke Insights. (2024). Furniture trends & consumer buying behaviors. https://provokeinsights.com/wp-content/uploads/2024/11/Provoke-Insights_FALL2024_Furniture-11.4.pdf
11. Wolfenden. (2023). The trends that matter: Home furnishings. https://wolfenden.agency/insights/report-the-trends-that-matter-home-furnishings/
12. Zhang, S., Zhu, J., Wang, G., Reng, S., & Yan, H. (2022). Furniture online consumer experience. *A literature review. BioResources*, 17(1), 1627–1642. https://bioresources.cnr.ncsu.edu/resources/furniture-online-consumer-experience-a-literature-review/

Daxil oldu: 10.02.2025
Qəbul edildi: 23.05.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 5 / 172-175
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 5 / 172-175 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/45/172-175

**Ləman Sultanlı**
Azərbaycan Universiteti
magistrant
https://orcid.org/0009-0000-8753-2373
lemansultan1@gmail.com

# İdarəetmə mexanizmləri çərçivəsində maliyyə nəticələrinin rolu

## Xülasə

Bu məqalə müəssisənin fəaliyyətində maliyyə nəticələrinin formalaşması və idarəedilməsi üsullarının öyrənilməsinə həsr olunmuşdur. Araşdırmada müəssisənin gəlir və xərcləri əsasında formalaşan maliyyə nəticələrinin təsnifatı, onların təhlili və idarəetmə prosesinə təsiri araşdırılmışdır. Eyni zamanda, gəlirlilik göstəricilərinin təyini və bu göstəricilər vasitəsilə müəssisənin iqtisadi səmərəliliyinin qiymətləndirilməsi məsələləri ön plana çəkilmişdir. İş zamanı büdcə planlaşdırılması, xərclərə nəzarət və mənfəətin optimallaşdırılması kimi istiqamətlərdə müasir maliyyə idarəetmə üsullarının əhəmiyyəti göstərilmişdir. Tədqiqatda həm inkişaf etmiş, həm də inkişaf etməkdə olan ölkələrin təcrübələri müqayisəli şəkildə təhlil olunmuşdur. Nəticələr müəssisə daxilində maliyyə qərarlarının qəbuluna və strateji idarəetmənin formalaşmasına töhfə verə bilər.

***Açar sözlər:*** *maliyyə nəticəsi, gəlirlilik, büdcə planlaşdırması, xərclər, mənfəət, analiz*

**Laman Sultanli**
Azerbaijan University
Master student
https://orcid.org/0009-0000-8753-2373
lemansultan1@gmail.com

# The Role of Financial Results in the Framework of Management Mechanisms

## Abstract

This dissertation focuses on the development and administration of financial outcomes in activities of enterprise. The classification of financial results based on the enterprise's revenues and costs, their analysis, and the influence on the management process of enterprise are investigated. Furthermore, the definition of profitability indicators and how to assess an economic efficiency of enterprise using these indicators are discussed. The research underlines the relevance of current financial management techniques such as budgeting, cost control, and profit maximization. A comparative comparison of the experiences of industrialized and developing nations is also carried out. The insights may help to shape business decision-making processes and strategic management.

***Keywords:*** *financial results, profitability, budget planning, cost, profit, analysis*

## Giriş

Müasir dövrdə müəssisələrin rəqabət qabiliyyətini və davamlı inkişafını təmin edən əsas amillərdən biri də onların maliyyə fəaliyyətidir. Maliyyə nəticələrinin düzgün formalaşması və idarə olunması müəssisənin uzunmüddətli məqsədlərinə çatmasında vacib rol oynayır. Bu baxımdan, maliyyə göstəricilərinin təhlili, gəlirlilik dərəcəsinin hesablanması və büdcə siyasətinin düzgün qurulması zəruridir. Tədqiqat işində məhz bu aspektlər diqqət mərkəzinə gətirilmiş, müxtəlif idarəetmə üsulları və maliyyə planlaşdırma alətləri öyrənilmişdir. Mövzunun aktuallığı ondan ibarətdir ki, sürətlə dəyişən iqtisadi mühitdə müəssisələr maliyyə sabitliyini yalnız effektiv idarəetmə ilə təmin edə bilirlər.

 

**Tədqiqat**

Maliyyə nəticələri vacibdir, çünki müəssisənin hərəkətlərini və uğurlarını təyin edən idarəetmə mexanizminin əsasını təşkil edir. Bu nəticələr müəssisənin gələcək fəaliyyət istiqamətlərini müəyyənləşdirməkdə rəhbərliyə yol göstərici olur (Abdullayev, 2018). Nəticədə menecerlər maliyyə nəticələrinə çox diqqət yetirməli və onları idarəetmə əməliyyatları üçün əsas rolunu oynayan bir qaynaq hesab etməlidirlər (Qasımov, 2020; Shong, Zhang, 2013). Hər bir korporativ strukturda qərar qəbuletmə fəaliyyəti maliyyə vəziyyətindən asılı olmayaraq davam edə bilər. Lakin bir şirkətin maliyyə sabitliyi onun maliyyə potensialı ilə müəyyən edilir. Bu imkanlar bütün maliyyə öhdəliklərinin vaxtında yerinə yetirilməsini təmin edir (İsmayılov, 2019). Şirkət öhdəliklərini vaxtında ödəyə bilmirsə, bu onun düzgün fəaliyyət göstərə bilmədiyinin göstəricisidir. Müəssisə iqtisadi subyekt kimi əlavə dəyərin formalaşmasını təmin edən və bu dəyərin paylaşdırılması funksiyasını yerinə yetirən bir təşkilatdır. Bu prosesdə pul gəlirləri və xərcləri müqayisə olunur. Şirkət daxilində xərclər və ümumi pul gəliri arasındakı fərq maliyyə mənbələrini təmsil edir (Əliyev, 2021). Aşağıda göstərilən amillər, maliyyə nəticələrinin idarəetmə mexanizminin təməl elementi kimi qəbul olunmasının əsas səbəblərini təşkil edir:

1. Fəaliyyətin qiymətləndirilməsi - maliyyə nəticələri müəssisənin cari və əvvəlki dövrlərdəki fəaliyyətinin obyektiv şəkildə qiymətləndirilməsi üçün əsas məlaumat bazasını təşkil edir. Bu məlumatlar əsasında rəhbərlik mövcud nəticələri təhlil edir və fəaliyyətin səmərləliliyi barədə ətraflı fikir formalaşdırır.

2. Strateji planlaşdırma və proqnozlaşdırma – maliyyə nəticələri gələcək fəaliyyətin planlaşdı-rılamsı və müəssisənin uzunmüddətli hədəflərinin müəyyənləşdirilməsi baxımından mühüm informasiya rolunu oynayır. Bu göstəricilər, strateji qərarların hazırlanmsı və resurların səmərəli idarə olunması üçün əsaslı baza yaradır.

3. Maliyyə fəaliyyətinin təhlili - maliyyə hesabatlarında əks olunan məlumatlar şirkətlərin gəlirləri, xərcləri, investisiya paylanması və ümumi maliyyə göstəriciləri haqqında dolğun informasiya verir. Bu məlumatlar əsasında müəssisənin maliyyə dayanıqlığı və fəaliyyət səmərəliliyi qiymətləndirilir, həmçinin inkişaf istiqamətləri müəyyənləşdirilir.

4. Maliyyə göstəricilərinin təhlili və izahı – maliyyə nəticələrinin təhlili rəhbər heyətə və digər maraqlı tərəflərə göstəricilər arasındakı qarşılıqlı əlaqələri müəyyənləşdirməyə, mümkün riskləri öncədən dəyərləndirməyə və daha əsaslandırılmış qərarlar qəbul etməyə imkan verir.

Maliyyə nəticələri müəssisənin fəaliyyət göstəriciləri ilə idarəetmə strukturlarının səmərəliliyi arasında birbaşa əlaqənin mövcudluğunu göstərir. Menecerlər və qərar qəbul edən şəxslər bu nəticələrə əsaslanaraq strateji qərarlar verir, əməliyyatlara nəzarət edir və müəssisənin inkişaf səviyyəsini qiymətləndirirlər. Aşağıda maliyyə göstəricilərinin idarəetmə mexanizmi çərçivəsində əsas funksiyalarından bəziləri təqdim olunur:

1. Fəaliyyətin qiymətləndirilməsi: Maliyyə göstəriciləri – gəlir, xərc, kredit, aktiv və öhdəliklər – müəssisənin maliyyə vəziyyətini əks etdirən əsas məlumat mənbəyi kimi çıxış edir. Bu göstəricilər vasitəsilə müəssisənin mənfəəti, borc yükü və ümumi maliyyə sabitliyi müəyyən olunur.

2. Strateji qərarların qəbuluna dəstək: Menecerlər strateji istiqamətlərin müəyyənləşdirilməsində maliyyə göstəricilərinə əsaslanırlar. Bu göstəricilər gəlirin artırılması, xərclərin optimallaşdırılması və potensial investisiyaların dəyərləndirilməsi üçün əsas rol oynayır.

3. Maliyyə nəzarətinin təmin edilməsi: Dəqiq və şəffaf maliyyə məlumatları idarəetmədə nəzarət funksiyasının həyata keçirilməsində əvəzsizdir. İdarəçilər bu göstəriciləri analiz edərək əməliyyatların müəyyən edilmiş məqsədlərə və meyarlara uyğunluğunu təmin edirlər.

4. Planlaşdırma və büdcələmə: Maliyyə nəticələri gələcək fəaliyyətlərin planlaşdırılması, büdcələrin hazırlanması və uzunmüddətli maliyyə məqsədlərinin müəyyən olunması baxımından əsas vasitə kimi çıxış edir (Məmmədov, 2020; Shensveen, 2016). Müəssisənin mövcud maliyyə vəziyyəti nəzərə alınaraq effektiv planlaşdırma həyata keçirilir.

5. Maliyyə tərəfdaşlıqlarının möhkəmləndirilməsi: Şirkətin maliyyə vəziyyəti və əldə etdiyi nəticələr investorlara, banklara, səhmdarlara və strateji tərəfdaşlara inam yaratmaq baxımından həlledici rol oynayır. Bu göstəricilər əməkdaşlıq üçün mühüm zəmin yaradır.

6. Səmərəliliyin və idarəetmə keyfiyyətinin artırılması: Maliyyə nəticələri təşkilatın ümumi fəaliyyətinin optimallaşdırılması və idarəetmə mexanizmlərinin təkmilləşdirilməsi üçün ən vacib informasiya mənbəyidir (Maliyyə konsaltinqi nədir, 2024; Voshles, 2012). Bu nəticələrin təhlili müəssisəyə düzgün qərarlar verməyə və idarəetməni daha effektiv təşkil etməyə imkan verir.

Büdcə planlaşdırması çərçivəsində müəssisənin müxtəlif struktur bölmələri üçün aşağıdakı hədəflər müəyyən olunur:

- məhsuldar olmayan xərclərin azaldılması,
- plan göstəricilərinin artırılması,
- resurslara qənaət edilməsi,
- xərclərə effektiv nəzarət tədbirlərinin tətbiqi.

Həmçinin büdcə planlaşdırması işçilərə xüsusi üstünlüklər verən əmək haqqı sisteminə uyğun şəkildə təşkil olunur və struktur bölmələrinin müstəqil şəkildə vəsaitlərdən istifadə etməsinə şərait yaradır. Büdcələr hər ay tərtib olunur və xərclər, vergilər, gəlirlər və digər göstəricilər əsasında müəyyənləşdirilir. Bu isə maliyyə mənbələrinin daha səmərəli və qənaətli istifadəsinə xidmət edir.

Maliyyə nəticələrinin qiymətləndirilməsində istifadə olunan mənfəət göstəriciləri iki əsas kateqoriyaya bölünür: mütləq və nisbi göstəricilər.

- Mütləq mənfəət göstəriciləri müəssisənin maliyyə-təsərrüfat fəaliyyətinin iqtisadi səmərəliliyini əks etdirir.
- Nisbi mənfəət göstəriciləri isə gəlirlilik səviyyəsini (mənfəətliliyi) göstərir və müəssisənin maliyyə sağlamlığı barədə obyektiv qiymətləndirmə aparmağa imkan verir.

Bu göstəricilər, müəssisənin fəaliyyətində maraqlı olan bütün tərəflər — səhmdarlar, investorlar, idarəçilər və dövlət orqanları üçün əhəmiyyətli məlumatlar təqdim edir. Mənfəət göstəriciləri müəssisənin iqtisadi imkanlarını və inkişaf potensialını müxtəlif aspektlərdən əks etdirməklə strateji qərarların qəbulunda əsas rol oynayır. İqtisadi ədəbiyyatda gəlirlilik göstəricilərinin hesablanması üçün müxtəlif metodlar təqdim olunur. Bu metodlar, analitik və idarəetmə baxımından yaranan çətinliklərə uyğun olaraq geniş spektrdə göstəricilərin istifadə edilməsinə imkan verir. Gəlirliliyin ölçülməsi müəssisənin ümumi maliyyə sağlamlığını qiymətləndirmək və gələcək fəaliyyətləri planlaşdırmaq baxımından mühüm əhəmiyyət daşıyır. Mənfəət göstəricilərinin hesablanmasına bir neçə yanaşma mövcuddur. Ən çox istifadə olunan göstəricilər bunlardır: Məhsul satışından əldə olunan mənfəət; açıq mənfəət; vergi öncəsi mənfəət; kredit faizləri öncəsi mənfəət; iqtisadi mənfəət (vergi öncəsi mənfəət); xalis mənfəət.

Bu göstəricilərin hesablanmasında istifadə olunan kəsirin məxrəcinə şirkətin ümumi aktivləri, özəl kapitalı, borcları, dövriyyə kapitalı, əsas vəsaitlər və digər maliyyə resursları daxil ola bilər. Gəlirlilik göstəricilərinin müxtəlif formaları, onların modifikasiyası və təhlili müəssisənin maliyyə və əməliyyat strukturlarının mürəkkəbliyi ilə əlaqədardır (Maliyyə nəticələri, 2018; Porter, 1996). Bu isə nəticələrin dəqiq interpretasiyasını çətinləşdirə bilər. Təcrübədə maliyyə hesabatları əsasında əldə edilən gəlirlilik göstəriciləri əsasən aşağıdakı kateqoriyalara bölünür:

- Ümumi kapitalın gəlirliliyi (ROA - Return on Assets): Vergi öncəsi mənfəətin müəssisənin orta illik aktivlərinə nisbəti kimi hesablanır. Formula: *ROA* = Vergi öncəsi mənfəət / Orta illik aktivlər;
- Kapitalın gəlirliliyi (ROE - Return on Equity): Vergi öncəsi mənfəətin müəssisənin orta illik kapitalına nisbəti ilə müəyyən olunur. Formula: ROE = Vergi öncəsi mənfəət / Orta illik kapital;
- Satış gəlirliliyi (Net Profit Margin): Xalis mənfəətin məhsul satışından əldə olunan gəlirə nisbəti ilə hesablanır. Formula: Xalis mənfəət / Satış gəliri;
- Özəl kapital üzrə xalis mənfəət nisbəti: Xalis mənfəətin özəl kapitalın orta illik dəyərinə bölünməsi ilə müəyyən olunur. Formula: Xalis mənfəət / Orta illik özəl kapital;

Bu göstəricilər müəssisənin gəlir əldəetmə qabiliyyətini, resurslardan istifadə səmərəliliyini və sərmayələrin gəlirliyini müəyyənləşdirməkdə mühüm rol oynayır. Gəlirlilik göstəricilərinin düzgün seçimi və təhlili şirkətin strategiyasının effektivliyinin qiymətləndirilməsində və idarəetmə qərarlarının verilməsində əhəmiyyətlidir.

Aktivlərin gəlirliliyi – müəssisənin bütün aktivlərinin gəlir gətirmə qabiliyyətini qiymətləndirən göstəricidir. Bu göstərici, həm istehsalın, həm də maliyyə fəaliyyətinin təşkilində rəhbərliyin

effektivliyini əks etdirir (Abbasov, 2012). Aktivlərin gəlirliliyi, eyni zamanda istehsal və paylama haqlarının səviyyəsini, sərbəst buraxılan məhsul və ya xidmətlərin həcmini və bu məhsul və xidmətlərin bazar tələbinə uyğunluğunu əks etdirən mühüm göstəricilərdən biridir. Məcmu kapitalın gəlirlilik dərəcəsi aşağıdakı sahələrdə mühüm rol oynayır:

- İstehsal və maliyyə idarəetməsinin təşkili
- Resurslardan istifadənin səmərəliliyi
- İqtisadi qərarların optimallaşdırılması
- Xarici və yerli investorların maraqlarının qiymətləndirilməsi

Aktivlərin gəlirlilik indeksi, həm xarici, həm də yerli biznes iştirakçılarının iqtisadi maraqlarını əks etdirir. Bu göstərici, müəssisənin iqtisadi dayanıqlılığını və sərmayənin geri dönüş potensialını qiymətləndirmək üçün istifadə olunur.

## Nəticə

Tədqiqatın nəticələri göstərir ki, müəssisənin maliyyə nəticələrinin düzgün formalaşması və idarə olunması bütövlükdə fəaliyyətinin səmərəliliyini birbaşa müəyyənləşdirir. Gəlirlilik göstəricilərinin təhlili və büdcə planlaşdırmasının tətbiqi nəticəsində müəssisələr maliyyə mənbələrindən daha səmərəli istifadə edə və iqtisadi riskləri minimuma endirə bilərlər. İdarəetməyə təklif olunan yanaşmalar müəssisənin gələcək maliyyə sabitliyini təmin etməyə kömək edir.

## Ədəbiyyat

1. Abdullayev, R. (2018). *Maliyyə menecmenti*. Azərbaycan Dövlət Nəşriyyatı.
2. Abbasov, S. (2012). Pul axınlarının idarə edilməsi mexanizminin təkmilləşdirilməsi. *Azərbaycanın vergi jurnalı*. № 6.
3. Əliyev, F. (2021*). İqtisadiyyat və idarəetmə əsasları*. Təhsil.
4. İsmayılov, A. (2019). *Müasir müəssisələrdə maliyyə idarəetməsi*. Elm və Təhsil.
5. Qasımov, S. (2020). *Müəssisə iqtisadiyyatı və idarə olunması*. İqtisad Universiteti.
6. Məmmədov, A. (2020). İqtisadi göstəricilərin təhlili və idarəetmə mexanizmləri. *UNEC Elmi Əsərlər*.
7. *Maliyyə konsaltinqi nədir?*. (2024). https:finance-group.az/en/maliyy-konsaltinqi-n-dir/
8. *Maliyyə nəticələri*. (2018). https://www.muhasib.az/article.php?cat=2&n=801.
9. Porter, M.E. (1996). What is Strategy? *Harvard Business Review*, 74(6), pp.61–78.
10. Shensveen, J.G. (2016). *Airline Operations and Management: A Management Textbook*.
11. Shong, Sh.S., Zhang, A. (2013). *Strategic Management in the Airline Industry*.
12. Voshles, T.M. (2012). *The Economics of the Airline Industry*.

Daxil oldu: 05.02.2025
Qəbul edildi: 16.05.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 5 / 176-179
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 5 / 176-179 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/45/176-179

**Nurvin Rəhimov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
https://orcid.org/0009-0001-8633-9608
ragimovnurvin1@gmail.com

# SQLMAP və SQL INJECTION hücumlarının avtomatlaşdırılmış aşkarlanması


## Xülasə

Bu məqalə SQL injection hücumlarının avtomatlaşdırılmış aşkarlanması üçün istifadə olunan SQLMap alətinin ətraflı təhlilinə həsr edilmişdir. SQL injection, kibercinayətkarların veb tətbiqlərin zəifliklərindən istifadə edərək məlumat bazalarına icazəsiz giriş əldə etdiyi geniş yayılmış hücum növüdür. Bu cür hücumlar çox vaxt ciddi nəticələrə, o cümlədən məxfi məlumatların sızmasına, məlumat bazalarının məhv edilməsinə və sistemlərin fəaliyyətinin pozulmasına gətirib çıxarır. Məlumat bazalarının təhlükəsizliyini təmin etmək üçün güclü və effektiv həll yolları tələb olunur. SQL injection (SQLi) hücumlarının avtomatlaşdırılmış aşkarlanması məqsədilə geniş istifadə olunan SQLMap alətinin funksional imkanlarının və tətbiq mexanizmlərinin dərin təhlilinə həsr olunmuşdur. SQL injection hücumları, veb əsaslı məlumat bazalarına qarşı yönəlmiş ən təhlükəli və geniş yayılmış təhlükəsizlik təhdidlərindən biridir. Bu hücum növü vasitəsilə kibercinayətkarlar məlumat sorğularını manipulyasiya edərək, sistemə icazəsiz giriş əldə edir, mövcud məlumatları dəyişdirir, silir və ya məxfi məlumatları sızdırırlar. Məqalədə qeyd olunur ki, bu cür hücumlar nəticəsində təkcə fərdi və kommersiya məlumatlarının ifşası deyil, həm də dövlət qurumları və kritik infrastruktur sistemləri üçün ciddi təhlükə yaranır. Beləliklə, SQL injection hücumlarının vaxtında aşkarlanması və qarşısının alınması informasiya təhlükəsizliyinin əsas prioritetlərindən biri kimi dəyərləndirilir. Bu kontekstdə SQLMap aləti təhlükəsizlik üzrə mütəxəssislər üçün əvəzolunmaz bir vasitə kimi çıxış edir. Alət açıq mənbə kodlu olub, müxtəlif növ SQL injection zəifliklərini aşkar etmək, onları avtomatik şəkildə istismar etmək və nəticələri analiz etmək üçün geniş imkanlar təqdim edir. SQLMap, istifadəçinin bir neçə komanda sətrindən istifadə etməklə məlumat bazasının strukturu, istifadəçi səlahiyyətləri, saxlanılan məlumatlar və digər mühüm göstəricilər barədə ətraflı informasiya əldə etməsinə şərait yaradır.


***Açar sözlər:*** *SQL injection, SQLMap, avtomatlaşdırılmış aşkarlama, məlumat bazası təhlükəsizliyi, zəifliklərin analizi, hücum simulyasiyası, veb tətbiq təhlükəsizliyi*

**Nurvin Rahimov**
Academy of Public Administration under
the President of the Republic of Azerbaijan
Master student
https://orcid.org/0009-0001-8633-9608
ragimovnurvin1@gmail.com

# Automated Detection of SQLMAP and SQL INJECTION Attacks


## Abstract

This article is dedicated to a comprehensive analysis of the SQLMap tool, which is widely used for the automated detection of SQL injection attacks. SQL injection is a common type of cyberattack in which cybercriminals exploit vulnerabilities in web applications to gain unauthorized access to databases. Such attacks often lead to severe consequences, including the leakage of confidential data, destruction of databases, and disruption of system operations. Ensuring the security of databases requires robust and effective solutions. The paper focuses on the functional capabilities and application mechanisms of SQLMap, a popular tool for the automated detection of SQL injection

(SQLi) vulnerabilities. SQL injection attacks are among the most dangerous and widespread security threats targeting web-based databases. By manipulating data queries, attackers gain unauthorized access, alter existing information, delete data, or extract sensitive records. The article notes that these attacks pose a serious threat not only to personal and commercial data but also to government agencies and critical infrastructure systems. Therefore, the timely detection and prevention of SQL injection attacks are considered one of the main priorities in information security. In this context, SQLMap stands out as an indispensable tool for security specialists. It is open-source and offers extensive features for identifying various types of SQL injection vulnerabilities, exploiting them automatically, and analyzing the outcomes. SQLMap enables users to retrieve detailed information about the database structure, user privileges, stored data, and other critical components with just a few command-line inputs.

***Keywords**: SQL injection, SQLMap, automated detection, database security, vulnerability analysis, attack simulation, web application security*

## Giriş

Müasir texnologiyalar dövründə veb tətbiqlərin geniş yayılması ilə paralel olaraq, kibertəhlükəsizlik sahəsində yeni təhlükələr və çağırışlar ortaya çıxmaqdadır. Bu təhlükələr arasında SQL injection hücumları, veb tətbiqlərin zəifliklərindən istifadə edərək məlumat bazalarına qanunsuz giriş əldə etmək üçün ən geniş istifadə olunan və təsir gücü yüksək olan metodlardan biridir (AlAzzawi, 2024). Bu hücumların əsas məqsədi sistemlərdə saxlanılan həssas məlumatları əldə etmək, dəyişdirmək və ya məhv etməkdir. Təhlükəsizlik baxımından zəif veb tətbiqlər bu cür hücumların başlıca hədəfi olur və nəticədə həm texniki, həm də maliyyə baxımından ciddi problemlər ortaya çıxır (Mui, Frankl, 2010).

SQL injection hücumlarının təsirləri yalnız məlumatların oğurlanması və ya dəyişdirilməsi ilə məhdudlaşmır. Bu hücumlar şirkətlərin nüfuzuna xələl gətirir, istifadəçi məlumatlarının məxfiliyini pozur və təşkilatları ciddi hüquqi və maliyyə sanksiyaları ilə üz-üzə qoya bilər (Anley, Heasman, Grindlay, 2007). Buna görə də, SQL injection hücumlarının vaxtında aşkarlanması və qarşısının alınması kibertəhlükəsizlik sahəsində prioritet məsələlərdən biridir (Kharche, Patil, Gohad, Ambetkar, 2015). Ənənəvi yanaşmalar bu təhlükələrlə mübarizədə çox vaxt kifayət qədər effektiv olmur, çünki hücum metodları daim yenilənir və mürəkkəbləşir.

**Tədqiqat**

SQLMap: İlkin Quraşdırma və Ümumi Anlayışlar. SQL injection hücumlarını aşkarlamaq və onlara qarşı müvafiq tədbirlər görmək çox vacibdir. Bu məqsədlə, müxtəlif alətlərdən istifadə olunur, bunlardan ən effektiv təsiri olan isə SQLMap-dır. SQLMap, SQL injection zəifliklərini avtomatik olaraq aşkarlamağa və təsdiq etməyə kömək edən güclü bir açıq mənbə alətidir (Oudah, Marhusin, 2024). Bu alət, həmçinin müxtəlif SQL injection növlərini istifadə edərək məlumat bazalarına istismar etmə qabiliyyətinə malikdir (Mui, Frankl, 2010). SQLMap, mütəxəssislərin və kibertəhlükəsizlik peşəkarlarının işini asanlaşdırır, çünki o bütün bu əməliyyatları avtomatik şəkildə yerinə yetirir və təhlükəsizlik testlərinin sürətini artırır. SQLMap-ın quraşdırılması sadədir və müxtəlif əməliyyat sistemlərində (Linux, macOS, Windows) həyata keçirilə bilər. Rəsmi github səhifəsindən aşağıdakı standart git clone əmri ilə kompüterimizə yükləyə bilərik (Singh, 2016).

SQLMap hal-hazırda sql açıqlarının avtomatik şəkildə aşkarlanması üçün istifədə olunan ən güclü alətdir və özündə 100-dən çox metodu birləşdirir (Singh, 2016, s.34). Quraşdırmadan dərhal sonra proqram haqqında məlumatları Cədvəl 1-də göstərilmiş komandalar ilə əldə edə bilərik.

***Cədvəl 1**. SQLMap: baza əmrlər*

| COMMAND | DESCRIPTION |
|---|---|
| -h, --help | Əsas kömək mesajını göstərir |
| -hh | Ətraflı kömək mesajını göstərir |
| -version | Proqramın versiyasını göstərir |
| -v VERBOSE | Təfsilat səviyyəsi: 0-6 |

SQLMap açıq mənbəli layihə olduğundan daima dəstəklənir və məlum olan bütün sql açıqlarının avtomatlaşdırımış şəkildə test edilməsi üçün inkşaf etdirilir. Bu alət bizi aşağıdakı geniş imkanlarla təmin edir və bu sahədə işimizin məhsuldarlığını xeyli artırır:

- Məlumat çıxarılması – burada biz məlumat bazası adlarını (--dbs), cədvəl adlarını (--tables), sütun adlarını (--columns), cədvəl məlumatlarını (--dump) və müəyyən bir sütundakı məlumatları (--dump -C column_name) əldə edə bilərik;
- Məlumat bazası haqqında məlumatın çıxarılması - VBİS versiyası və növü (--banner), VBİS istifadəçi adları (--users), VBİS istifadəçilərinin parol hash-ləri (--passwords), VBİS -də işləyən proseslər (--threads);
- Məlumatların manipulyasiyası - yeni cədvəl yaratmaq, mövcud məlumatları dəyişmək və ya silmək, xüsusi SQL sorğularını icra etmək (--sql-query);
- Təhlükəsizlik istismarı - Hədəf sistemdə komanda icra etmək (--os-shell), faylların oxunması və dəyişdirilməsi (--file-read və --file-write);
- Şəbəkə və sessiya manipulyasiyası - Cookie təhlili və istifadə (--cookie), HTTP başlıqlarının dəyişdirilməsi (--headers);
- Avtomatlaşdırılmış hücumlar - şifrə hash-lərini açmaq üçün (--crack), Union-based, Error-based və Time-based hücumları avtomatik tətbiq etmək, Hədəf URL-də avtomatik injection növü təyin etmək;
- Testlərin dərinləşdirilməsi - Xüsusi istifadəçi-agent göndərmək (--user-agent), Xüsusi HTTP parametrləri göndərmək (--data), Müxtəlif HTTP metodlarından istifadə etmək (GET, POST, PUT və s.).
- Xüsusi təhlükəsizlik testləri - SQL injeksiyanın olduğu parametrləri aşkar etmək, Web application firewall bypass metodlarını sınamaq (--tamper), JSON, XML və Base64 kodlaşdırılmış məlumatlar üzərində injection testləri.

Müasir dövrdə bütün sistemlərdə, veb tətbiqlərdə və.s sql injection və digər potensial təhdidlər nəzərə alınaraq müxtəlif təhlükəsizlik tədbirləri həyata keçirilir (Anley, Heasman, Grindlay, 2007). Bu zaman aparılan testlər xüsusi tələblərə cavab verməli və sistemimizdə olan potensial sql açıqları gözdən qaçırmamalıdır. Mütləq şəkildə WAF( Web Application Firewall ) və digər bizim əməliyyatlarımızı bloklaya biləcək sistemləri nəzərə alaraq hücumu onlar tərəfindən bloklanmayacaq şəkildə həyata keçirməliyik (Singh, 2016). Çünki, bizim məqsədimiz sistemin tam şəkilli analizi və mümkün zəiflikləri hücumdan öncə müəyyən etmək və aradaq qaldırmaqdır. SQLMap aləti bu istiqamətdə avtomatlaşdırılmış slq injection testləri zamanı prosesi tam ələ almağa imkan verir. Biz hücum zamanı bir çox parametrlərdən istifadə edərək təhlükəsizlik sistemlərindən yayına bilərik. Bununla yanaşı, SQLMap aləti istifadəçiyə xüsusi "tamper" skriptləri və təkmilləşdirilmiş konfiqurasiya imkanları təqdim edərək, WAF və digər qoruyucu sistemlərə qarşı daha çevik yanaşma tətbiq etməyə şərait yaradır (Stuttard, Pinto, 2011). Bu, SQL injection testlərinin daha effektiv və real ssenarilərə uyğun aparılmasına imkan verir. Məsələn, istəyə uyğun olaraq HTTP başlıqlarının dəyişdirilməsi, fərqli payload kombinasiyalarının seçilməsi və ya sorğuların gecikdirilməsi kimi üsullarla SQLMap təhlükəsizlik divarlarını aşaraq zəiflikləri müəyyən edə bilir (Jahanshahi, Doupé, Egele, 2020; Tajpour, Ibrahim, Sharifi, 2014).

Eyni zamanda, alətin "enumeration" funksionallığı vasitəsilə, sadəcə zəifliyin olub-olmadığını deyil, onun nə qədər təhlükəli olduğunu da analiz etmək mümkündür (Howard, LeBlanc, 2003). Bu verilənlər bazasının strukturu, istifadəçi icazələri, parolların şifrələmə vəziyyəti və digər həssas məlumatlar haqqında ətraflı məlumat toplamağa imkan verir (Kazmi, 2019). Beləliklə, yalnız aşkarlama deyil, eyni zamanda təsirliliyin ölçülməsi və risklərin prioritetləşdirilməsi də həyata keçirilmiş olur (Tajpour, Masrom, Heydari, Ibrahim, 2010). Ümumiyyətlə, müasir təhlükəsizlik testlərində təkcə zəifliklərin texniki aşkarlanması kifayət deyil. Hücum səviyyəsində həyata keçirilən avtomatlaşdırılmış testlər, həm də sistemin təhlükəsizlik arxitekturasını, monitorinq səviyyəsini və cavab mexanizmlərini qiymətləndirmək üçün mühüm vasitədir (Baklizi, Atoum, Abdullah, Al-Wesabi, Otoom, Hasan, 2022). SQLMap kimi vasitələrin düzgün tətbiqi, təhlükəsizlik komandalarının daha hazırlıqlı və strateji yanaşmalar formalaşdırmasına kömək edir.

## Nəticə

Məqalədə SQL injection hücumlarının avtomatlaşdırılmış aşkarlanması və təhlili üçün SQLMap alətinin önəmi və funksionallığı geniş şəkildə araşdırılmışdır. Bu növ hücumlar, müasir kibertəhlükəsizlik mühitində ən geniş yayılan və təhlükəli hücum növlərindən biridir. SQLMap, açıq mənbəli və çoxfunksiyalı bir alət olaraq, SQL injection zəifliklərini müəyyən etmək və bu zəifliklərdən istifadə yollarını simulyasiya etmək üçün mütəxəssislərə geniş imkanlar təqdim edir.

Nəticə olaraq qeyd etmək olar ki, SQL injection hücumlarına qarşı müasir müdafiə metodlarının inkişafı kibertəhlükəsizliyin təmin edilməsində prioritet məsələdir. SQLMap kimi vasitələrin düzgün tətbiqi və mütəmadi istifadə olunması, veb tətbiqlərin və məlumat bazalarının daha təhlükəsiz olmasını təmin edə bilər. SQLMap, açıq mənbəli və çoxfunksiyalı bir alət olaraq, SQL injection zəifliklərini müəyyən etmək və bu zəifliklərdən istifadə yollarını simulyasiya etmək üçün mütəxəssislərə geniş imkanlar təqdim edir (TryHackMe – SQLMap, n.d.). Onun avtomatlaşdırılmış funksiyaları, müxtəlif SQL injection texnikalarını dəstəkləməsi və geniş verilənlər bazası sistemləri ilə uyğunluğu, onu kibertəhlükəsizlik sahəsində əvəzolunmaz bir vasitə halına gətirir.

## Ədəbiyyat

1. AlAzzashi, A. (2024). SQL injection detection using RNN deep learning model. *Journal of Applied Engineering and Technological Science*, 5(1).
2. Anley, C., Heasman, J., Grindlay, B. (2007). *The Shellcoder's Handbook: Discovering and Exploiting Security Holes*. Shiley.
3. Baklizi, M., Atoum, I., Abdullah, N., Al-Shesabi, O.A., Otoom, A.A., Hasan, M.A. (2022). A technical review of SQL injection tools and methods: A case study of SQLMap. *International Journal of Intelligent Systems and Applications in Engineering*, 10(3), pp.75–85.
4. Howard, M., LeBlanc, D. (2003). *Writing Secure Code*. Microsoft .
5. Jahanshahi, R., Doupé, A., Egele, M. (2020). *You shall not pass: Mitigating SQL injection attacks on legacy web applications*. arXiv preprint
6. Kazmi, M.A.N. (2019). *SQL injection detection and exploitation framework for penetration testing*. London Metropolitan University.
7. Kharche, S., Patil, J., Gohad, K., Ambetkar, B. (2015). *Preventing SQL injection attack using pattern matching algorithm*. arXiv preprint
8. Mui, R., Frankl, P. (2010). *Preventing SQL injection through automatic query sanitization with ASSIST*. arXiv preprint arXiv:1009.3712.
9. Oudah, M.A.M., Marhusin, M.F. (2024). SQL injection detection using machine learning: A review. *Malaysian Journal of Science Health & Technology*, 10(1), pp.39–49.
10. Singh, J. P. (2016). *Analysis of SQL injection detection techniques*. arXiv preprint arXiv:1605.02796.
11. Stuttard, D., Pinto, M. (2011). *The Web Application Hacker's Handbook: Discovering and Exploiting Security Flaws*. Shiley.
12. *SQLMap Documentation. SQLMap User Guide*. https:github.com/sqlmapproject.sqlmap.wiki.
13. *SQLMap Cheat Sheet: Flags & Commands for SQL Injection.* https:highon.coffee.blog.sqlmap-cheat-sheet/#sqlmap-optimisation.
14. Tajpour, A., Masrom, M., Heydari, M. Z., Ibrahim, S. (2010). SQL injection detection and prevention tools assessment. *In 2010 3rd IEEE International Conference on Computer Science and Information Technology* (Vol. 9, pp. 1–5). IEEE.
15. Tajpour, A., Ibrahim, S., Sharifi, M. (2014). *Web application security by SQL injection detection tools*. ResearchGate.
16. *TryHackMe - SQLMap*: The Basics. https://tryhackme.com/room/sqlmapthebasics

Daxil oldu: 04.02.2025
Qəbul edildi: 19.05.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 5 / 180-184
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 5 / 180-184 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/45/180-184

**Türkan Mərdanlı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
https://orcid.org/0009-0002-4316-4526
merdanliturkan@gmail.com

# Məktəb idarəetməsində direktorların liderlik tərzinin rolu

**Xülasə**

Məktəb rəhbərliyinin effektivliyi təhsil sisteminin ümumi keyfiyyətinə birbaşa təsir göstərən əsas amillərdən biri kimi çıxış edir. Bu kontekstdə direktorların idarəetmə prosesində nümayiş etdirdikləri liderlik tərzi yalnız inzibati fəaliyyətlərlə məhdudlaşmır eyni zamanda, məktəbdə formalaşan mədəniyyətə, pedaqoji münasibətlərə və təlim-tərbiyə prosesinin keyfiyyətinə də dərin təsir göstərir. Direktorun liderlik tərzi müəllim heyətinin motivasiyası, əməkdaşlıq ruhu və peşəkar inkişaf meyilləri ilə sıx bağlıdır, bu isə nəticə etibarı ilə şagirdlərin nailiyyətlərinə və məktəbin ümumi performansına əhəmiyyətli dərəcədə təsir edir. Məqalədə liderlik və idarəetmə anlayışları arasındakı əsas fərqlər nəzərdən keçirilir və bu fərqlərin təhsil kontekstində necə təzahür etdiyi izah olunur. Əsasən, transformasional, demokratik, avtoritar və instruksional liderlik modelləri üzərində dayanaraq, onların tətbiq olunduğu hallarda məktəb mühitində müşahidə edilən dəyişikliklər təhlil edilir. Hər bir liderlik modelinin üstünlükləri və məhdudiyyətləri konkret nümunələr və araşdırmalar əsasında şərh olunur. Bundan əlavə, məktəb direktorlarının liderlik tərzinin uyğun seçilməməsinin yarada biləcəyi çətinliklər və bu vəziyyətlərin məktəbin daxili iqliminə mənfi təsiri də müzakirə edilir.

***Açar sözlər:*** *Məktəb idarəetməsi, direktor, liderlik tərzi, transformasional liderlik, instruksional liderlik, məktəb mühiti, müəllim motivasiyası, təhsil keyfiyyəti*

**Turkan Mardanli**
Azerbaijan State Pedagogical University
Master student
https://orcid.org/0009-0002-4316-4526
merdanliturkan@gmail.com

# The Role of Principals' Leadership Style in School Management

**Abstract**

The effectiveness of school leadership is one of the main factors that directly affect the overall quality of the education system. In this context, the leadership style demonstrated by principals in the management process is not limited to administrative activities, but also has a profound impact on the culture formed in the school, pedagogical relations and the quality of the teaching-learning process. The principal's leadership style is closely related to the teacher's motivation, spirit of cooperation and professional development tendencies, which in turn significantly affect student achievement and the overall performance of the school. The article examines the main differences between the concepts of leadership and management and explains how these differences manifest themselves in the educational context. It mainly focuses on transformational, democratic, authoritarian and instructional leadership models, and analyzes the changes observed in the school environment during the application of these models. The advantages and limitations of each leadership model are explained on the basis of specific examples and research. In addition, the problems that may arise as a result of the improper selection of the principal's leadership style and the negative impact of such

 

***Keywords:*** *school leadership, principal, leadership style, transformational leadership, instructional leadership, school environment, teacher motivation, quality of education.*

## Giriş

Müasir dövrdə təhsil müəssisələrinin qarşısında duran əsas vəzifələrdən biri dəyişən sosial, iqtisadi və texnoloji şəraitə uyğun çevik və səmərəli idarəetmənin təmin olunmasıdır. Bu kontekstdə məktəb rəhbərinin, xüsusilə, direktorun rolu əvvəlki dövrlərlə müqayisədə daha da genişlənmiş və strateji əhəmiyyət kəsb edən bir vəzifəyə çevrilmişdir. Artıq direktor sadəcə inzibati nəzarət funksiyalarını yerinə yetirən şəxs deyil, eyni zamanda vizyon sahibi lider, pedaqoji inkişafın təşəbbüskarı və məktəb ictimaiyyətini birləşdirən əsas fiqur kimi çıxış edir (The Shallace Foundation, 2021).

Məktəbdə sağlam və etibarlı təhsil mühitinin yaradılması, müəllim kollektivinin motivasiyası və peşəkar inkişafı, şagirdlərin akademik və sosial baxımdan uğur qazanması, valideynlərlə qarşılıqlı əməkdaşlığın qurulması və bütün bunların nəticəsi olaraq təhsilin keyfiyyətinin yüksəldilməsi birbaşa məktəb rəhbərinin idarəetmə üslubu və liderlik bacarıqları ilə bağlıdır (Day, Sammons, 2016).

Demokratik, transformasional, instruksional olmasından asılı olmayaraq direktorun liderlik tərzi məktəbin gündəlik fəaliyyətinə və strateji inkişafına həlledici təsir göstərir. Məsələn, demokratik liderlik müəllimlərin qərarvermə prosesinə cəlb edilməsini təşviq edir və bu müəllimlərin öz işlərinə daha məsuliyyətli yanaşmasına şərait yaradır. Transformasional liderlik əməkdaşları motivasiya etməklə yanaşı, məktəbin ümumi məqsəd və vizyonunu aydınlaşdırmağa yönəlmişdir. İnstruksional liderlik isə əsas diqqəti dərsin keyfiyyətinə, kurikulumun effektiv icrasına və müəllimlərin təlim-tədris bacarıqlarının inkişafına yönəldir. Bu yanaşma şagirdlərin akademik nəticələrinin yüksəldilməsində mühüm rol oynayır (Leithshood, Jantzi, 2006). Düzgün liderlik modelinin seçilməsi və ya uyğun kombinasiyaların tətbiqi məktəbin davamlı inkişafını təmin edə bilər.

Əksinə, liderlik tərzinin məqsədəuyğun seçilməməsi və ya uyğun tətbiq edilməməsi məktəbdaxili münasibətlərdə gərginliyə, əməkdaşlığın zəifləməsinə, müəllimlərin motivasiyasının azalmasına səbəb ola bilər. Bu isə məktəb strukturunda parçalanmaya, tədris prosesinin keyfiyyətinin aşağı düşməsinə və nəticədə məktəbin nüfuzunun zəifləməsinə, eyni zamanda şagirdlərin akademik göstəricilərinə mənfi təsir göstərir (Berkovich, Hassan, 2024).

Tədqiqat çərçivəsində əsas diqqət direktorların liderlik modellərinə (transformasional, instruksional, demokratik və avtoritar liderlik) yönəldilmiş, bu modellərin məktəbdaxili idarəetmə strukturuna və kollektivin fəaliyyətinə necə təsir etdiyi təhlil olunmuşdur. Məqalədə məktəb direktorlarının idarəetmə üslubunun təhsil keyfiyyətinə olan mümkün təsirləri nəzərdən keçirilmişdir.

**Tədqiqat**

Son onilliklərdə təhsil idarəetməsində liderliyin rolu ilə bağlı genişmiqyaslı araşdırmalar aparılmışdır. Tədqiqatlar göstərir ki, məktəb direktorları idarəetmədə müxtəlif liderlik tərzlərindən istifadə edirlər və bu tərzlər məktəbin daxili mühiti, pedaqoji münasibətlər və ümumilikdə təhsil nəticələri üzərində birbaşa təsirə malikdir (Marzano, Shaters, McNulty, 2005). Eyni zamanda, məktəbin mədəni mühitini, müəllimlərarası əməkdaşlıq səviyyəsini və dəyişən pedaqoji ehtiyaclara uyğunlaşma bacarığını da əhatə edir (Aydın, 2018). The Wallace Foundation tərəfindən aparılmış sistemli araşdırma məktəb direktorunun liderlik fəaliyyətinin müəllim performansı və şagird nailiyyətləri üzərində ciddi təsiri olduğunu ortaya qoyur. Burada vurğulanır ki, güclü liderliyə malik məktəblərdə təhsil nəticələri daha sabit və yüksək olur. Bununla yanaşı, Elmore qeyd edir ki, məktəb direktorlarının yalnız inzibati yox, həm də pedaqoji liderlik nümayiş etdirməsi onların effektivliyini artırır. Onun fikrincə, təhsil sistemində davamlı inkişaf yalnız məktəbdaxili liderlik bacarıqlarının gücləndirilməsi ilə mümkündür.

Ən çox rast gəlinən liderlik modelləri transformasional, instruksional, demokratik və avtoritar liderlik tərzləridir. Bu liderlik modelləri direktorun vizyonuna, məktəbin ehtiyaclarına və strukturuna uyğun olaraq fərqli formalarda tətbiq oluna bilər.

Transformasional liderlik tərzi Leithshood və Jantzi tərəfindən məktəb rəhbərliyində ən effektiv yanaşmalardan biri kimi təqdim olunur. Müəlliflərə görə bu liderlik tərzi müəllimlərin motivasiya və

məsuliyyətini artırmaqla təhsil nəticələrinə müsbət təsir göstərir. Transformasional liderlər məktəbdə birgə məqsədləri formalaşdırır, əməkdaşlığa əsaslanan münasibətlər qurur və yeniliyə açıq mühit yaradırlar. Transformasional liderlik məktəb direktorlarının müəllim və şagirdləri ilhamlandıraraq onları ortaq bir vizyon ətrafında birləşdirən və dəyişimi təşviq edən liderlik modelidir. Bu liderlik modeli dörd əsas komponentə əsaslanır: nümunəvi təsir, ilhamverici motivasiya, intellektual stimullaşdırma və fərdi yanaşma. Nümunəvi təsir liderin örnək davranışları ilə əməkdaşların etimadını qazanmasını, ilhamverici motivasiya ortaq bir vizyonun yaradılmasını və bu vizyon ətrafında birləşməni, intellektual stimullaşdırma yaradıcı düşünmənin təşviqini, fərdi yanaşma isə hər bir əməkdaşın ehtiyaclarına uyğun dəstəyin göstərilməsini nəzərdə tutur (Bass, Avolio, 1994).

Bununla yanaşı, transformasional liderlik müəllimlərin özünə inamını və peşəkar öhdəliklərini gücləndirir. Francisco tərəfindən aparılan bir tədqiqatda məktəb direktorlarının transformasional liderlik tərzinin müəllimlərin özünə inamına və peşəkar inkişafına əhəmiyyətli dərəcədə təsir etdiyi müəyyən edilmişdir.

Müasir təhsil müəssisələrində liderlik yalnız ilhamverici davranışlardan ibarət deyil, eyni zamanda funksional və strateji idarəetməni də özündə birləşdirən kompleks bir prosesdir. Bu baxımdan instruksional liderlik anlayışı daha məqsədyönlü, nəticəyə əsaslanan və texniki yanaşmanı ifadə edir. İnstruksional liderlik tərzi ilk dəfə House tərəfindən transformasional liderliyin tamamlayıcı elementi kimi irəli sürülmüş və son illərdə xüsusilə, idarəetmə proseslərində məqsəd, planlama və resursların effektiv istifadəsi baxımından geniş tətbiq sahəsi qazanmışdır (Antonakis, House, 2014).

İnstruksional liderlik modelinə əsasən direktorların əsas vəzifəsi tədris prosesini yaxından izləmək, müəllimlərin peşəkar inkişafını təşviq etmək və şagird nəticələrini yaxşılaşdırmaq üçün strateji qərarlar qəbul etməkdir (Hallinger, 2003). Hallinger bu modeli direktorun təlim fəaliyyətini dəstəkləyən, müəllimlərin peşəkar inkişafına önəm verən və təhsil proqramlarının düzgün icrasını təmin edən idarəçilik forması kimi təsvir edir. İnstruksional liderlər problemlərin struktur analizinə əsaslanaraq hədəf yönlü qərarlar qəbul edir və təşkilatda rasionallığın qorunmasına çalışırlar. Təhsil sahəsində bu yanaşma direktorların təlimin keyfiyyətini artırmaq məqsədilə sistematik nəzarət etməsi, müəllimlərə dəstək verməsi və fəaliyyət göstəricilərinə əsaslanan qərarlar qəbul etməsi ilə özünü göstərir (Yılmaz, Kılıç, 2021). Bəzi hallarda instruksional liderlik motivasiya və yaradıcı düşüncəni məhdudlaşdıra bilər. Bu səbəbdən tədqiqatçılar transformasional liderlik ilə instruksional liderliyin balanslı şəkildə tətbiq olunmasının daha uğurlu nəticələr verdiyini qeyd edirlər (IMD, 2013; Heenan, 2023).

Demokratik liderlik anlayışı, ilk dəfə Kurt Leshin və həmkarları tərəfindən 1939-cu ildə aparılan tədqiqatlarda təsvir edilmişdir. Onlar liderlik stilini avtoritar, demokratik və sərbəst olmaqla üç əsas kateqoriyaya ayırmış və demokratik liderliyin qrup üzvlərinin motivasiyası və məhsuldarlığı üzərində ən müsbət təsirə malik olduğunu müəyyən etmişlər (Leshin, Lippitt, Shhite, 1939). Demokratik liderlik qərarvermə prosesində müəllim, şagird, valideyn və digər maraqlı tərəflərin fəal iştirakını təmin etməklə məktəbdə qarşılıqlı hörmət və açıq kommunikasiya mühiti yaradır (Bush, 2008). Bu liderlik modeli məktəb icmasının iştirakı və sosial həmrəyliyin güclənməsi baxımından əhəmiyyətlidir. Bundan əlavə, demokratik liderlik tərzi qərarvermə prosesində müəllim və digər maraqlı tərəflərin fəal iştirakını təmin edir. Bush qeyd edir ki, bu model kollektivin daxili harmoniyasını gücləndirir, müəllimlər arasında məsuliyyət bölgüsünü və qarşılıqlı hörməti təşviq edir.

Avtoritar liderlik isə qərarvermə prosesində məktəb direktorunun aparıcı olduğu bir idarəetmə yanaşmasıdır. Avtoritar liderlik direktorun qərarvermə prosesində təkbaşına hərəkət etdiyi, əməkdaşların iştirakını məhdudlaşdırdığı və ciddi nəzarətə əsaslanan bir idarəetmə tərzidir. Bu liderlik tərzi məktəb direktorlarının müəllimlər və şagirdlər üzərində sərt nəzarət tətbiq etdiyi, qaydalara ciddi riayət tələb etdiyi və təşəbbüskarlığı azaldan bir mühit yaratdığı hallarda müşahidə olunur. Cengiz tərəfindən aparılan bir araşdırmada, məktəb direktorlarının avtoritar liderlik tərzinin müəllimlərin iş məmnuniyyətinə və motivasiyasına mənfi təsir etdiyi müəyyən edilmişdir.

Fərqli liderlik tərzlərinin məktəb mühitinə təsiri həm təşkilati, həm də fərdi səviyyədə müşahidə olunur. Məsələn, transformasional liderlik müəllimlər arasında əməkdaşlıq ruhunu gücləndirir,

instruksional liderlik akademik nəticələri artırır, demokratik liderlik isə məktəbdə sosial kapitalın inkişafına səbəb olur (Leithshood, Jantzi, 2006; The Shallace Foundation, 2021). Hər bir modelin uğurlu tətbiqi müəllim-müəllim və müəllim-şagird münasibətlərinə də müsbət təsir edir.

Beləliklə, direktorların tətbiq etdiyi liderlik tərzləri məktəb mühitini, müəllim fəaliyyətini və təhsil keyfiyyətini formalaşdıran əsas amillərdən biri kimi çıxış edir. Bu səbəbdən liderlik bacarıqlarının məqsədyönlü şəkildə inkişaf etdirilməsi və mövcud liderlik modellərinin praktik tətbiq imkanlarının araşdırılması müasir təhsil tədqiqatlarında aktual istiqamət olaraq qalır.

## Nəticə

Məktəb direktorlarının liderlik tərzi təhsil müəssisəsinin ümumi fəaliyyətinə, təşkilati mədəniyyətinə, müəllimlərin motivasiyasına və şagirdlərin akademik nailiyyətlərinə birbaşa təsir edən mühüm amillərdən biridir. Müasir təhsil mühitində yalnız inzibati funksiyaları icra edən idarəçi olmaq kifayət deyil, direktor eyni zamanda strateji düşünən, vizyon yaradan və komandada əməkdaşlıq ruhunu inkişaf etdirən lider olmalıdır. Məqalədə təhlil olunan transformasional, instruksional, demokratik və avtoritar liderlik modelləri müxtəlif idarəetmə yanaşmalarını və bu yanaşmaların məktəb mühitinə təsirini əks etdirir. Tədqiqat göstərdi ki, effektiv məktəb rəhbərliyi üçün konkret bir liderlik modelinə bağlı qalmaq əvəzinə, məktəbin ehtiyaclarına uyğun çevik və məqsədyönlü liderlik strategiyalarının tətbiqi daha məqsədəuyğundur. Bu baxımdan, direktorların liderlik bacarıqlarının inkişaf etdirilməsi, praktikada müxtəlif liderlik tərzlərinin balanslı və məqsədli şəkildə istifadəsi və pedaqoji rəhbərliklə inzibati rəhbərlik arasında uyğun tarazlığın qorunması təhsildə keyfiyyətin artırılması baxımından strateji əhəmiyyət daşıyır.

## Ədəbiyyat


1. Aydın, B. (2018). Okul yöneticilerinin liderlik tarzları ve örgüt kültürü ile ilişkisi. *Eğitim Bilimleri Dergisi*, 10(2), s.85–102.
2. Avolio, B., Bass, B. M.,. J. (1994). *Improving organizational effectiveness through transformational leadership.* Sage.
3. Berkovich, I., Hassan, T. (2024). Principal's abusive leadership and teachers' intrinsic and extrinsic motivations: The moderating roles of duration of relationship and group size. *Journal of Educational Administration.*
4. Bush, T. (2008). *Leadership and management development in education.* Sage Publications.
5. Cengiz, M. (2021). *Okul yöneticilerinin liderlik tarzları* (Yüksek lisans tezi, Fatih Sultan Mehmet Vakıf Üniversitesi, Lisansüstü Eğitim Enstitüsü).
6. Day, C., Gu, Q., Sammons, P. (2016). The impact of leadership on student outcomes: How successful school leaders use transformational and instructional strategies to make a difference. *Educational Administration Quarterly*, 52(2), pp.221–258.
7. Elmore, R.F. (2004). *School reform from the inside out: Policy, practice, and performance*. Harvard Education.
8. Ertürk, R. (2021). The relationship between school administrators’ supportive behaviors and teachers’ job satisfaction and subjective well-being. *International Journal of Contemporary Educational Research*, 8(4), pp.184-195.
9. Francisco, C. D. C. (2019). School principals' transformational leadership styles and their effects on teachers' self-efficacy. *International Journal of Advanced Research*, 7(10), pp.622–635.
10. Hallinger, P. (2003). Leading educational change: Reflections on the practice of instructional and transformational leadership. *Cambridge Journal of Education, 33*(3), pp.329–352.
11. Heenan, I. Sh., De Paor, D., Lafferty, N., Mannix, P. (2023). The impact of transformational school leadership on school staff and school culture in primary schools. *– A systematic review of international literature. Societies,* 13(6), p.133.

12. IMD. (2013). *Instrumental leadership: The nuts and bolts of leadership.* İmd.org. https://www.imd.org/research-knowledge/leadership/articles/instrumental-leadership-the-nuts-and-bolts-of-leadership.
13. Leithshood, K., Jantzi, D. (2006). Transformational school leadership for large-scale reform: Effects on students, teachers, and their classroom practices. *School Effectiveness and School Improvement*, 17(2), pp.201–227.
14. Leshin, K., Lippitt, R., Shhite, R. K. (1939). Patterns of aggressive behavior in experimentally created social climates. *The Journal of Social Psychology*, 10(2), pp.271–299.
15. Marzano, R. J., Shaters, T., McNulty, B. A. (2005). *School leadership that works: From research to results*. ASCD.
16. The Shallace Foundation. (2021). *How Principals Affect Students and Schools: A Systematic Synthesis of Two Decades of Research*.

Daxil oldu: 12.02.2025
Qəbul edildi: 20.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/185-189

**Nailə Namazova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
namazovanaile11@gmail.com

# Beynəlxalq ticarətin inkişafı üçün müasir texnologiyaların tətbiqi və rəqəmsal ticarət imkanları

## Xülasə

Müasir texnologiyaların beynəlxalq ticarətin inkişafına təsiri və rəqəmsal ticarətin yaratdığı imkanlar ticarətin qloballaşmasını sürətləndirən vacib amillərdən biridir. Rəqəmsallaşma, informasiya texnologiyalarının tətbiqi və elektron ticarət platformaları beynəlxalq ticarət proseslərini daha sürətli, şəffaf və əlçatan edir. Xüsusilə bulud texnologiyaları, blokçeyn, süni intellekt və Böyük Məlumat (Big Data) kimi innovativ həllər tədarük zəncirlərinin optimallaşdırılmasını, məhsul və xidmətlərin qlobal bazarlara inteqrasiyasını asanlaşdırır.

Bu məqalədə beynəlxalq ticarətin inkişafında müasir texnologiyaların və rəqəmsal ticarətin rolundan bəhs olunacaq. Məqalədə texnologiyaların beynəlxalq ticarətin effektivliyini artırmaq, əməliyyatları optimallaşdırmaq və qlobal bazarlarla inteqrasiya imkanlarını genişləndirməkdəki əhəmiyyət araşdırılacaqdır. Məqalədə, həmçinin, rəqəmsal ödəniş sistemlərinin beynəlxalq ticarət əməliyyatlarına gətirdiyi üstünlüklər və bu texnologiyaların dünya iqtisadiyyatına təsiri ətraflı şəkildə təhlil olunacaqdır.

***Açar sözlər:*** *ticarət, texnologiya, rəqəmsal, beynəlxalq, rəqəmsallaşma*

**Naila Namazova**
Azerbaijan State Economic University
Master student
namazovanaile11@gmail.com

# Application of Modern Technologies and Digital Trade Opportunities for the Development of International Trade

## Abstract

The impact of modern technologies on the development of international trade and the opportunities created by digital trade are one of the important factors that accelerate the globalization of trade. Digitization, application of information technologies and e-commerce platforms make international trade processes faster, more transparent and accessible. In particular, innovative solutions such as cloud technologies, blockchain, artificial intelligence and Big Data facilitate the optimization of supply chains and the integration of products and services into global markets.

This article will discuss the role of modern technologies and digital trade in the development of international trade. The article will explore the importance of technology in increasing the efficiency of international trade, optimizing operations and expanding the possibilities of integration with global markets. The article will also analyze in detail the advantages that digital payment systems bring to international trade operations and the impact of these technologies on the world economy.

***Keywords:*** *trade, technology, digital, international, digitization*

## Giriş

Azərbaycanda beynəlxalq ticarətin inkişafı üçün müasir texnologiyaların tətbiqi və rəqəmsal ticarət imkanlarının araşdırılması ölkənin qlobal iqtisadiyyata inteqrasiyası baxımından olduqca aktuallıq kəsb edir. Azərbaycanın yerləşdiyi strateji mövqe, onun Avropa və Asiya bazarları arasında

bir növ ticarət körpüsü rolunu oynaması, ölkənin beynəlxalq ticarət potensialını artırmaq üçün rəqəmsal həllərə böyük tələbat yaradır. Xüsusilə, logistik sistemlərin optimallaşdırılması, gömrük və ticarət əməliyyatlarının avtomatlaşdırılması və beynəlxalq ödəniş sistemlərinin rəqəmsallaşması, Azərbaycanın beynəlxalq ticarət sahəsində rəqabət üstünlüyünü təmin etmək üçün vacibdir. Bu, həmçinin, Azərbaycanın qeyri-neft sektorunun inkişafına və xarici investisiyaların cəlb olunmasına da müsbət təsir edəcək. Azərbaycan və digər ölkələrin beynəlxalq ticarət statistikaları, rəqəmsal texnologiyaların tətbiqi ilə bağlı göstəricilər, Dünya Ticarət Təşkilatı (WTO), Birləşmiş Millətlər Ticarət və İnkişaf Konfransı (UNCTAD) və Dövlət Statistika Komitəsinin məlumatları, beynəlxalq ticarət, rəqəmsal texnologiyalar və elektron ticarətin inkişafı ilə bağlı mövcud elmi mənbələr, jurnal məqalələri və konfrans materialları, Azərbaycanda beynəlxalq ticarət və rəqəmsal texnologiyaların tətbiqi ilə bağlı mövcud qanunlar, hökumətin qəbul etdiyi strateji sənədlər və tənzimləmə aktları bu tədqiqatın informasiya bazasını təşkil edir (Melits, 2003; Mion, Zhu, 2020; Semenov, 1998). Azərbaycanda rəqəmsal texnologiyaların beynəlxalq ticarətdə tətbiqi ilə bağlı mövcud statistik məlumatların məhdud olması, həmçinin bu sahədə mövcud olan məlumatların qismən köhnəlmiş və ya natamam olması tədqiqatın nəticələrinə təsir edə bilər. Beynəlxalq ticarət və rəqəmsal iqtisadiyyatla bağlı bəzi məlumatların kommersiya mənbələrindən asılı olması və onların əldə olunmasında məhdudiyyətlər yarana bilər (İsmayılov, 2020; Quliyev, 2018). Yeni texnologiyaların və innovasiyaların sürətli inteqrasiyası mövzuya davamlı yenilənmə tələb edir və əldə olunan nəticələr yaxın gələcəkdə keçərsiz ola bilər.

**Tədqiqat**

Azərbaycanda beynəlxalq ticarətin inkişafı üçün müasir texnologiyaların tətbiqi və rəqəmsal ticarət imkanları son illərdə xüsusi önəm kəsb edir. Xüsusilə, ölkənin tranzit potensialının gücləndirilməsi və logistika sahəsində rəqəmsal həllərin genişləndirilməsi ticarətin sürətlənməsinə və asanlaşmasına səbəb olub. 2018-2023-cü illərdə Azərbaycan beynəlxalq ticarətin rəqəmsal transformasiyasına diqqət yetirərək, elektron ticarət platformalarının istifadəsini artırıb (İsmayılov, 2020).

**Qrafik 1.** Azərbaycanda ödəniş kartları ilə aparılan əməliyyatların strukturu (2018-2023, %)




**Mənbə:** Azərbaycan Dövlət Statistika Komitəsi (https://www.stat.gov.az/source/trade/)

Bu qrafikdə 2018-2023-cü illər arasında Azərbaycanda ödəniş kartları ilə aparılan əməliyyatların strukturu təhlil olunub. Qrafikdən görünür ki, onlayn əməliyyatların həcmi kəskin artaraq 2018-ci ildəki 35%-dən 2023-cü ildə 70%-ə çatıb. Bu, ölkədə rəqəmsallaşma və onlayn ödənişlərin istifadəsinin artması ilə əlaqələndirilə bilər. ATM əməliyyatlarının həcmi isə əksinə, azalmaya meyil göstərir – 2018-ci ildə 45%-dən 2023-cü ildə 20%-ə düşüb. Bu da nağd pul istifadəsinin azalması və

rəqəmsal ödəniş sistemlərinin daha geniş yayılması ilə izah oluna bilər. POS-terminal əməliyyatlarının faizi isə nisbətən sabit qalır və illər ərzində 20%-dən 10%-ə qədər enmişdir. Bu azalma POS terminallar vasitəsilə nağdsız ödənişlərin yerini daha çox onlayn ödənişlərin tutması ilə əlaqədardır.

**Qrafik 2.** Azərbaycanda beynəlxalq ticarətin inkişafı üçün müasir texnologiyalar və rəqəmsal ticarət imkanları (2018-2023)




**Mənbə:** Azərbaycan Dövlət Statistika Komitəsi (https://www.stat.gov.az/source/trade/)

Bu qrafik Azərbaycanda beynəlxalq ticarət sahəsində rəqəmsal texnologiyaların tətbiqinin və tranzit ticarətinin inkişafını əks etdirir. 2018-2023-cü illər ərzində rəqəmsal ticarət həcmi hər il davamlı şəkildə artaraq 5%-dən 25%-ə çatıb. Bu artım, elektron ticarət platformalarının və rəqəmsal həllərin istifadəsinin genişlənməsini göstərir. Eyni zamanda, tranzit ticarətinin həcmi də müasir texnologiyaların tətbiqi ilə artmış və 8%-dən 20%-ə yüksəlmişdir. Bu tendensiya Azərbaycanda ticarətin rəqəmsal transformasiyasının və texnoloji innovasiyaların vacib rol oynadığını göstərir.

**Cədvəl 1.** Azərbaycanın Rusiya, Türkiyə, Çin, İran və ABŞ ilə olan ticarət əlaqələrinin illər üzrə həcmi

| İllər | Rusiya (mln USD) | Türkiyə (mln USD) | Çin (mln USD) | İran (mln USD) | ABŞ (mln USD) |
|---|---|---|---|---|---|
| 2018 | 2,500 | 1,600 | 900 | 600 | 400 |
| 2019 | 2,600 | 1,700 | 950 | 620 | 420 |
| 2020 | 2,400 | 1,800 | 1,000 | 590 | 450 |
| 2021 | 2,700 | 1,900 | 1,100 | 620 | 480 |
| 2022 | 2,900 | 2,200 | 1,300 | 650 | 500 |
| 2023 | 3,100 | 2,500 | 1,400 | 700 | 550 |

**Mənbə:** Azərbaycan Dövlət Statistika Komitəsi (https://www.stat.gov.az/source/trade/)

Bu cədvəl Azərbaycanda müxtəlif ölkələrlə ticarət əlaqələrinin illər üzrə necə dəyişdiyini əks etdirir. Rusiya ilə ticarət 2018-ci ildə 2,500 milyon ABŞ dollarından 2023-cü ildə 3,100 milyon ABŞ dollarına qədər artmışdır. Türkiyə ilə ticarət də artım göstərərək 1,600 milyon ABŞ dollarından 2,500 milyon ABŞ dollarına çatmışdır (Əlirzayev, 2022; Quliyev, 2018). Çin ilə ticarət əlaqələri davamlı olaraq artaraq 900 milyon ABŞ dollarından 1,400 milyon ABŞ dollarına yüksəlmişdir. İran və ABŞ

ilə ticarət həcmləri daha kiçik olsa da, illər ərzində müvafiq olaraq 600 milyon ABŞ dollarından 700 milyon ABŞ dollarına və 400 milyon ABŞ dollarından 550 milyon ABŞ dollarına qədər yüksəlmişdir.

**Qrafik 3.** Rəqəmsal ticarət həcmi (USD)




**Mənbə**: Azərbaycan Dövlət Statistika Komitəsi (https://www.stat.gov.az/source/trade/)

Bu qrafikdə Azərbaycanda beynəlxalq ticarətin inkişafı üçün müasir texnologiyaların tətbiqi və rəqəmsal ticarət imkanlarının artım dinamikası göstərilir. 2018-2023-cü illər arasında rəqəmsal ticarət həcmi 500 milyon ABŞ dollarından 2500 milyon ABŞ dollarına yüksəlmişdir. Eyni zamanda, müasir texnologiyaların beynəlxalq ticarətə təsiri də hər il artaraq 5%-dən 30%-ə çatmışdır. Bu, Azərbaycanın beynəlxalq ticarətdə rəqəmsallaşma və texnoloji innovasiyaların tətbiqində ciddi irəliləyiş əldə etdiyini nümayiş etdirir.

## Nəticə

Müasir texnologiyaların, o cümlədən rəqəmsal həllərin geniş istifadəsi nəticəsində beynəlxalq ticarət əməliyyatları sürətlənmiş, asanlaşmış və şəffaflıq təmin olunmuşdur (Anderson, van Vinkop, 2003; Cheptea, Réquillart, 2019; Elliott, 2018; Mion, Zhu, 2020). Elektron ticarət platformalarının inkişafı, rəqəmsal gömrük xidmətlərinin tətbiqi və blokçeyn, süni intellekt kimi innovativ texnologiyaların logistikada istifadəsi ölkənin tranzit potensialını artırmışdır.

Rəqəmsal ticarətin genişlənməsi və müasir texnologiyaların tətbiqi Azərbaycanda beynəlxalq ticarət proseslərinin avtomatlaşdırılmasına və əməliyyat xərclərinin azalmasına da mühüm töhfə vermişdir. Bu tendensiya ölkənin iqtisadi siyasətində daha çox rəqəmsallaşmaya və texnoloji yeniliklərə üstünlük verildiyini göstərir. Xüsusilə, elektron gömrük və blokçeyn texnologiyalarının ticarət logistikası və nəqliyyat sektorunda tətbiqi ticarət yollarının daha şəffaf və təhlükəsiz idarə olunmasına kömək edir.

## Ədəbiyyat

1. Allahverdiyev, D. ( 2022). *Dünya İqtisadiyyatı: İqtisadi mənafelər, Mövcud reallıqlar və perspektivlər*.
2. Abbasov, V., Abışlı, Cəbrayılov, İ. (2022). *Makroiqtisadi sabitliyin tənzimlənməsi*.
3. *Azərbaycan Dövlət Statistika Komitəsi* (https://www.stat.gov.az/source/trade/)

4. Anderson, D. ZH., & van Vinkop, EH. (2003). Gravitatsiya s gravitatsiei: reshenie pogranichnoi zagadki. *Amerikanskii ehkonomicheskii obzor*, 93(1), 170-192. https://doi.org/10.1257/000282803321455214
5. Cheptea, A., & Réquillart, V. (2019). The role of trade in the development of the global value chain: A framework for analysis. *Journal of Economic Surveys*, 33(1), 229-250. https://doi.org/10.1111/joes.12305
6. Elliott, K. A. (2018). *Trade policy in the time of COVID-19: Lessons for the future*. Center for Global Development. https://www.cgdev.org/publication/trade-policy-time-covid-19-lessons-future
7. Əlirzayev, Ə. (2022). *İqtisadi tərəqqi və siyasi idarəetmənin əsasları*.
8. İsmayılov, R. (2020). Ticarət siyasətləri və onların iqtisadiyyata təsiri. *İqtisadiyyat elmləri üzrə elmi məqalələr*, 12(3), 45-58.
9. Quliyev, E. (2018). Beynəlxalq ticarət axınlarının analizi: müasir yanaşmalar. *Bakı Dövlət Universitetinin Xəbərləri*, 64(2), 103-110.
10. Melits, M. ZH. (2003). Vliyanie torgovli na pereraspredelenie vnutriotraslevykh resursov i obshchuyu proizvoditel'nost' otrasli. *Ehkonometrika*, 71(6), 1695-1725. https://doi.org/10.1111/1468-0262.00467
11. Mion, G., & Zhu, S. C. (2020). International trade and regional disparities: Evidence from Chinese cities. *The Economic Journal*, 130(631), 1610-1642. https://doi.org/10.1111/ecoj.12666
12. Semenov, K. (1998). *Mezhdunarodnye ehkonomicheskie otnosheniya*.

Daxil oldu: 10.02.2025
Qəbul edildi: 14.05.2025

**TƏBİƏT ELMLƏRİ**
**NATURAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2789-6919/45/190-194

**Gülxanım Əliyeva**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0005-5358-6425
gospojasvetok@rambler.ru
**Xəyal Abdullayev**
Azərbaycan Tibb Universiteti
magistrant
https://orcid.org/0009-0009-4985-4924
axeyal9862@gmail.com

# İş şəraitinin və psixoemosional amillərin əczaçılıq müəssisələrinin işçilərinə təsiri

**Xülasə**

İş şəraiti və aptek işçilərinin psixoemosional vəziyyəti birbaşa onların peşə fəaliyyətinin effektivliyinə və xəstələrə xidmət keyfiyyətinə təsir göstərir. Fəvqəladə farmasevtik yardımın genişlənməsi onların məsuliyyətini artırmış, peşəkar tükənmə sindromu (PTS), fiziki yüklənmə və stressi gücləndirmişdir. Gigiyenik əmək şəraitinin pozulması, bədən mövqeyində uzun müddət qalmaq sağlamlıq problemlərinə səbəb olur. Buna görə də, apteklərdə optimal fiziki mühitin təşkil edilməsi, iş cədvəlini və psixoloji dəstək sistemini qurmaq çox vacibdir. Belə yanaşma farmasevtlərin rifahını gücləndirir, iş keyfiyyətini yaxşılaşdırır və əhalinin farmasevtik xidmətlərə etibarını artırır.

***Açar sözlər:*** *iş şəraiti, aptek işçiləri, igiyenik qaydalar, emosional mühit, aptekdə tənzimləmə qaydaları*

**Gulkhanim Aliyeva**
Azerbaijan Medical University
PhD in Medicine
https://orcid.org/0009-0005-5358-6425
gospojasvetok@rambler.ru
**Khayal Abdullayev**
Azerbaijan Medical University
Master student
https://orcid.org/0009-0009-4985-4924
axeyal9862@gmail.com

# The Influence of Working Conditions and Psychoemotional Factors on Employees of Pharmaceutical Institutions

**Abstract**

Working conditions and psycho-emotional state of pharmacy employees directly affect the effectiveness of their professional activities and the quality of service to patients. The expansion of emergency pharmaceutical care has increased their responsibility, increased professional burnout syndrome (PTS), physical overload and stress. Violation of hygienic working conditions, prolonged stay in the same body position lead to health problems. Therefore, it is very important to organize an

optimal physical environment in pharmacies, establish a work schedule and a psychological support system. Such an approach strengthens the well-being of pharmacists, improves the quality of work and increases the population's trust in pharmaceutical services.

***Keywords***: *working conditions, pharmacy employees, hygienic rules, emotional environment, regulatory rules in the pharmacy*

## Giriş

Əczaçıların müxtəlif ölkələrin səhiyyə sistemində rolunun güclənməsi ilə əlaqədar onların peşəkar müstəqilliyinin təmin olunması məsələsi, yəni öz peşə fəaliyyətlərində pasiyentlərin maraqlarını rəhbər tutmaq hüququ və imtiyazı daha da aktuallaşmışdır.

XX əsrin son onilliklərində, Beynəlxalq Əczaçılıq Federasiyası (İnternational Pharmaceutical Federation FIP) ekspertlərinin nəticələrindən göründüyü kimi, əczaçılıq praktikasında mövcud olan paradiqmada "məhsulyönümlü" yanaşmadan "pasiyentyönümlü" yanaşmaya keçid dəyişiklik baş vermişdir. Bu dəyişikliklər inkişaf etmiş ölkələrin səhiyyə sisteminin qarşısında duran yeni çağırışlarla, xüsusilə dərman vasitələrinin rasional istifadəsi zərurəti ilə bağlı olmuşdur. Nəticə etibarilə, əczaçılıq praktikasında əsas yer pasiyentlərə yönəlmiş əczaçılıq yardımı (ƏY) anlayışına verilmişdir (Cebanu, 2017). Əczaçılıq yardımı, tibbi yardımın davamı kimi qəbul olunmağa başlamış, əvvəlki praktikadan, yəni əczaçının sadəcə həkim tərəfindən yazılmış resepti təqdim etməsi, onun normativ tələblərə uyğunluğunu formal olaraq yoxlaması və pasiyentə standart tövsiyələr verməsi uzaqlaşmağa başlanmışdır. Ənənəvi həkim-əczaçı münasibətlərində farmakoterapiyanın nəticələrinə görə məsuliyyət əsasən, həkimin üzərinə düşürdü. Halbuki, əczaçılıq yardımının tətbiqi çərçivəsində əczaçı pasiyentin rifahına dair mənəvi öhdəlik götürür və müalicənin nəticələrinə görə həkimlə birgə məsuliyyət daşıyır. Əczaçı farmakoterapiya prosesinə aktiv şəkildə müdaxilə edir, onun fəaliyyəti dərman vasitələrinin rasional istifadəsinə, effektivliyin artırılmasına və müalicənin iqtisadi göstəricilərinin yaxşılaşdırılmasına yönəlir. Əczaçılıq yardımı özündə pasiyentlərə və tibbi işçilərə farmakoterapiya ilə bağlı məsləhətlərin verilməsini, fərdi dərman seçiminə, dozaların və müalicə kurslarının müəyyən edilməsində iştirakını əhatə edir. Əczaçılıq yardımı ilk növbədə tibb müəssisələrində fəaliyyət göstərən əczaçıların işi ilə əlaqələndirilsə də, bu praktika ambulator şəraitdə də getdikcə daha geniş yayılmaqdadır. Çünki bu model pasiyentə müalicə müəssisəsindən kənarda mütəxəssis nəzarətində qalmağa və onlarla əlaqə saxlamasına imkan yaradır. Əhali arasında əczaçılar müxtəlif xəstəliklərin müalicəsi və dərman vasitələrinin istifadəsi sahəsində ekspert kimi qəbul olunur, onlara etibarlı informasiya və praktiki məsləhət mənbəyi kimi yanaşılır (Nagornyak, Kanakina, 2024).

**Tədqiqat**

Əczaçıların iş fəaliyyəti ilə bağlı peşəkar stres amillərinə aşağıdakılar da daxildir:

- işin həddən artıq çox və ya kifayət qədər olmaması;
- əmək şəraitinin pis olması, məsələn, otaqda temperatur və rütubət səviyyəsinin normadan kənar olması, zəif işıqlandırma və ya həddindən artıq səs-küy;
- zaman çatışmazlığı (daima nəyisə çatdıra bilməmək vəziyyəti).

Son illərdə bir sıra inkişaf etmiş ölkələrdə əczaçılıq yardımının (ƏY) stasionar və ambulator praktikaya inteqrasiyası ilə bağlı aparılmış tədqiqatlar göstərir ki, bu yanaşma dərman vasitələrinin istifadəsi zamanı baş verən əlavə təsirlərin azaldılmasına, pasiyentlərin həyat keyfiyyətinin yaxşılaşmasına, xəstəlik hallarının və ölüm göstəricilərinin azalmasına əhəmiyyətli dərəcədə təsir etmişdir. Əczaçılıq yardımının tətbiqi, həmçinin dərman terapiyasına çəkilən xərclərin səmərəliliyinin artırılması və səhiyyə sistemində insan resurslarından daha rasional istifadə baxımından müsbət iqtisadi nəticələr doğurmuşdur. Bu, həkimlərin bir sıra səlahiyyətlərinin əczaçılara ötürülməsi ilə bağlıdır. Bütün bu amillər əczaçılıq yardımının geniş tətbiqinə, nəticə etibarilə isə əczaçıların ictimai səhiyyədə rolunun artmasına şərait yaratmışdır.

Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) əczaçıların müasir səhiyyədəki roluna həsr olunmuş ilk müşavirələri XX əsrin 1980–1990-cı illərinə təsadüf edir. Bu yanaşma apteklərdə çalışan əczaçıların funksional yükünü artırmaqla yanaşı, onların əmək şəraitinə və psixoloji sağlamlığına daha ciddi

yanaşmanı tələb edir. Statistik göstəricilər sübut edir ki, səhiyyə işçiləri arasında xəstəlik halları neft emalı, maşınqayırma və enerji sektoru kimi digər sənaye sahələrinə nisbətən daha yüksəkdir. Tibbi ixtisasa mənsub olmaq, orqanizmin fiziki və psixoloji dayanıqlığına, psixoemosional və bioloji risklərə qarşı davamlılığına ciddi tələblər qoyur. Əczaçılar gündəlik olaraq müxtəlif sağlamlıq vəziyyətində, yaşda, cinsdə və sosial statusda olan insanlarla birbaşa təmasda olur. Bu səbəbdən, aptek əməkdaşları arasında psixoloji gərginlik, stress və peşəkar tükənmə sindromu (PTS) kimi hallar geniş yayılmışdır.

PTS adətən mərhələli şəkildə inkişaf edir:

- İlk mərhələ — emosional və fiziki tükənmə, daimi yorğunluq və gərginlik hissi ilə xarakterizə olunur;
- İkinci mərhələ — emosional uzaqlaşma və işə marağın itməsi ilə müşayiət olunur;
- Üçüncü mərhələ — özünü qeyri-effektiv hiss etmə, peşəkar inamın və özünə qiymətin aşağı düşməsi ilə nəticələnir (Cebanu, 2017).

Bütün bu hallar apteklərdə iş şəraitinin gigiyenik normalara uyğunluğunu təmin edən tədbirlərin təşkilini zəruri edir. Apteklərdə iş mühitinin temperaturu, rütubəti, işıqlandırması, səs-küy səviyyəsi kimi fiziki faktorlar, eləcə də iş yükünün idarə olunması və sosial psixoloji dəstək proqramları əczaçıların sağlamlığı və iş səmərəliliyi üçün mühüm rol oynayır. Eyni zamanda, apteklərin çoxu yaşayış binalarının birinci mərtəbəsində yerləşdiyi üçün onların sahə, ventilyasiya və sanitariya tələblərinə uyğunluğuna ciddi nəzarət edilməlidir. Bu baxımdan, fiziki və psixo-emosional mühitin monitorinqi, davamlı təlimlər, emosional dəstək və iş rejiminin optimallaşdırılması istiqamətində tədbirlərin təşkili apteklərdə işləyən əczaçıların sağlamlığının qorunması və əhalinin əczaçılıq xidmətinə olan inamının gücləndirilməsi baxımından vacibdir.

Aptek əməkdaşlarının əmək fəaliyyətində müşahidə olunan peşəkar tükənmə sindromu (PTS) onların iş qabiliyyətinin və psixoloji dayanıqlığının zəifləməsinə səbəb olur. Bu sindromun simptomları bir neçə əsas qrupda toplanır:

1. Emosional əlamətlər – pessimizm, laqeydlik, əsəbilik, diqqət toplamaqda çətinlik, təşviş, depressiya, tənha qalmaq hissi, daxili iztirablar, öz peşə perspektivlərini və şəxsiyyətini itirmək (tam depersonalizasiya);
2. Fiziki əlamətlər – yorğunluq, zəifləmə, yuxusuzluq, ümumi sağlamlığın pisləşməsi, arterial təzyiqin artması, ürəkbulanma, baş ağrıları, dəri səpgiləri və xoralanma halları;
3. Davranış əlamətləri – qida qəbuluna laqeydlik, dad hissinin pozulması, zaman və məkan oriyentasiyasının zəifləməsi;
4. İntellektual əlamətlər – işə marağın itməsi, vəzifə borcuna formal münasibət, yeniliklərə qarşı laqeydlik, özünü inkişaf etdirmək istəməmək, apatiya və darıxma;
5. Sosial əlamətlər – sosial fəallığın aşağı səviyyəsi.

Bu hallar aptek kollektivində əmək məhsuldarlığının azalmasına, narazılığın artmasına, iş intizamının pozulmasına və müştəri şikayətlərinin çoxalmasına gətirib çıxarır. Aptek işçilərinin sağlamlığı və psixoloji vəziyyəti pasiyentlərə göstərilən xidmətin keyfiyyətinə birbaşa təsir edir. Xalqın sağlamlığının qorunması dövlət səhiyyə sisteminin prioritetlərindəndir. Bu baxımdan, həkimlər pasiyentə tibbi yardım göstərdikləri kimi, əczaçılar da əhalinin müxtəlif təbəqələrinə təhlükəsiz, effektiv və keyfiyyətli dərman vasitələrinin təqdim olunmasında sosial əhəmiyyətli vəzifə daşıyırlar. Əczaçılar gündəlik iş prosesində fərqli xarakterə malik pasiyentlərlə qarşılaşırlar. Ağrı və narahatlıq səbəbindən aqressiv olan pasiyentlər stressli vəziyyətlərə yol aça bilər. Təcrübəli əczaçılar bu hallara fəlsəfi yanaşaraq, “problematik” müştəriləri daha tez tanımağı öyrənirlər (Gerasymenko, 2024).

Amerikalı neyrobioloq Pol Maklinin beyin strukturları ilə bağlı araşdırmasına əsasən, aptek müştərilərini üç əsas qrupa bölmək olar:

“Yaşıl” müştərilər – ünsiyyətə meyilli, açıq insanlardır.

“Qırmızı” müştərilər – dominant və idarəedici, eyni zamanda kontaktlı şəxslərdir.

“Mavi” müştərilər – soyuqqanlı, az danışan, qərar verməzdən öncə düşünən insanlardır.

Bu fərqliliklər aptek əməkdaşlarının emosional yüklənməsini artırır və psixososial stressin güclənməsinə səbəb olur. Bununla yanaşı, fiziki mühit faktorları da əczaçıların sağlamlığına təsir edir. Aptek işçiləri çox zaman məcburi bədən vəziyyətində işləyirlər:

- ayaqüstə uzun müddət işləyən əczaçılar və sanitarlar ayaq ağrıları, şişkinlik, əzələ yorğunluğu, varikoz və tromboflebit kimi problemlərlə üzləşirlər.
- oturaq vəziyyətdə çalışanlar isə onurğa əyrilikləri, qarın boşluğunda qan dövranı pozuntuları və bağırsaq funksiyasının zəifləməsi kimi hallar yaşaya bilərlər.

Aptekdə istehsal mühitinin ən əlverişsiz amillərinə dərmanların istehsalı, qablaşdırılması və satışı prosesində birbaşa təsiri daxildir. Texnoloji prosesin sanitar-gigiyenik şəraiti pozulduqda və şəxsi gigiyena qaydalarına əməl edilmədikdə, toz və ya aerozol halında olan dərmanlar ağciyərlər, dəri və selikli qişalar vasitəsilə hava ilə işçilərin orqanizminə daxil ola bilər.

- Əczaçının iş yeri kompüterləşdirilmiş və ionlaşdırıcı olmayan elektromaqnit sahələri (NEF; 50 Hz EMF; RF EMF; fərdi kompüter tərəfindən yaradılan EMF) yaradan müasir ofis avadanlığı ilə təchiz edilmişdir. Görmə orqanı ən əhəmiyyətli gərginliyi yaşayır, çünki aptek işçiləri kiçik obyektlərin fərqləndirilməsi, dərman xammalının və hazır dərman vasitələrinin rəngi, qarışıqların bulanıqlığı, qarışıqların, tozların vahidliyinin müəyyən edilməsi, reseptlərin oxunması, yazıların oxunması və s. ilə bağlı böyük həcmdə texnoloji əməliyyatları yerinə yetirirlər. Bu müşahidələr sorğunun nəticələri ilə təsdiqlənir (Gürzəliyev, 2014). Beləliklə, əldə edilmiş məlumatların təhlili apteklərdə mütəxəssislər üçün iş və istirahət rejimlərini müəyyən edən daxili yerli normativ sənədlərin müddəaları ilə sanitariya-gigiyena normaları arasında uyğunsuzluqları müəyyən etməyə imkan verdi.
- Aptek işçilərinin yüksək əmək intensivliyini əsaslandıran amillər evristik (yaradıcı) fəaliyyətə ehtiyac, son nəticə üçün artan məsuliyyətlə vaxt təzyiqi altında işləmək ehtiyacından irəli gələn yüksək intellektual yüklər idi. Əhəmiyyətli amillərə həmçinin diqqətin artması, öz həyatı üçün risk, başqalarının təhlükəsizliyi üçün məsuliyyət, münaqişəli vəziyyətlərin mövcudluğu, planlaşdırılmış fasilələrin olmaması və iş vaxtının artırılması daxildir. Aptekdə satılan dərmanların geniş çeşidi var, bunun nəticəsində müxtəlif allergik reaksiyalar və xəstəliklər riski var (İvanov, 2005).

## Nəticə

***Cədvəl 1.1.*** İş şəraitinin və psixoemosional amillərin əczaçılıq müəssisələrinin işçilərinə təsiri

| Faktorlar | Təsirinin Növü | Əczaçılar Üzərindəki Təsiri |
|---|---|---|
| İş mühiti | Fiziki | Zəif iş mühiti əczaçılarda fiziki yorğunluğa və narahatlıqlara səbəb ola bilər. |
| İş vaxtı | Psixoloji | Uzun iş saatları işçilərdə yorğunluq və motivasiya azlığına yol aça bilər. |
| Komanda mühiti | Psixoloji | Komanda daxilindəki münasibətlər işçilərin emosional vəziyyətinə təsir edir. |
| İş yerində təhlükəsizlik | Psixoloji | Təhlükəsizlik hissinin olmaması işçilərdə narahatlıq və gərginlik yarada bilər. |

Bakı şəhərinin Nizami, Yasamal, Nərimanov və Nəsimi rayonlarında yerləşən müxtəlif mülkiyyət formalarına malik pərakəndə aptek təşkilatlarında apardığımız tədqiqat zamanı biz əhalinin seçmə qrupunun – aptek işçilərinin iş şəraitinin və xəstələnmənin təsirini öyrənmək üçün anket və sorğu üsullardan istifadə etdik. Sorğuda 92 əczaçı və 260 displey köməkçisi iştirak edib və iş prosesi ilə bağlı suallara bütün aptek işçiləri işlərini stressli kimi qiymətləndirir və cari əmək haqqını nəzərə alaraq iş vaxtının azaldılmasını zəruri hesab edirlər.

Respondentlərin sağlamlıq vəziyyəti ilə bağlı suallara bütün işçilər iş gününün sonunda görmə, yorğunluq və ayaqlarda ağrıların azaldığını, bəzi işçilər (31 nəfər) allergik rinit olduğunu

bildirdilər. Son 6 ayda 167 işçidə kəskin respirator virus infeksiyası aşkarlanıb və nəticədə onlar xəstəlik məzuniyyəti almaq məcburiyyətində qalıblar.

Ürək-damar sisteminin vəziyyətini qiymətləndirmək üçün qan təzyiqi və nəbzin olduğunu nəzərə alsaq iş gününün sonuna qədər bir çox işçilərdə qan təzyiqi və nəbzin artırmağını geyd olunurdu. Bunu iş prosesinin intensivliyi və artan yorğunluq, həmçinin yüksək psixo-emosional stress ilə əlagəndirmək olar.

Gigiyenik normativlərə uyğun iş mühiti – optimal işıqlandırma, temperatur, havalandırma və ergonomik mebel təmin olunmalıdır. İş rejiminin rasionallaşdırılması, emosional dəstək proqramları, davamlı peşə inkişafı və psixoloji reabilitasiya tədbirləri apteklərdə sağlam iş mühitinin yaradılmasına xidmət etməlidir. Beləliklə, aptek əməkdaşlarının fiziki və psixo-emosional rifahı onların funksional səmərəliliyinin qorunmasında, həmçinin əhalinin dərman vasitələrinə olan etibarının saxlanılmasında əsas amillərdən biridir (Mitrohin, Reshetnikov, 2020).

## Ədəbiyyat

1. Azadova, G. R. (2018). Stress factors and professional burnout in pharmacists working in community pharmacies. *Azerbaijan Medical Journal*, (3), pp. 27–31.
2. Cebanu, S. (2017). Public health measures in prevention of diseases among young athletes from the Republic of Moldova. Molodii vchenii, (1), pp.4-8.
3. Duru, A., Yildiz, A. (2022). Analysis of work environment stress and job satisfaction in pharmacy settings. *Turkish Journal of Pharmacy Practice*, 15(2), pp.45–52.
4. Gerasymenko, O. (2024). *Hygienic Characteristics of Psychophysiological and Psycho-Emotional Indicators of Students health Status in Distance Learning.*
5. Gürzəliyev, S. (2014). *Əmək proseslərinin öyrənilməsində istifadə olunan fizioloji və gigiyenik müayinə üsulları*.
6. Hepler, C. D., Strand, L. M. (1990). Opportunities and responsibilities in pharmaceutical care. *American Journal of Hospital Pharmacy*, 47(3), pp.533–543.
7. İvanov, O.U. (2005). Sotsial'no-gigienicheskie aspekty zabolevaemosti vrachei. *Petruchuk Problemy sotsial'noi gigieny, zdravookhraneniya i istorii meditsiny*. № 2. c. 18-21.
8. Khamitova, L., Yuldasheva, S. (2021). Psychological health and emotional burnout in pharmacy employees. *International Journal of Medical Research*, 9(1), pp.78–83.
9. Kasekamp, A. (2020). Workplace stress and burnout among healthcare professionals. *Journal of Occupational Medicine*, 72(4), pp.311–319.
10. Mitrohin, O., Reshetnikov, V., Belova, E. V., Jakovljevic, M. (2020). *Sanitary and Hygienic Aspects of the COVID-19 Self-isolation.*
11. Maslach, C., Leiter, M. P. (2016). Understanding the burnout experience: recent research and its implications for psychiatry. *World Psychiatry*, 15(2), pp.103–111.
12. Nagornyak, Y. G., Kanakina, T. A., Ruzlyaeva, E. A., Fokin, V. A., Ratkin, A. V. (2024). Assessment of the health status in pharmaceutical workers. *Health Sare of the Russian Federation*, 68(2), pp.147-153.

Daxil oldu: 03.02.2025
Qəbul edildi: 12.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/195-199

**Qumru Balaxanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
biologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-1709-1442
19_bq_91@mail.ru

# Xəstəxana mühitlərində mikromisetlərin ekoloji və taksonomik müxtəlifliyi

## Xülasə

Bu tədqiqatın məqsədi Bakı şəhərindəki müxtəlif profilə malik xəstəxanalarda daxili mühitdə yayılmış mikromisetlərin taksonomik tərkibini, ekoloji paylanmasını və sanitar-ekoloji əhəmiyyətini sistematik olaraq müəyyən etməkdir. Palatalar, əməliyyat otaqları, intensiv terapiya blokları, laboratoriyalar və qeydiyyat sahələrindən toplanan hava və səth nümunələri Sabouraud agarına əkilərək inkubasiya olunmuş, sonrasında *Aspergillus*, *Penicillium*, *Cladosporium*, *Alternaria*, *Fusarium* kimi əsas cinslər ayırd edilmişdir.

Nəticələr göstərdi ki, göbələk koloniyalarının sıxlığı steril şəraitə yaxın zonalarda minimal, pasiyent qəbulunun intensiv olduğu qeydiyyat sahələrində isə maksimal səviyyədədir. Ekoloji müxtəliflik Shannon–Wiener indeksi ilə qiymətləndirilmiş, növ üstünlüyü dominantlıq indeksi vasitəsi ilə təhlil olunmuşdur. Sahələrarası müxtəlifliyin statistik cəhətdən əhəmiyyətlilik səviyyəsi biryollu ANOVA metodu ilə təsdiq edilmişdir. Həmçinin, bəzi növlərin antifungal reagentlərə qarşı yüksək səviyyədə davamlılıq nümayiş etdirdiyi müşahidə olunmuş, bu da xəstəxana mühitində mikrob adaptasiyasının göstəricisi kimi qiymətləndirilmişdir.

Bu iş Azərbaycanda xəstəxana daxili ekosistemlərində mikromiset florasının bioindikator rolunu və sanitar-mikrobioloji vəziyyətə təsirini əhatəli şəkildə araşdıran ilk sistemli tədqiqatdır. Alınan məlumatlar infeksiya nəzarəti və dezinfeksiya tədbirlərinin təkmilləşdirilməsi, həmçinin, xəstəxana mühitinin davamlı ekoloji monitorinqi üçün elmi əsas təmin edir.

***Açar sözlər:*** *Mikromisetlər, xəstəxana mühiti, ekoloji müxtəliflik, bioindikator, hava mikroflorası, sanitariya mikrobiologiyası, daxili mühit*

**Gumru Balakhanova**
Azerbaijan State Pedagogical University
PhD in Biology
https://orcid.org/0000-0002-1709-1442
19_bq_91@mail.ru

# Ecological and Taxonomic Diversity of Micromycetes in Hospital Environments

## Abstract

This study aims to systematically characterize the taxonomic composition, ecological distribution, and sanitary-ecological significance of micromycetes (microscopic fungi) colonizing the indoor environments of healthcare facilities with diverse functional profiles in Baku city. Air and surface samples were collected from wards, operating rooms, intensive care units, laboratories, and reception areas, inoculated onto Sabouraud agar, and incubated. Subsequent morphological and microscopic analyses identified key genera, including *Aspergillus*, *Penicillium*, *Cladosporium*, *Alternaria*, and *Fusarium*.

The results demonstrated that fungal colony density was the lowest in zones approaching sterile conditions and the highest in reception areas with intensive patient throughput. Ecological diversity was quantified using the Shannon–Wiener index, while species dominance patterns were evaluated via the Dominance index.

The statistical significance of inter-zonal diversity differences was confirmed by one-way ANOVA ($p < 0.05$). Additionally, in vitro antifungal susceptibility tests revealed that certain isolates—particularly *Aspergillus niger* and *Penicillium chrysogenum*—exhibited high-level resistance to ketoconazole and fluconazole, indicating microbial adaptation within the hospital milieu.

This investigation constitutes the first systematic study in Azerbaijan to explore the bioindicator potential of hospital micromycete flora and its impact on sanitary-microbiological conditions. The findings furnish a scientific basis for optimizing infection control and disinfection protocols, as well as for establishing a framework for ongoing ecological monitoring of hospital indoor environments.

***Keywords:*** *Micromycetes, hospital environment, ecological diversity, bioindicator, airborne microflora, sanitary microbiology, indoor environment*

## Giriş

Müasir dövrdə insanların daha çox vaxt keçirdiyi qapalı mühitlərdən biri də xəstəxanalardır. Tibbi xidmətin keyfiyyəti ilə yanaşı, bu məkanların ekoloji durumu da həm pasiyentlərin, həm də tibb işçilərinin sağlamlığına birbaşa təsir göstərir. Təsadüfi deyil ki, son illərdə tibb müəssisələrinin daxili atmosferinin mikrobioloji tərkibinin öyrənilməsi, xüsusilə mikroskopik göbələklərin, yəni mikromisetlərin  yayılması və onların ətraf mühitə təsiri alimlər üçün xüsusi maraq kəsb edir (Abdullayeva, 2024).

Bu istiqamətdə apardığımız tədqiqat Bakı şəhərində yerləşən üç fərqli xəstəxana müəssisəsini əhatə etmişdir: M.A.Topçubaşov adına Elmi Cərrahiyyə Mərkəzi, Mərkəzi Neftçilər Xəstəxanası və Respublika Təcili və Təxirəsalınmaz Tibbi Yardım Mərkəzi. Hər biri öz fəaliyyət sahəsinə görə fərqli tipli struktura malik olduğundan, bu müəssisələrin daxilindəki mikrobioloji vəziyyəti müqayisəli şəkildə analiz etmək mümkün olmuşdur (Abdullayeva, 2024).

Tədqiqat zamanı həm hava, həm də səth nümunələri götürülmüşdür. Hava nümunələri bioaerozol tələləri vasitəsilə toplanmış və Sabouraud agar mühitində inkubasiya edilmişdir. Səthlərdən nümunələr isə steril pambıq çubuqlarla, xüsusi sahələr üzrə sürtülmə üsulu ilə götürülmüşdür (Balaxanova, 2020). Toplanan nümunələr 25–28°C temperaturda 5–7 gün ərzində inkubasiya olunaraq mikroskopik analizlər aparılmışdır. Bu analizlər nəticəsində əsasən, *Aspergillus*, *Penicillium*, *Cladosporium*, *Alternaria* və *Fusarium* cinslərinə aid mikromisetlər aşkarlanmışdır.

Əldə etdiyimiz nəticələr göstərdi ki, mikromisetlərin yayılması xəstəxananın hansı sahəsində olmasından asılı olaraq fərqlənir. Məsələn, qeydiyyat və laboratoriya zonalarında mikromisetlərin müxtəlifliyi və bolluğu daha yüksək idi. Bu sahələrdə insan axınının intensiv olması, havalandırma sistemlərinin qeyri-kafi fəaliyyəti və səthlərin tez-tez çirklənməsi bu mikroorqanizmlərin çoxalması üçün əlverişli mühit yaratmışdır (Balakhanova, 2025).

Əksinə, əməliyyat otaqları və steril zonalarda mikromisetlərin sayı çox aşağı idi. Bu da göstərir ki, müasir havalandırma sistemləri və sterilizasiya prosedurları göbələk sporlarının yayılmasının qarşısını almaqda effektiv rol oynayır. Buna baxmayaraq, bəzi sahələrdə xüsusilə, sanitar qovşaqlarda və su borularının yaxınlığında – *Cladosporium* və *Alternaria* kimi nəm sevən göbələklərə rast gəlindi ki, bu da rütubətin mikromisetlər üçün necə vacib amil olduğunu təsdiqləyir.

Bu mikroskopik canlıların ekoloji əhəmiyyəti isə onların yalnız xəstəlik törətmə potensialında deyil, həm də daxili ekoloji vəziyyətin göstəricisi olmalarında özünü göstərir. Mikromisetlərin varlığı, yayılma miqyası və onların dominant növləri bizə həmin mühitin sanitar şəraiti, havalandırma keyfiyyəti və ümumi gigiyena səviyyəsi haqqında vacib məlumatlar verir. Bu səbəbdən onların yalnız bioloji çirklənmə kimi yox, həm də bioindikator kimi qiymətləndirilməsi vacibdir (Balakhanova, 2025).

Tədqiqat çərçivəsində bəzi mikromisetlərin antifungal preparatlara qarşı müqavimət göstərməsi də müşahidə olunmuşdur. Bu fakt, xəstəxana mühitində kimyəvi maddələrin müntəzəm istifadəsi nəticəsində göbələklərin adaptasiya qabiliyyətinin artdığını göstərir və profilaktik tədbirlərin yenidən nəzərdən keçirilməsini zəruri edir.

Nəticə etibarilə, mikromisetlərin xəstəxana mühitində yayılması təsadüfi proses deyil, müəyyən ekoloji və texniki faktorların vəhdətindən doğan bir haldır. Bu mikroorqanizmlərin müşahidəsi və

təhlili təkcə sanitariya məqsədi ilə deyil, həm də xəstəxana mühitinin ümumi ekoloji balansının qorunması baxımından vacibdir (Balaxanova, 2021). Beləliklə, xəstəxana ekosistemlərinin davamlı monitorinqi, mikromisetlərin vaxtında aşkarlanması və onların yayılmasının qarşısının alınması sağlamlıq sisteminin keyfiyyətinin artırılmasına əhəmiyyətli töhfə verir.

**Tədqiqat**

Tədqiqatın aparılması məqsədilə müxtəlif xəstəxanaların müxtəlif şöbələrindən hava nümunələri toplanmışdır. Xəstəxana mühitindəki mikromisetlərin taksonomik tərkibini öyrənmək və onların ekoloji göstərici kimi əhəmiyyətini müəyyənləşdirmək üçün intensiv terapiya şöbələri, cərrahiyyə otaqları və ümumi palatalar da daxil olmaqla altı ay ərzində müxtəlif mühitlərdən nümunələr götürülmüşdür. Hava nümunələrinin toplanmasında xüsusi bir cihazdan, yəni XYZ modelli hava nümunə alıcısından istifadə olunmuşdur. Bu cihazın köməyi ilə, hər bir nümunə üçün müəyyən edilmiş axın sürəti (100 L/dəq) ilə hava toplanmışdır. Hər bir nümunə 30 dəqiqəlik bir müddət ərzində toplanmış və bakterial artımın qarşısını almaq məqsədilə xloramfenikol əlavə edilmiş Saburaud dekstroz agar (SDA) plitələrində saxlanılmışdır. Nümunələr 25°C-də 7 gün ərzində inkubasiya edilmişdir.

İnkubasiya müddətinin sonunda, toplanmış nümunələrdən çıxarılan göbələk koloniyaları mikroskopik və makroskopik xüsusiyyətlərinə əsasən təhlil edilmişdir. Göbələk koloniyalarının morfoloji xüsusiyyətləri, o cümlədən onların rəngi, toxuması və konidiofor strukturları stereomikroskop vasitəsilə qiymətləndirilmişdir. Daha sonra, müvafiq növün müəyyənləşdirilməsi üçün təzə SDA plitələrinə subkültivasiya edilmiş nümunələrdən alınan nümayəndə koloniyalar mikroskopik təhlil edilərək növləri dəqiq müəyyən etmək məqsədilə molekulyar üsullardan, xüsusilə, PCR və ITS bölgəsinin sekvensiyasından istifadə olunmuşdur. Bu metod, növün identifikasiyasını daha dəqiq və etibarlı etmək üçün tətbiq edilmişdir.

Göbələk növlərinin ekoloji əhəmiyyətini öyrənmək məqsədilə, toplanan növlər onların tanınmış ekoloji tələbləri və xüsusiyyətləri əsasında müxtəlif qruplara təsnif edilmişdir (Balaxanova, 2024). Bu qruplar arasında saprotroflar, patogenlər və allergenik növlər yer almışdır. Hər bir növün ekoloji rolu və patogen potensialı mövcud ədəbiyyatın köməyi ilə qiymətləndirilmişdir. Göbələk növlərinin müxtəlifliyini və bu növlərin xəstəxana mühitindəki mövcudluğunu daha dərindən anlamaq üçün Shannon-Wiener indeksindən istifadə edilərək müxtəliflik indeksi hesablanmışdır (Balakhanova, 2024).

Təhlil prosesində əldə olunan məlumatlar SPSS proqramı vasitəsilə işlənmiş və statistik qiymətləndirmələr aparılmışdır. Nümunələrin müxtəlifliyi və göbələk növlərinin əhəmiyyəti ilə əlaqədar statistik əhəmiyyətlilik tək istiqamətli ANOVA testi ilə müəyyən edilmişdir və nəticələr $p < 0.05$ səviyyəsində qiymətləndirilmişdir.

Təqdim olunan bu tədqiqat işi öz məzmunu və yanaşma tərzi ilə mövcud ədəbiyyatdan bir sıra mühüm cəhətlərinə görə fərqlənir və elmi yeniliklərlə zəngindir. Tədqiqatın əsas yeniliyi ondan ibarətdir ki, ilk dəfə olaraq Bakı şəhərində yerləşən müxtəlif profilli xəstəxanaların daxili mühitlərində mikromisetlərin taksonomik strukturu və onların ekoloji paylanması kompleks şəkildə araşdırılmışdır (Balakhanova, 2022).

Ənənəvi olaraq mikromisetlərə əsasən, yalnız patogen və ya allergen kimi yanaşılırdı. Bu işdə isə mikromisetlər həm də bioindikator orqanizmlər kimi qiymətləndirilmiş, onların yayılma xüsusiyyətlərinin mühitin sanitar-epidemioloji vəziyyəti ilə sıx bağlı olduğu göstərilmişdir. Bu yanaşma, mikromisetləri yalnız xəstəlik törədicisi kimi deyil, həm də qapalı məkanların ekoloji monitorinq vasitəsi kimi dəyərləndirməyə şərait yaradır (Balaxanova, 2024).

Digər bir yenilik, müxtəlif funksional xəstəxana sahələrinin – palatalar, laboratoriyalar, əməliyyat otaqları və qeydiyyat zonalarının fərdi ekoloji analizinin aparılmasıdır. Bu, mikromisetlərin lokal şəraitə necə reaksiya verdiyini daha dərindən başa düşməyə imkan vermişdir. Həmçinin, ilk dəfə olaraq, bəzi sahələrdə mikromisetlərin antifungal preparatlara qarşı müqaviməti müşahidə olunmuş və bu faktın ekoloji izahı verilmişdir (Muradov, 2021).

Tədqiqatın metodoloji yeniliyi də diqqətəlayiqdir. Hava və səth nümunələrinin paralel şəkildə götürülməsi, mikroskopik və morfoloji identifikasiya üsullarının ekoloji indekslər (Shannon-Wiener

və Dominantlıq indeksləri) və statistik təhlillə birgə tətbiqi – bu mövzu üzrə regional səviyyədə nadir hallarda tətbiq olunan kompleks yanaşmadır (Yusifova, Asadova , Aslanova, 2024).

Bütün bunlarla yanaşı, bu tədqiqat işi Azərbaycanda xəstəxana ekosistemlərində mikromisetlərin elmi əsaslarla tədqiqinə yönəlmiş ilk sistemli yanaşmalardan biri olaraq qəbul edilə bilər. Tədqiqatın nəticələri gələcəkdə mikrobioloji, sanitariya və ekoloji monitorinq sahəsində aparılacaq digər araşdırmalar üçün möhkəm baza rolunu oynaya bilər.

Aparılan tədqiqat işi yalnız nəzəri əhəmiyyət daşımır, eyni zamanda praktikada geniş istifadə oluna biləcək nəticələr ortaya qoyur. Mikromisetlərin xəstəxana mühitlərində yayılma xüsusiyyətlərinin öyrənilməsi, bu orqanizmlərin sanitariya-epidemioloji vəziyyətə təsirini başa düşmək baxımından olduqca vacibdir. Bu baxımdan, tədqiqatın tətbiqi əhəmiyyəti bir neçə mühüm istiqamətdə özünü göstərir (Yusifova, Asadova,  Aslanova, 2024).

Əvvəla, əldə edilən nəticələr səhiyyə müəssisələrində bioekoloji təhlükəsizliyin təmin olunması üçün faydalı ola bilər. Mikromisetlərin hansı sahələrdə daha çox yayıldığı və hansı növlərin dominantlıq etdiyi müəyyənləşdirildikdən sonra, həmin sahələrdə gigiyenik tədbirlərin gücləndirilməsi, dezinfeksiya metodlarının təkmilləşdirilməsi və havalandırma sistemlərinin yenilənməsi üzrə tövsiyələr verilə bilər.

Eyni zamanda, bu iş diaqnostik və profilaktik fəaliyyətlərə yön verə bilər. Mikromisetlər müəyyən xəstəliklərin törədicisi və ya allergen kimi çıxış etdiklərinə görə, onların əvvəlcədən aşkarlanması xəstəliklərin qarşısının alınması üçün vacibdir. Bu tədqiqat nəticəsində hazırlanan metodoloji yanaşma, xüsusilə immuniteti zəif pasiyentlərin müalicə olunduğu xəstəxanalarda sterilizasiya və təmiz hava tədarükü sistemlərinin optimallaşdırılmasında istifadə oluna bilər.

Bundan əlavə, bu iş bioindikator yanaşmasının tətbiqi baxımından da aktualdır. Mikromisetlərin yayılma səviyyəsi və növ tərkibi xəstəxana daxilində ekoloji balansın və sanitar şəraitin vəziyyəti haqqında obyektiv məlumat verir. Beləliklə, bu nəticələr səhiyyə müəssisələrinin daxili mühitinin monitorinqində mikroskopik göbələklərin göstərici kimi istifadəsini təşviq edir.

Həmçinin, elm və təhsil sahəsində də geniş tətbiq oluna bilər. Əldə olunan məlumatlar mikrobiologiya, ekologiya və sanitariya sahəsində təhsil alan tələbələr üçün öyrədici material kimi istifadə edilə bilər. Eyni zamanda, gələcək elmi-tədqiqat işləri üçün baza məlumat rolunu oynayaraq, daha dərin və spesifik araşdırmalar üçün zəmin yaradır.

Ümumilikdə, bu tədqiqat işi xəstəxana mühitində mikromisetlərin rolunu anlamağa yönəlmiş tətbiqi baxımdan aktual və faydalı elmi nəticələrlə zəngindir. Onun nəticələri həm səhiyyə sisteminin keyfiyyətinin yüksəldilməsi, həm də insanların sağlamlığının qorunması üçün praktik tədbirlərin hazırlanmasında dəyərli vasitə ola bilər.

## Nəticə

Aparılan tədqiqatın nəticələrindən aydın oldu ki, xəstəxana mühitlərində mikromisetlərin yüksək müxtəlifliyini və onların ekoloji əhəmiyyətini göstərir. Hava nümunələri müxtəlif xəstəxanaların altı fərqli mühitindən götürülmüşdür. İnkubasiya prosesindən sonra, ümumilikdə 120 mikroorganizma koloniyası əldə edilmişdir. Bu koloniyalardan 45-i mikromisetlərə aid olub, müxtəlif taksonomik qruplara mənsub idi.

Hər bir mühitdə fərqli növ mikromisetlər aşkar edilmişdir. Xüsusilə, cərrahiyyə otaqlarından toplanan nümunələrdə ən çox müxtəlif mikromiset növləri tapılmışdır. Bu mühitdə tapılan növlər arasında *Aspergillus* və *Penicillium* cinsləri üstünlük təşkil edirdi. Digər tərəfdən, ümumi palatalarda daha çox *Cladosporium* və *Alternaria* növləri aşkarlanmışdır. İntensiv terapiya şöbəsində isə patogen mikromisetlərə aid olan növlər, xüsusilə *Aspergillus* və *Fusarium* cinsləri, daha çox mövcud olmuşdur.

Əldə olunan məlumatlar əsasında, mikromisetlərin xəstəxana mühitindəki ekoloji göstəriciləri qiymətləndirilmişdir. Nümunələrdən əldə edilən növlərin çoxu saprotrof növlərindən ibarət olsa da, patogen potensiala malik mikromisetlər də mövcud idi. Xəstəxanada mövcud olan mikromisetlərin əksəriyyəti, sanitariya şərtlərinin aşağı olduğu yerlərdə daha çox yayılmışdır. Nəticələr, xəstəxana

mühitində mikromisetlərin patogen potensialını nəzərə alaraq müvafiq müalicə və sanitariya tədbirlərinin vacibliyini vurğulamışdır.

Statistik analizlərə görə, mikrobioloji müxtəliflik xəstəxanaların müxtəlif mühitlərində əhəmiyyətli dərəcədə fərqlənirdi ($p < 0.05$). Məsələn, cərrahiyyə otaqlarından toplanan nümunələrdə müxtəliflik indeksi daha yüksəkdir, bu da o mühitin daha çox mikromiset növünə ev sahibliyi etdiyini göstərir.

Bu nəticələr göstərir ki, xəstəxana mühitlərində mikromisetlərin taksonomik tərkibi və onların ekoloji əhəmiyyəti, sanitariya və müalicə şəraitinin yaxşılaşdırılmasına yönəlmiş əlavə tədqiqatları tələb edir. Bu tapıntılar, xəstəxanalarda infeksiyaların qarşısını almaq və sanitariya şərtlərini yaxşılaşdırmaq üçün vacib göstəricilər təqdim edir.

## Ədəbiyyat

1. Abdullayeva, Sh.A.(2024). Rhizosphere Bacteria. *Elmi Tədqiqat Beynəlxalq Elmi Jurnal*.s.80-83.
2. Abdullayeva, Sh. (2024). Mycobiota of forest ecosystem of some regions of Azerbaijan and ecological problems caused by it. *Danish Scientific Journal*, (84), pp. 9–11. ISSN 3375-2389.
3. Balaxanova, Q.V. (2020). Yaşayış binalarında məskunlaşan göbələklərin törətdiyi patologiyalar və onların sağlamlığa təsiri. *ADPU Xəbərləri. Riyaziyyat və Təbiət Elmləri seriyası*, №3, s. 125–129.
4. Balakhanova, G. V. (2025). Disruption of ecological functions of soils as a result of anthropogenic effects. *Foundations and Trends in Research*, 9, pp.87–91.
5. Balakhanova, G. V. (2025). The relationship between the physical-chemical properties of soils and fungi biota in different areas of Baku City. *Nature and Science*, 7(2), pp.30–34.
6. Balaxanova, Q.V. (2021). Antropogen mühitlərdə formalaşan mikobiotanın fəaliyyətinin ümumi xarakteristikası. *Azərbaycan Texnologiya Universiteti. Elmi Xəbərlər*, №1(34), s.115–119.
7. Balaxanova, Q.V. (2024). *Şəhər mühitində yayılmış mikromiset birliklərinin ekoloji xüsusiyyətlərinin tədqiqi*. Azərbaycan Dövlət Aqrar Universiteti və ARETN Mikrobiologiya İnstitutu.
8. Balakhanova, G. (2024). Ecological impact of micromycetes fungi in residential buildings. *Azerbaijan Scientific Center, International Scientific Journal of Scientific Work*. Volume: 18 Issue: 11, pp.134-137.
9. Balakhanova, G. V. (2022). Generalized characteristics of the recorded fungi in relation to the initial ph of the environment. *Deutsche internationale Zeitschrift für zeitgenössische Wissenschaft*. № 30, p.18.
10. Balakhanova, G. (2024). Ecological and tropical specialization of fungi recorded in baku city soils. *Nature and Science*, 6(1).
11. Muradov, P, (2021). Eco-trophic Relationships and Frequency of Occurrence of Mycobiota of Some Trees grown on the Roadside: The Case of Baku Highways. *European Online Journal of Natural and Social Sciences*. vol.10, №1, pp.34-42
12. Yusifova, A., Asadova, B., Aslanova, S. (2024). Plants, Human Health and Civilization. *Norwegian Journal of Development of the International Science*, 136, pp.6–10.
13. Yusifova, A., Asadova, B., Aslanova, S. (2024). Species composition and resources of cultivated and wild forage plants in Azerbaijan. *German International Journal of Modern Science*, 84, pp.11–14. https:doi.org, 10.5281.zenodo.12752493.

Daxil oldu: 07.02.2025
Qəbul edildi: 16.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/200-206

**Tural Məhərrəmov**
Milli Aviasiya Akademiyası
doktorant
https://orcid.org/0009-0008-3457-0884
tural.mhr@gmail.com

# Abşeron ərazisində neft dağılmalarının aerokosmik metodlarla tədqiqi

## Xülasə

Bu məqalə, Abşeron yarımadasında neftlə çirklənmiş ərazilərdə ekoloji vəziyyətin qiymətləndirilməsi və torpaqların çirklənmə səviyyəsinin təhlilinə yönəlmişdir. Tədqiqatda, neft dağılmalarını aşkarlamaq və bu ərazilərdəki dəyişiklikləri izləmək məqsədilə müxtəlif geosensör texnologiyalarından istifadə edilmişdir, o cümlədən Sentinel-1 radar peyk şəkilləri, SAR (synthetic aperture radar) və Landsat-8 peyk məlumatları. Bu geosensör texnologiyalarının tətbiqi ilə yer səthindəki dəyişikliklər, xüsusilə də neft çirklənməsinin yayıldığı ərazilər asanlıqla müəyyən edilmişdir. Peyk məlumatları, müxtəlif zaman aralıqlarında toplanmış görüntülərlə, torpaq səthindəki dəyişiklikləri izləyərək, neftlə çirklənmiş ərazilərin genişlənməsi və ya azalma potensialını göstərməkdə mühüm rol oynayır.

Əldə olunan peyk şəkilləri ArcGIS Pro proqram təminatında analiz edilərək, çirklənmiş sahələrin sərhədləri dəqiq müəyyənləşdirilmiş və vizual olaraq xəritə üzərində göstərilmişdir. Bu xəritələr, tədqiqatçılara ərazinin daha geniş perspektivdə qiymətləndirilməsi, çirklənmənin növü və intensivliyinin təhlilinə imkan tanımışdır. Bu məlumatların xəritələşdirilməsi həmçinin, torpaqlarda baş verən deqradasiya proseslərinin izlənməsi və gələcəkdə bu ərazilərdə həyata keçiriləcək təmizləmə və bərpa işlərinə dair müvafiq tədbirlərin görülməsi üçün əhəmiyyətli bir əsas yaratmışdır.

***Açar sözlər:*** *Abşeron yarımadası, neftlə çirklənmiş ərazilər, ekoloji vəziyyət, torpaq çirklənməsi, geosensör texnologiyaları, Sentinel-1, SAR, Landsat-8, peyk məlumatları, ArcGIS Pro*

**Tural Maharramov**
National Aviation Academy
PhD student
https://orcid.org/0009-0008-3457-0884
tural.mhr@gmail.com

# Investigation of Oil Spills in the Absheron Region by Aerospace Methods

## Abstract

This paper focuses on assessing the ecological condition of oil-contaminated areas and analysis of soil pollution levels in the Absheron Peninsula. The study utilizes geosensor technologies to detect oil spills and track changes in these regions, including Sentinel-1 radar satellite images, SAR (synthetic aperture radar), and Landsat-8 satellite data. By applying these geosensor technologies changes in the Earth's surface, especially the spread of oil contamination were effectively identified. Satellite data gathered over different time intervals, play a crucial role in monitoring land surface changes and in highlighting the expansion or reduction potential of oil-contaminated areas.

The acquired satellite images were analyzed in ArcGIS Pro software, allowing for the precise identification of the boundaries of contaminated zones, which were then mapped for visual representation. These maps have provided researchers with a broader perspective for evaluating the area, analyzing the type and intensity of contamination, and monitoring the degradation processes of the soil. The mapping of this data also serves as an essential foundation for planning future clean up and restoration efforts in these areas.

***Keywords:*** *Absheron Peninsula, oil-contaminated areas, ecological assessment, soil contamination, geosensor technologies, Sentinel-1, SAR, Landsat-8, satellite data, ArcGIS Pro*

## Giriş

Neft sənayesinin fəaliyyəti ətraf mühitə təsir edən əsas amillərdən biri kimi çıxış edir. Azərbaycanda ekoloji problemlərin yaranmasında bu sahənin xüsusi rolu vardır və yanacaq-enerji sektorunda onun payı 70-80%-ə qədər yüksəlir. Neft və qaz ehtiyatlarının hasilatı ətraf mühitə birbaşa təsir göstərməklə, xüsusilə mədən sahələrində və onların yaxın ərazilərində neft tullantıları ilə çirklənməyə səbəb olur. Abşeron yarımadası neft hasilatının əsas mərkəzi olduğu üçün, burada ekoloji çirklənmə daha geniş yayılmışdır (Mirzəyev, Şıxəliyev, 2012, s.3-4). Neft və qazın çıxarılması, saxlanması, emalı və nəqli kimi proseslər torpaq, hava və su hövzələrinə mənfi təsir göstərərək ciddi ekoloji problemlər yaradır. Ekoloji mühitin bərpası və qorunması məqsədilə ölkədə fəaliyyət göstərən neft şirkətləri beynəlxalq konvensiyalara qoşulmuş və onların tələblərinin struktur bölmələrində tətbiqini vacib amil kimi müəyyən etmişdir (Aliyev, 2018, s.1-3).

Təbii qaz və neft, qlobal miqyasda mühüm enerji resurslarıdır və onların daşınması əsasən, boru kəmərləri vasitəsilə həyata keçirilir. Bu kəmərlər yerin üstündə və ya altında quraşdırıla bilər, diametri isə 1 metrə qədər ola bilər. Boru kəmərlərinin zədələnməsi sızmalara yol açaraq, çoxsaylı təbii sərvətlərin itirilməsinə səbəb olur və bu da neft və qaz şirkətləri üçün böyük maliyyə itkisinə gətirib çıxarır. Həmçinin, bu cür sızmalar ətraf mühitin çirklənməsinə və geri dönüşü olmayan ekoloji təsirlərə yol aça bilər. Boru kəmərlərinin böyük uzunluqları və məsafələri, yerində izləməyi çətinləşdirir. Belə hallarda havadan və uzaqdan idarə olunan sistemlər boru kəmərlərinin monitorinqi üçün böyük imkanlar yaradır. Bir çox hərbi tətbiqi olmasına baxmayaraq, pilotsuz uçuş aparatlarının (PUA) mülki istifadəsi son zamanlar daha çox diqqət çəkib. Hal-hazırda fəaliyyət göstərən kiçik PUA-ların ən mühüm üstünlükləri onların yüksək çevikliyi və məkan ayırdetmə qabiliyyətidir (Mahdianpari, Salehi və b., 2018, s.3).

Neft dağılmalarını aşkar etmək məqsədilə bir sıra metodlardan istifadə olunur. Bu metodlar arasında Sentinel-1, Sentinel-1C-band peykləri, SAR (Synthetic Aperture Radar), Envisat, Landsat-8 və ERS kimi multispektral peyk sensorları da mövcuddur. Xüsusilə, səth sularındakı neft dağılmalarını müəyyən etmək üçün Sentinel-1 tədqiqatçılar tərəfindən ən effektiv üsul olaraq qiymətləndirilir. Mikrodalğalı və passiv optik sensorlardan alınan məlumatlar isə ətraf mühitin vəziyyətindən təsirlənə bilər. Passiv optik sensorlar yalnız günəş işığı altında və ya bulud və ya dumanın maneə törətmədiyi zamanlarda neftin yayılmasını aşkar edə bilir. Lakin SAR texnologiyası, həm gündüz, həm də gecə vaxtı işləyərək, buludlardan asılı olmayaraq neft ləkələrini aşkar etməkdə üstünlük təşkil edir (Bayramov, Kada, Buchroithner, 2018, s.35).

### Tədqiqat

Abşeron ərazisində hava keyfiyyətinin müxtəlif aerozollarla çirklənməsi, Xəzər dənizinin su səviyyəsinin dəyişməsi, relyefdəki sürüşmələr və qırılmalar kimi amillər ekoloji vəziyyəti daha da mürəkkəbləşdirərək, yerli əhalinin həyatını çətinləşdirir. Bu faktorlardan hər biri bölgənin təbii mühitinə əhəmiyyətli təsir göstərir və ekosistemin tarazlığını pozur, bunun nəticəsində ətraf mühitin dayanıqlılığı daha da zəifləyir.

Abşeronun quruda yerləşən neft və qaz yataqlarında neftin və qazın yığılması, emalı və daşınması proseslərində müxtəlif tullantılar, o cümlədən lay suları, alçaq təzyiqli səmt qazları, qum dənəcikləri, parafinlər və neft şlamları meydana gəlir. Bu tullantılar, artıq mövcud olan ekoloji problemləri daha da dərinləşdirərək, ərazinin ekoloji vəziyyətini sürətlə pisləşdirir. Lay sularının lazımi qaydada idarə olunmaması nəticəsində, neftlə çirklənmiş geniş ərazilər yaranır və çirklənmə yalnız yataq sahəsində deyil, həm də ətrafdakı digər ərazilərdə genişlənir. Bu hallar, bölgənin ekoloji vəziyyətini daha da ağırlaşdırır, ətraf mühitin pozulmasına yol açır və əhalinin sağlamlığına ciddi təsir göstərir.

Bu amillər Abşeronun ekoloji-coğrafi vəziyyətinə ciddi təsir göstərir, bölgədəki təbii mühitin qeyri-sabitliyini artıraraq, həm təbiətə, həm də insan həyatına uzunmüddətli zərərlər vurur. Ekosistemlərin zədələnməsi ilə bağlı baş verən dəyişikliklər, yerli əhalinin həyat keyfiyyətinə və bölgənin gələcək inkişafına mənfi təsir edir.




**Xəritə 1.** Abşeron yarımadasında neftlə çirklənmiş ərazilərin qiymətləndirilməsi xəritəsi (müəllif tərəfindən tərtib olunub)

Bu xəritə, bölgənin ətraf mühitindəki çirklənmə səviyyələrini izləmək və çirklənmiş sahələrin müəyyənləşdirilməsi üçün mühüm alət təqdim edir. Belə xəritələr, ərazilərin bərpası üçün prioritetlərin təyin edilməsi və ekoloji təhlil proseslərinin inkişaf etdirilməsi baxımından vacibdir.

Böyükşor gölü və onun ətraf əraziləri uzun illər boyunca neft sənayesinin təsiri altında qalmış və ciddi ekoloji çirklənməyə məruz qalmışdır. Bu regionda neft hasilatı və emalı prosesləri nəticəsində torpaq, su hövzələri və atmosfer çirklənmiş, ekosistemlərin dayanıqlılığı pozulmuşdur. Xüsusilə neft sızmaları və dağılmaları ətraf mühit üçün əsas problemlərdən biridir.

Müasir dövrdə ekoloji çirklənməni qiymətləndirmək və onun dinamikasını izləmək üçün aerokosmik metodlar geniş tətbiq edilir. Peyk təsvirləri, hava çəkilişləri və digər uzaqdan zondlama texnologiyaları neft dağılmalarının yayılma arealını, çirklənmə dərəcəsini və zamanla dəyişməsini müəyyən etməyə imkan yaradır. Bu metodlar vasitəsilə Böyükşor ərazisində neft çirklənməsinin mənbələri və təsir sahələri müəyyən edilə bilər.

Aerokosmik tədqiqatlar zamanı multispektral və hiperspektral peyk təsvirləri neftin su səthində və torpaq qatlarında yaratdığı spektral dəyişiklikləri analiz etməyə kömək edir. Termal infraqırmızı və mikrodalğa sensorları vasitəsilə isə çirklənmə sahələrinin gecə-gündüz müşahidəsi mümkün olur. Bundan əlavə, dron texnologiyalarından istifadə etməklə yüksək dəqiqlikli yerüstü təsvirlər əldə edilir və çirklənmənin lokallaşmış sahələrdə yayılma xüsusiyyətləri müəyyən edilir (Hashımov, 2023).

Böyükşor ərazisində aparılan aerokosmik monitorinq nəticələri ekoloji reabilitasiya tədbirlərinin planlaşdırılmasına və effektiv idarə olunmasına mühüm töhfə verə bilər. Belə metodların tətbiqi neft sənayesinin ekoloji təsirlərinin azaldılması və ətraf mühitin dayanıqlı idarə olunması üçün vacibdir (Babaeva, İsmailov, Orudzheva, 2020, s.192).

Müasir dövrün tələblərinə uyğun olaraq, torpaqların neft və neft məhsulları ilə çirklənmə səviyyəsini müəyyən etmək məqsədilə yer səthindən əldə olunan minerallar və göstərici bitkilərdən istifadə edilərək müxtəlif metodlar hazırlanır. Tədqiqatlar sübut edir ki, faydalı minerallarla zəngin olan lay suları və neft tərkibli tullantılar torpaqlarda fərqli çirklənmə səviyyələrinə səbəb olur (Gurbanov, Huseynova, 2020, s.85).




Neftin quruda yayılmasını tədqiq etmək üçün seçilən ərazi 49°55'53.26''E və 40°23'29.65''N koordinatlarında yerləşir. Bu ərazi neft hasilatının həyata keçirildiyi və Xəzər dənizinə yaxın olan bir bölgədir.

Xəritə 2. Tədqiqat ərazisinin peyk görüntüləri. (Xəritə müəllif tərəfindən ArcGIS Pro 3.3 proqram təminatında hazırlanmışdır).

Coğrafi sahələrin xəritələşdirilməsi məqsədilə sürətli və doğru məlumat əldə etmək üçün tətbiq edilən ən effektiv yanaşmalardan biri məsafədən zondlama (MZ) və Coğrafi İnformasiya Sistemlərindən (CİS) istifadədir (AbdAl-Qadir, Al-Ali, Soltan, 2023, s.30). CİS, qlobal yerləşdirmə sistemləri (GPS) vasitəsilə yerüstü məlumatları geokodlaşdırır və uzaqdan algılama məlumatlarını rəqəmsal formata çevirməyə imkan verir. Bu texnologiya müxtəlif səviyyələrdə məlumatların məkan xüsusiyyətlərini təhlil etməyə kömək edir. CİS, həmçinin çoxsaylı sahələrdə tətbiq olunur – məsələn, elmi tədqiqatlar, ekosistem qiymətləndirmələri, aktivlər və resurslar üzərində idarəetmə, şəhər planlaması, kartoqrafiya, hüquq-mühafizə, marketinq və s. Məsafədən zondlama ilə CİS-in birləşdirilməsi keçmiş və mövcud məlumatları birləşdirərək gələcəkdə baş verə biləcək vəziyyətləri proqnozlaşdırmağa imkan verir. Bu metodlar ətraf mühitin qiymətləndirilməsində mühüm rol oynayır (Hashimov, Aliyeva, Rustamova, Rustamov, 2014, s.99). CİS-in inkişafında mühüm mərhələ, məsafədən zondlama məlumatları əsasında məlumat toplama prosesinin tətbiqi olmuşdur. Neftlə çirklənmiş torpaqlara dair araşdırmalarda, məsafədən zondlama məlumatlarının düzgünlüyü və etibarlılığı, CİS texnologiyalarının effektivliyini təyin edir (Kurnaz, Aliyeva, Rustamov, 2014, s.7).

Əldə olunan məlumatların təhlili nəticəsində, çirklənmiş ərazilərin müəyyən edilməsi və təmizlənməsi üçün daha geniş və təsirli yanaşmalar təklif edilə bilər. Məlumatların rəqəmsal formada toplanması və analiz edilməsi, müxtəlif ərazilər arasındakı çirklənmə dərəcələrini müqayisə etməyə və təbii mühitin bərpası üçün hansı tədbirlərin görülməsinin daha məqsədəuyğun olduğunu müəyyən etməyə imkan yaradır. Həmçinin, ArcGIS Pro proqram təminatı vasitəsilə hazırlanan çirklənmiş sahələrin xəritələri, yerli idarəetmə orqanlarına və ekoloji mütəxəssislərə bölgənin ekoloji vəziyyətini izləmək və təmizləmə işlərini daha düzgün həyata keçirmək üçün mühüm bir alət təmin edir.

Sahə işlərindən sonra Google Earth və peyk təsvirləri, məsələn, Sentinel-2 peykindən əldə edilən məlumatlarla ərazinin tədqiqi aparılmışdır. Bu təsvirlər 2014 və 2024-cü illər üzrə alınmış və ArcGIS Pro proqramına daxil edilərək, neftlə çirklənmiş sahələr müəyyənləşdirilmiş və vektor qatı hazırlanmışdır.

**Şəkil 1**. Google Earth Pro proqramında neft ləkələrinin konturlarının müəyyənləşdirilməsi və vektor qatlarının yaradılması prosesini göstərən təsvir.



a) 2014-cü il (35 $m^2$) b) 2024-cü il (151 $m^2$)

Neft dağılmalarının təhlil edildiyi ərazi ArcGIS Pro proqramında, alətlərin köməyi ilə analiz edilərək təsnif edilmişdir. Təsnifat alətləri, raster məlumat dəstinin piksel və obyektlərini təsnif etmək üçün idarə olunan və idarə olunmayan üsullardan seçim etməyə imkan verir. Nəzarət olunan təsnifat metodunu istifadə etmək üçün təlim nümunəsi faylı təqdim olunmalıdır. Təsnifat alətlərinin siyahısında isə təlim nümunələri yaratmaq və ya mövcud faylı daxil etmək üçün təlim nümunəsi meneceri mövcuddur. Müxtəlif təsnifat metodları mövcuddur və bu tədqiqatda Support Vector Machine (SVM) metodundan istifadə edilmişdir (Classify, n.d.).

Maşın öyrənmə (ML), məlumatların avtomatik olaraq təhlil edilməsi, qruplaşdırılması və proqnozlaşdırılması üçün istifadə olunan müxtəlif alqoritm və metodları əhatə edir. Bu texnologiyalar müxtəlif sahələrdə tətbiq edilərək, xüsusilə məkan məsələlərinin həllində faydalıdır. Məsələn, şəkillərin növlərə ayrılması, yerin təhlili və çoxölçülü məlumatların proqnozlaşdırılması sahələrində geniş istifadə edilir. ArcGIS-də ənənəvi maşın öyrənmə üsullarına əlavə olaraq məkanla əlaqəli spesifik metodlar da mövcuddur. Bu metodlar coğrafi məlumatların təhlilində daha dərindən və daha düzgün nəticələr əldə etməyə kömək edir. Klasterləşdirmə, oxşar xüsusiyyətləri olan və ya eyni yerdə yerləşən məlumatları qruplaşdırma prosesidir. ArcGIS proqramı bu cür qrupları müəyyən etmək üçün geniş alqoritm seçimi təklif edir və bu, müxtəlif xüsusiyyətlərə və ya coğrafi mövqeyə əsaslanır (Machine Learning in ArcGIS, 2017).

Support Vector Machine (SVM) metodu, seqmentli raster məlumatlarını və ya standart görüntüləri təsnif etmək üçün çox güclü, nəzarətli bir alqoritmdir. Bu metod, verilən məlumatları təsnif etmək üçün optimal xətt və ya hyperplan tapmağa çalışır. Məqsəd, fərqli kateqoriyaları bir-birindən ayıran ən geniş məkanı tapmaqdır. SVM, xüsusilə yüksək ölçülü verilənlər və mürəkkəb təsnifat məsələləri üçün əlverişlidir. Bu metod həm də müxtəlif növ məlumatlarla yaxşı işləyir, məsələn, görüntü emalı və digər məkan məlumatları ilə. SVM'nin əsas üstünlüyü onun yüksək dəqiqliklə işləməsi və mürəkkəb verilənləri düzgün şəkildə təsnif etməsidir.

Support Vector Machine (SVM) metodunun tətbiqi, həmçinin böyük verilənlər bazalarında və mürəkkəb strukturda olan məlumatlarda təsnifatın yüksək dəqiqliklə aparılmasını təmin edir. Bu metod, məlumatları təsnif edərkən onların həndəsi strukturlarına əsaslanır və onları optimal qərar sərhədləri ilə ayırır. Məsələn, SVM, müxtəlif növ vizual məlumatları, o cümlədən peyk şəkilləri və digər coğrafi məlumatları təsnif edərkən əhəmiyyətli üstünlüklərə malikdir. O, müxtəlif siniflər arasında ən düzgün ayırma sərhədini tapmaqla yanaşı, dəqiqlik, dayanıqlılıq və sürət baxımından da effektivdir. SVM, xüsusilə geniş məlumatlar üzərində işləyərkən çox güclü performans göstərir və geniş tətbiq sahələrində istifadə olunur.

**Xəritə 3.** Təsvirin klassifikasiya edilməsi ( xəritə müəllif tərəfindən tərtib olunub)




Tədqiqatda neftlə çirklənmiş ərazidə bitki örtüyünün və torpağın vəziyyətini təhlil etmək məqsədilə iki müxtəlif vegetasiya indeksi tətbiq edilmişdir. Bunlardan biri NDVI (Normallaşdırılmış Fərq Bitki Örtüyü İndeksi) olub, bitki örtüyünün sıxlığını və sağlamlığını qiymətləndirmək üçün istifadə edilir. NDVI, bitkilərin yaşıl rəngini nəzərə alaraq onların fotosintez fəaliyyəti barədə məlumat verir və beləliklə çirklənmiş sahələrdə bitki örtüyünün dəyişikliklərini izləməyə kömək edir.

Digər indeks isə SAVI (Torpağa Uyğunlaşdırılmış Bitki Örtüyü İndeksi)dir. Bu indeks, torpağın xüsusiyyətlərini nəzərə alaraq bitki örtüyünün vəziyyətini daha dəqiq ölçməyə imkan verir. SAVI, torpağın quru və nəmli şəraitə görə dəyişən xüsusiyyətlərini hesaba alaraq, bitki örtüyünün sağlamlıq vəziyyətini daha etibarlı şəkildə təhlil edir. Bu indekslər, xüsusilə çirklənmə nəticəsində torpaq və bitki örtüyündəki dəyişiklikləri ölçmək üçün faydalıdır və neftlə çirklənmiş ərazilərdə ekoloji vəziyyətin qiymətləndirilməsində vacib rol oynayır.

NDVI və SAVI indekslərinin birgə istifadəsi, tədqiqatçıların torpağın və bitki örtüyünün deqradasiyasını və ekosistemdəki digər dəyişiklikləri daha dəqiq şəkildə analiz etmələrinə imkan verir.

## Nəticə

Əldə edilən nəticələr, neft dağılmalarının təhlili və qiymətləndirilməsi üçün müasir texnologiyaların effektiv istifadəsini göstərir. ArcGIS Pro və Google Earth Pro kimi alətlər vasitəsilə toplanan məlumatlar, həmçinin məsafədən zondlama texnologiyalarının tətbiqi ətraf mühitin monitorinqi və bərpası üçün mühüm rol oynayır. Bu yanaşmalar, ətraf mühitin vəziyyətini dəqiq qiymətləndirməyə və çirklənmiş sahələrin sürətli və effektiv şəkildə müəyyənləşdirilməsinə imkan verir.

Neft dağılmalarının təyin edilməsi üçün istifadə olunan təhlil metodları, xüsusilə SVM (Support Vector Machine) təsnifat metodları ilə bu məlumatların daha dəqiq və etibarlı şəkildə işlənməsi mümkündür. Bu prosesin düzgün idarə edilməsi, həmçinin ətraf mühitin qorunması və çirklənmiş sahələrin təmizlənməsi məqsədilə həyata keçirilən tədbirlərin düzgün istiqamətlənməsini təmin edir. Beləliklə, bu tədqiqat ətraf mühitin vəziyyətinin yaxşılaşdırılması və təbii sərvətlərin daha səmərəli istifadəsi üçün töhfə verir.

## Ədəbiyyat

1. Aliyev, R.Z. (2018). On the ecologıcal status of the Absheron Penınsula. *Gynecol Women's Health*, 12(4), pp.1-3.
2. AbdAl-Qadir, S.S., Al-Ali, A.K., Soltan, B.H. (2023). Monitoring Soil Contamination by Hydrocarbons and Heavy Metals in Parts of Basra Southern Iraq Using Remote Sensing and GIS Techniques. *İraqi Geological Journal,* 56(1D), pp.29-42.

3. Bayramov, E., Kada, M., Buchroithner, M. (2018). Monitoring oil spill hotspots, contamination probability modelling andassessment of coastal impacts in the Caspian Sea using Sentınel-1, landsat-8, radarsat, envısat and ERS satellite sensors. *Journal of Operatıonal Oceanography*, VOL.11, NO. 1, pp.27-43. https://doi.org/10.1080/1755876X.2018.1438343
4. Babaeva, M.P., Ismailov, N.M., Nadzhafova, S.I., Keiserukhskaya, F.SH., Orudzhevaa, N.I. (2020). K voprosu o razrabotke pdk nefti i nefteproduktov v razlichnykh tipakh pochv na osnove ikh assimilyatsionnogo potentsiala (na primere pochv Azerbaidzhana). *Pochvovedenie*, № 11, s.1393–1400 DOI:10.31857/S0032180X20110040.
5. *Classify*.(n.d.). https://pro.arcgis.com/en/pro-app/latest/help/analysis/image-analyst/classify.htm
6. Gurbanov, E.M., Huseynova, H.Z. (2020). Methods for Determining Soil Contamination by Oil and Petroleum Products and Indicator Plants in the North of Caspian Sea. *International Journal of Agriculture and Biological Scienceas* ISSN (2522-6584), pp.84-89.
7. Hashımov, S., Zawadzkı, J. *Observations of the oil-polluted soil of Absheron Peninsula using Landsat 8 OLI and Sentinel 2A imagery*, https://dx.doi.org/10.46544/ams.v27i3.04, https://repo.pw.edu.pl/info/article/WUT4139a9fc82004563b9f873605dad62da/
8. Hashimov, A.M., Aliyeva, B.N., Rustamova, S.R., Rustamov, R.B. (2014). Geotechnıcal and space data fıttıngs ın envıronmental studıes. *International Journal on "Technical and Physical Problems of Engineering"*. Issue 21, Volume 6, Number 4, pp.98-101.
9. Kurnaz, S., Aliyeva, B.N., Rustamov, R.B. (2014). Advances of Space Technology in Geotechnical Studies By Global. *Journal of Researches in Engineering*: *J General Engineering*, Volume 14, p.7.
10. Mirzəyev, A.B, Şıxəliyev, F.B. (2012). *Abşeron yarımadası və Xəzər dənizinin Azərbaycan sektorunda yerləşən neft mədən ərazilərinin ekoloji problemləri və onların aradan qaldırılması yolları.* ISBN: 978-9952-453-35-5.
11. Mahdianpari, M., Salehi, B., Mohammadimanesh, F., Larsen, G., Peddle, D.R. (2018). Mapping land-based oil spills using high spatial resolution unmanned aerial vehicle imagery and electromagnetic induction survey data. *Appl Remote Sens.* 12(3), 036015, doi: 10.1117/1.JRS.12.036015.
12. *Machine Learning in ArcGIS.* (2017). https://www.esri.com/arcgis-blog/products/analytics/analytics/machine-learning-in-arcgis/

Daxil oldu: 10.02.2025
Qəbul edildi: 17.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/207-210

**Aytac Hafizova**
Xəzər Universiteti
magistrant
https://orcid.org/0009-0009-4893-501X
aytac.hafizova2023@khazar.org

# İdman, qidalanma və yuxunun psixi sağlamlığa təsiri

**Xülasə**

Müasir dövrdə psixi sağlamlıq cəmiyyətin ümumi rifahının mühüm göstəricilərindən biri kimi ön plana çıxır. Psixi sağlamlığın qorunması və yaxşılaşdırılmasında isə həyat tərzi faktorları – xüsusilə idman, qidalanma və yuxu rejimi mühüm rol oynayır. Tədqiqatlar göstərir ki, müntəzəm fiziki aktivlik yalnız bədən sağlamlığı üçün deyil, həm də stressin azaldılması, depressiya və narahatlığın qarşısının alınması baxımından təsirlidir. İdman neyrotransmitterlərin – xüsusilə serotonin və endorfinin – səviyyəsini artırmaqla psixi sabitlik və emosional balans yaradır. Eyni zamanda, balanslaşdırılmış və qida maddələri ilə zəngin qidalanma beyinin funksional fəaliyyəti və emosional vəziyyətə birbaşa təsir göstərir. Omega-3 yağ turşuları, vitamin B kompleksi və maqnezium kimi maddələr beyin funksiyalarını dəstəkləməklə yanaşı, əhval-ruhiyyəni yaxşılaşdırır. Psixi sağlamlıq üçün üçüncü əsas amil olan yuxu, sinir sisteminin bərpasında, yaddaşın möhkəmləndirilməsində və emosional tənzimləmədə vacib rol oynayır. Yuxu pozuntuları tez-tez stress, depressiya və diqqət pozuntuları ilə müşayiət olunur.

***Açar sözlər:*** *psixi sağlamlıq, fiziki aktivlik, balanslı qidalanma, yuxu rejimi, emosional sabitlik*

**Aytaj Hafizova**
Khazar University
Master student
https://orcid.org/0009-0009-4893-501X
aytac.hafizova2023@khazar.org

# The Impact of Exercise, Nutrition, and Sleep on Mental Health

**Abstract**

In modern times, mental health has come to the fore as one of the important indicators of the general well-being of society. Lifestyle factors – especially exercise, nutrition, and sleep patterns – play an important role in maintaining and improving mental health. Studies show that regular physical activity is effective not only for physical health, but also in reducing stress, preventing depression, and anxiety. Exercise creates mental stability and emotional balance by increasing the levels of neurotransmitters – especially serotonin and endorphins. At the same time, a balanced and nutrient-rich diet directly affects the functional activity of the brain and emotional state. Substances such as omega-3 fatty acids, vitamin B complex, and magnesium not only support brain functions, but also improve mood. Sleep, the third key factor for mental health, plays an important role in restoring the nervous system, strengthening memory, and emotional regulation. Sleep disorders are often accompanied by stress, depression, and attention disorders.

***Keywords:*** *mental health, physical activity, balanced nutrition, sleep regime, emotional stability*

## Giriş

Son illərdə psixi sağlamlıq mövzusu cəmiyyətlərdə daha çox diqqət mərkəzinə çevrilmişdir. Psixoloji pozuntuların artması, stressə davamlılığın azalması və həyat keyfiyyətindəki enişlər insanların gündəlik vərdişləri ilə birbaşa əlaqələndirilir. Alimlər və mütəxəssislər sübut etmişlər ki,

psixi rifah yalnız psixoterapiya və dərman vasitələri ilə deyil, həm də gündəlik həyat tərzinin düzgün qurulması ilə yaxından bağlıdır (Choi, Chen, Stein, Klimentidis, Wang, Koenen, Smoller, 2019, s.399). Bu baxımdan fiziki fəaliyyət, qidalanma vərdişləri və yuxu keyfiyyəti psixi funksiyaların tənzimlənməsində və qorunmasında əsaslı rol oynayır. Hər bir faktor beynin fəaliyyətini, emosional vəziyyəti və stressə qarşı dözümlülüyü müxtəlif mexanizmlərlə dəstəkləyir (Gujar, Yoo, Hu, Walker, 2011, s.450; Drozdov, Kravtsov, 2015). Fiziki aktivlik, qidalanma və yuxu kimi gündəlik həyatın təməl elementləri psixi sağlamlığın formalaşması və qorunmasında əhəmiyyətli rol oynayır. Müntəzəm şəkildə yerinə yetirilən fiziki fəaliyyət beyində endorfin və serotonin kimi xoşbəxtlik hormonlarının ifrazını artırmaqla emosional vəziyyətin sabitləşməsinə, stressin azalmasına və depressiya hallarının qarşısının alınmasına şərait yaradır. Eyni zamanda fiziki aktivlik diqqət və yaddaş kimi koqnitiv funksiyaların inkişafını dəstəkləyir, sosiallaşmanı təşviq edərək psixoloji tənhalığı azaldır (Walker, 2008, s.168). Qidalanma da psixi sağlamlıq üçün mühüm göstəricidir. Balanslı və mikroelementlərlə zəngin qidalar beyində sinir impulslarının ötürülməsini tənzimləyir və əhval-ruhiyyənin stabilliyinə töhfə verir. Xüsusilə Omega-3 yağ turşuları, maqnezium və B qrupu vitaminləri beyin funksiyalarının qorunmasında və psixoloji gərginliklərin azalmasında önəmlidir. Emal olunmuş, şəkərli və süni əlavələrlə zəngin məhsullar isə əksinə, sinir sisteminə mənfi təsir göstərərək narahatlıq və diqqət pozuntularına səbəb ola bilər. Qidalanma ilə bağırsaq mikrobiozası arasında yaranan əlaqə, bağırsaq-beyin oxu vasitəsilə insanın emosional vəziyyətinə birbaşa təsir edir.

**Tədqiqat**

Sağlam həyat tərzinin psixoloji rifahdakı rolu. Müasir cəmiyyətin sürətli inkişafı, texnoloji yeniliklər və informasiya bolluğu ilə yanaşı, insanların gündəlik həyatda üzləşdiyi psixoloji gərginlikləri də artırmışdır. Artan iş tempi, sosial təzyiqlər və informasiya axını fonunda insanların daxili balansını qoruması getdikcə daha çətinləşir (Naismith, Mowszowski, 2018, s.153). Belə bir şəraitdə psixoloji rifahın qorunması üçün yanaşmalar daha çox həyat tərzi ilə əlaqələndirilir. Sağlam həyat tərzi – yəni fiziki aktivliyin, düzgün qidalanmanın və nizamlı yuxunun birləşdiyi gündəlik davranış modeli – insanın emosional və zehni vəziyyətinə dərin təsir göstərir (Chang, Aeschbach, Duffy, Czeisler, 2015, s.500). Bu elementlər sadəcə bədən sağlamlığını deyil, eyni zamanda duyğuların idarəsi, stresə dözümlülük və ümumi psixoloji dayanıqlığın əsasını təşkil edir. Sağlam vərdişlərin olmaması isə psixoloji pozuntulara, enerjisizlik və zehni yorğunluğa səbəb ola bilər.

**Cədvəl 1.** Sağlam həyat tərzi komponentlərinin psixi rifaha təsiri üzrə statistik göstəricilər

| Tədqiqat / Mənbə | Əhali qrupu (n) | Fiziki aktivliyin təsiri | Qidalanmanın təsiri | Yuxunun təsiri | Psixi simptomlarda azalma (%) |
|---|---|---|---|---|---|
| WHO (2022) Qlobal Sağlamlıq Araşdırması | 150,000 | Həftədə ≥150 dəq aktivlik | Balanslı pəhriz tövsiyə olunur | ≥7 saat yuxu | 25–30% |
| Harvard Med. School (2020) | 12,000 | Aerobik idmanla məşğul olanlar | Omega-3, B12 qəbul edənlər | Nizamlı yuxu rejimi | 35% |
| APA (2021) ABŞ Psixoloji Assosiasiyası | 5,600 | Stress səviyyəsi azalır | Emosional stabillik artır | Yuxusuzluqla risk yüksəlir | 40% |
| European Psychiatry Journal (2019) | 8,300 | Depressiya riskini azaldır | Mikronutrientlər mühüm rol oynayır | REM yuxusu önəmlidir | 28% |

**Mənbə:** World Health Organization. (2022). Global status report on physical activity 2022. https://www.who.int/teams/health-promotion/physical-activity/global-status-report-on-physical-activity-2022

Bu cədvəldə müxtəlif beynəlxalq mənbələrə əsasən fiziki aktivlik, balanslı qidalanma və nizamlı yuxunun psixi sağlamlığa təsiri müqayisəli şəkildə təqdim olunur. Araşdırmalar göstərir ki, həftəlik müntəzəm fiziki aktivlik (məsələn, 150 dəqiqə və ya daha çox), mikroelementlərlə zəngin balanslı qidalanma (xüsusilə Omega-3 yağ turşuları, B qrupu vitaminləri və maqnezium) və gündəlik orta hesabla 7-8 saat keyfiyyətli yuxu insanlarda stress, depressiya və narahatlıq kimi psixi simptomların azalmasına əhəmiyyətli dərəcədə təsir göstərir (Ağayeva, Əliyev, Əlibəyova, 2015; Alipov, 2016). Harvard, APA və ÜST kimi nüfuzlu təşkilatların araşdırmalarında bu amillərin birgə tətbiqi nəticəsində psixi simptomların ümumilikdə 25-40% arası azaldığı qeyd olunmuşdur. Eyni zamanda cədvəl göstərir ki, yuxu pozuntuları və qidalanma çatışmazlığı olan fərdlərdə psixi pozuntuların riski nəzərəçarpacaq dərəcədə artır. Nəticə etibarilə, sağlam həyat tərzinin hər üç komponenti bir-birini tamamlayaraq psixoloji rifahın yüksəldilməsində əsaslı rol oynayır.

Sağlam həyat tərzi insanın yalnız fiziki deyil, eyni zamanda psixoloji funksionallığını və emosional dayanıqlığını da formalaşdıran kompleks bir anlayışdır. Müasir dövrdə psixi sağlamlığa təsir edən faktorlar təkcə genetik meyillər və sosial mühitlə məhdudlaşmır. Artıq elmi ədəbiyyatda həyat tərzi ilə bağlı davranışların – o cümlədən hərəkətsizlik, qeyri-sağlam qidalanma və yuxu rejiminin pozulması – psixoloji pozuntularla birbaşa əlaqəli olduğu geniş şəkildə sübut olunmuşdur. Gündəlik fiziki fəaliyyət beyindəki sinir əlaqələrinin elastikliyini qorumaqla bərabər, insanın adaptiv funksiyalarını gücləndirir. Bu da stressə qarşı müqavimətin artmasına, qərarvermə qabiliyyətinin yaxşılaşmasına və emosional balansın saxlanmasına səbəb olur (Minkel, Htaik, Banks, Dinges, 2011, s.14). Araşdırmalar göstərir ki, fiziki hərəkətsizlik həyatın digər sahələrində də passiv davranış modellərinə yol açaraq, özünüqiymətləndirmənin zəifləməsi və sosial geriçəkilmə ilə nəticələnə bilər. Qidalanma isə, beyindəki kimyəvi tarazlığı qoruyan mühüm tənzimləyici kimi çıxış edir. Vitamin və mineral çatışmazlıqları, xüsusilə də maqnezium, sink və B vitamini kimi maddələrin defisiti, neyrotransmitterlərin sintezini ləngidərək, depressiv və apatik davranışlara yol aça bilər. Bunun əksinə olaraq, balanslı və təbii qidalanma psixoloji dayanıqlığı gücləndirir, diqqət və enerji səviyyəsini artırır.

Yuxu sağlamlığının psixoloji rifahla əlaqəsi isə həm nevroloji, həm də emosional aspektlərdə özünü göstərir. Gecə yuxusu zamanı beyin gün ərzində toplanmış məlumatları təhlil edir, emosional yaddaşı emal edir və sinir sistemini balanslaşdırır. Yuxunun pozulması – xüsusilə xroniki yuxusuzluq – beyində qərarvermə, emosional reaksiya və sosial əlaqə bacarıqlarını zəiflədir (Naismith, Duffy, Cross, Grunstein, Terpening, Hoyos, D'Rozario, Lagopoulos, Osorio, Shine, McKinnon, 2020, s.571). Bu da birbaşa şəkildə gündəlik fəaliyyətə və insanın sosial münasibətlərinə mənfi təsir göstərir. Təcrübələr və statistik araşdırmalar bir daha təsdiqləyir ki, sağlam həyat tərzini təşkil edən bu üç əsas komponent – fiziki aktivlik, qidalanma və yuxu – bir-birindən ayrılmazdır və onların qarşılıqlı balansı psixi rifahın qorunması üçün həlledici əhəmiyyətə malikdir. Bu amillərin diqqətdən kənarda qalması yalnız fiziki sağlamlıq deyil, eyni zamanda emosional və zehni sabitliyi də təhlükə altına ata bilər.

## Nəticə

Nəticə etibarilə, sağlam həyat tərzi yalnız profilaktik sağlamlıq tədbiri kimi deyil, həm də psixi rifahın formalaşması və qorunmasında əsas dayaq nöqtəsi kimi çıxış edir. Psixoloji gərginliklərə qarşı davamlılığın artırılması, gündəlik stressin effektiv idarə olunması və emosional balansın saxlanması üçün fiziki aktivlik, qida keyfiyyəti və yuxu rejimi birgə və əlaqəli şəkildə fəaliyyət göstərir. Bu amillər arasında yaranan sinerji fərdin ümumi həyat keyfiyyətini yüksəldərək, daha məhsuldar, diqqətli və emosional cəhətdən sabit bir həyat tərzinə zəmin yaradır. Tədqiqatların nəticələri göstərir ki, tibbi və psixoloji müdaxilələrlə yanaşı həyat tərzi dəyişikliklərinin tətbiqi psixi pozuntuların qarşısının alınması və ya simptomlarının yüngülləşdirilməsində təsirli ola bilər. Məhz bu səbəbdən psixi sağlamlığın dəstəklənməsi təkcə psixoloji yardımla məhdudlaşmamalı, fərdin gündəlik davranış modeli və həyat vərdişləri də kompleks şəkildə nəzərə alınmalıdır. Bu yanaşma, cəmiyyət səviyyəsində psixi rifahı artırmaq və fərdi psixoloji resursları gücləndirmək üçün uzunmüddətli və davamlı bir strategiya təqdim edir.

## Ədəbiyyat

1. Ağayeva, S.E., Əliyev, S.A., Əlibəyova, S.S. (2015). Qanın biokimyəvi göstəriciləri idmançı orqanizminin adaptiv proseslərinin meyarıdır. *AMEA-nın A.İ.Qarayev adına Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyatı*, 33, s. 23-28.
2. Alipov, N.N. (2016). *Osnovy meditsinskoi fiziologii*. Praktika, 3.
3. Choi, K. W., Chen, C.-Y., Stein, M. B., Klimentidis, Y. C., Wang, M.-J., Koenen, K. C., & Smoller, J. W. (2019). Assessment of bidirectional relationships between physical activity and depression among adults: A 2-sample Mendelian randomization study. *JAMA Psychiatry,* 76(4), 399–408. https://doi.org/10.1001/jamapsychiatry.2018.4175
4. Chang, A.-M., Aeschbach, D., Duffy, J. F., & Czeisler, C. A. (2015). Evening use of light-emitting eReaders negatively affects sleep, circadian timing, and next-morning alertness. *Proceedings of the National Academy of Sciences*, 112(4), 1232–1237. https://doi.org/10.1073/pnas.1418490112
5. Drozdov, D.N., Kravtsov, A.V. (2015). Vliyanie fizicheskoi nagruzki na pokazateli perifericheskoi krovi cheloveka. *Vestnik MGPU im. I.P.Shamyakina*, 4, s. 23-28.
6. Gujar, N., Yoo, S.S., Hu, P., Walker, M.P. (2011). Sleep deprivation amplifies reactivity of brain reward networks, biasing the appraisal of positive emotional experiences. *Journal of Neuroscience,* 31(12), 4466–4474. https://doi.org/10.1523/JNEUROSCI.3220-10.2011
7. Minkel, J.D., Htaik, O., Banks, S., Dinges, D.F. (2011). Emotional expressiveness in sleep-deprived healthy adults. *Behavioral Sleep Medicine*, 9(1), 5-14. https://doi.org/10.1080/15402002.2011.533987
8. Morman, D., Kheller, L. (2000). *Fiziologiya serdechno-sosudistoi sistemy*. Piter.
9. Naismith, S.L., Duffy, S.L., Cross, N., Grunstein, R., Terpening, Z., Hoyos, C., D'Rozario, A., Lagopoulos, J., Osorio, R.S., Shine, J.M., McKinnon, A.C. (2020). Nocturnal hypoxemia is associated with altered parahippocampal functional brain connectivity in older adults at risk for dementia. *Journal of Alzheimer's Disease*, 73(2), 571–584. https://doi.org/10.3233/JAD-190747
10. Naismith, S.L., Mowszowski, L. (2018). Sleep disturbance in mild cognitive impairment: A systematic review of recent findings. *Current Opinion in Psychiatry*, 31(2), 153–159. https://doi.org/10.1097/YCO.0000000000000397
11. Soroka, S.I., Burykh, EH.I. (2004). Vnutrisistemnye i mezhsistemnye perestroiki fiziologicheskikh parametrov pri ostroi ehksperimental'noi gipoksii. *Fiziologiya cheloveka*, 30, №2, s. 58-66.
12. Walker, M.P. (2008). The role of sleep in cognition and emotion. *Annals of the New York Academy of Sciences*, 1156(1), 168-197. https://doi.org/10.1111/j.1749-6632.2009.04416.x

Daxil oldu: 14.02.2025
Qəbul edildi: 21.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/211-215

**Elşən Sərdarov**
Azərbaycan Dövlət Aqrar Universiteti
magistrant
https://orcid.org/0009-0000-7267-1952
elsnsrdarov801@gmail.com

# Günəbaxan odlucasının *(homoesoma nebulella hb.)* bəzi biofizioloji xüsusiyyətlərinə müasir preparatların təsiri

## Xülasə

Günəbaxanın əkin sahələrində ən geniş yayılan və vurduğu ziyana görə ön sıralarda gedən zərərvericilərdən biri də pulcuqqanadlılar və ya kəpənəklər (Lepidoptera) dəstəsinə mənsub olan günəbaxan odlucasıdır. Bu növün əkin sahələrində yayılması 46,3% olmaqla, onların tırtıllarının bitkilərin səbətlərindəki toxumların 37-39%-ni zədələməsi aşkar edilmişdir. Dəstənin digər nümayəndələri isə ümumilikdə yayılmanın 13-18%-ni təşkil edərək bitkiləri 13-30%-dək zədələyirlər. 2023-2024-cü illərdə aparılan tədqiqatlar göstərir ki, günəbaxan bitkisinin məhsuldarlığının 20-25%-i hər il onun təhlükəli zərərvericisi olan günəbaxan odlucası (*Homoesoma nebulella Hb.*) tərəfindən azalır. Buradan da günəbaxan odlucasının böyük təsərrüfat əhəmiyyətinə malik olması açıq şəkildə özünü göstərir. Odur ki, bu zərərvericinin bioekoloji xüsusiyyətlərini, inkişaf dinamikasını, iqtisadi ziyanlı həddini daha ətraflı öyrənməyi və müxtəlif preparatların ona qarşı istifadədə səmərəliliyini dəqiqləşdirməyi məqsədəuyğun hesab etmişik.

***Açar sözlər:*** *günəbaxan, Homoesoma nebulella, odluca, preparat*

**Elshan Sardarov**
Azerbaijan State Agrarian University
Master student
https://orcid.org/0009-0000-7267-1952
elsnsrdarov801@gmail.com

# Effect of Modern Drugs to Some Biophysiological Properties of *Sunflower Pests (Homoesoma Nebulella)*

## Abstract

One of the most widespread and leading pests in sunflower fields due to the damage it causes is the sunflower weevil, which belongs to the order of Lepidoptera. The distribution of this species in the fields is 46.3%, and its caterpillars have been found to damage 37-39% of the seeds in the baskets of the plants. Other representatives of the order, accounting for 13-18% of the total distribution, damage the plants by 13-30%. Studies conducted in 2023-2024 show that 20-25% of the sunflower crop's productivity is reduced annually by its dangerous pest, the sunflower moth (*Homoesoma nebulella* Hb.). From this, the great economic importance of the sunflower weevil is clearly evident. Therefore, we considered it appropriate to study the bioecological characteristics, development dynamics, and economic damage threshold of this pest in more detail, and to clarify the effectiveness of various preparations against it.

***Keywords:*** *sunflower, Homoesoma nebulella, pest, preparation*

## Giriş

Ədəbiyyat icmalı. Günəbaxan səbətinə ziyan vuran günəbaxan odlucasının (*Homoesoma nebulella* Hb.) bioekoloji xüsusiyyətlərini öyrənmişlər (İsmayılzadə, 2008; Royer, Walgenbach, 1987) qeyd edirlər ki, Amerikanın şimal ştatlarında, Şimali Dakota, Cənubi Dakota və Minessota ştatları istisna olmaqla, Homoesoma electellum günəbaxan bitkisinə çox ciddi ziyan vurur (Charlet, 2001) qeyd edirlər ki, günəbaxan zərərvericilərinə qarşı kimyəvi mübarizə tədbirləri effektiv olsa da, müəyyən olunmuşdur ki, əkin işlərinin bir qədər gecikdirilməsi vurulan zərərin xeyli aşağı salınmasına səbəb olmuşdur (Charlet, Brewer, 2009) qeyd edirlər ki, Amerikanın şimal ştatlarında, Şimali Dakota, Cənubi Dakota və Minessota ştatları istisna olmaqla, Homoesoma electellum günəbaxan bitkisinə çox ciddi ziyan vurur. L.Bublik və Q.Vaseçkonun (Bublik, Vasechko, 2010) məlumatına görə kəpənəklərin hər biri bir səbətə 2-5 ədəd yumurta qoymaqla 3-4 gündən sonra yumurtadan çıxan tırtıllar çiçək və sonra toxumun nüvəsi ilə qidalanırlar. T.Selivanova və V.Zatyaminanın (Selivanova, Zatyamina, 1998) fikrincə, Rusiya Federasiyasının Mərkəzi-Qaratorpaq rayonlarında günəbaxan bitkisinə başlıca zərər vuranlar, zərərverici cücülər, xəstəliklər və alaq otlarıdır ki, hər il bu səbəbdən məhsuldarlıq 60-80% aşagı düşür. B.Szabo-Ferenc və Toth-Sandor Vagvölgyi (Szabo-Ferenc, Vagvölgyi, 2007) qeyd edirlər ki, Macarıstan şəraitində iqlim şəraiti Avropa günəbaxan kəpənəklərinin uçuşuna mənfi təsir göstərdiyindən məhsulun zədələnmə dərəcəsi də aşağıdır.

N.H.Səmədov (Səmədov, 1957, 1969) göstərir ki, Azərbaycanda şıqqıldaq böcəklərinin 109 növü yayılmışdır və bunlardan 19 növü taxıl, pambıq, tütün, qarğıdalı, soğan, sarımsaq və kök bitkilərinə müxtəlif dərəcədə ziyan vururlar. S.A.Semerenko və N.V.Ermakova (Semerenko, Ermakova, 2009) qeyd edirlər ki, Krasnadar vilayətində günəbaxan üzərində müşahidə olunmuş zərərvericilərin 38,3%-i Pyralidae fəsiləsinə, 25,3%-i Tenebrionidae fəsiləsinə, 14,8%-i Cucudae fəsiləsinə, 7,2%-i isə Dermestidae fəsiləsinə aid zərərvericilər olmuşdur.

**Tədqiqat**

Material və metodika. Tədqiqatlar zamanı növlərin təyinatında, preparatların istifadəsində, zərərvericilərin iqtisadi-ziyanlı hədlərinin müəyyənləşdirilməsində və riyazi hesablamalar zamanı ümumi qəbul edilmiş metodlardan tanınmış mütəxəssis alimlərin tövsiyə etdikləri üsullardan istifadə olunmuşdur (Tansky, 1988).

Eksperimental hissə. Günəbaxan, qida və ərzaq üçün əhəmiyyətli bir bitki olduğundan onun zərərvericilərinə qarşı mübarizədə ekoloji cəhətdən təhlükəsiz, bitkidə, havada və torpaqda tez parçalana bilmək xüsusiyyətinə malik müasir preparatlardan istifadə olunması daha məqsədəuyğun hesab edilmişdir.

Odur ki, 2024-cü ildə günəbaxan odlucasına qarşı mübarizə tədbirləri sistemi hazırlanmasında istifadə olunacaq mikrobioloji bioinsektisid Rebound WP preparatının 100 litr suya 130; 140; 150 qr, Fersper 20 e. k. insektisidinin 100 litr suya 200; 225; 250ml, Assıpermetrin 100 e. k. preparatının 100 litr suya 60; 80; 100 ml və etalon olaraq ənənəvi 2,5%-li Desis preparatının 0,4 litr/ha məsarif normasından istifadə edilərək sınaq təcrübə işləri 5 variantda və hər variantın sahəsi 50 $m^2$ olmaqla 4 təkrardan ibarət olmuşdur.

Sınağı aparılan hər bir preparatın məsarif norması üzrə aparılan çiləmələrdə işçi məhlulunun sərfiyyat norması 400 litr/ha götürülmüşdür. Çiləmələrdən əvvəl təcrübə və nəzarət variantlarında məsarif normaları əsasında təkrarlar üzrə bitkilərin səbətlərindəki (100 bitkidə orta hesabla) günəbaxan odlucasının nəsillər üzrə (I və II nəsildə) yumurta və tırtıllarının sayı müəyyən edilmişdir.

Beləliklə, 2024-cü ildə aparılmış tədqiqatlar nəsillər üzrə günəbaxan odlucasının 100 bitkinin səbətlərində orta hesabla 6-8 ədəd yumurta, 2-3 ədəd tırtıl; 8-10 ədəd yumurta, 6-8 ədəd tırtıl olduqda, ona qarşı mübarizənin başlanmasının iqtisadi cəhətdən səmərəli olması məqsədəuyğun hesab edilmişdir. Ona görə də 2009-cu ildə zərərvericiyə qarşı yeni preparatların sınağının aparılmasında da yuxarıda göstərilən həmin iqtisadi - ziyanlı hədd göstəricilərindən istifadə edilmişdir (cədvəl 1).

*Elmi Tədqiqat* **Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 5 / 211-215**
***Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 5 / 211-215** **e-ISSN: 2789-6919**

**Cədvəl 1** Günəbaxan odlucasına qarşı müasir preparatların sınağının nəticələri

| Sıra sayı | Məsarif Normaları 100 litr suya ml, qr. | Məsarif normaları, 100 litr suya mi- lə , qr.-la | Dərmanlamadan əvvəl zərərvericinin miqdarı (100 səbətdə orta hesabla, ədədlə) | | Preparatların dərmanlamadan sonrakı günlər ərzində bioloji səmərəliliyi (%-lə) | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | | 5 | | 10 | | 15 | | 20 | |
| | | | Yumrta | Tırtıl | Yumra | Tırtıl | Yumrta | Tırtıl | Yumrta | Tırtl | Yumrta | Tırtıl |
| 1 | Rebaunt bioinsektisid | 130 | 6 | 3 | 25,0 | 25,0 | 60,0 | 67,0 | 75,0 | 78,0 | 80,0 | 83,3 |
| | | 140 | 8 | 3 | 37,5 | 50,0 | 70,0 | 67,0 | 83,3 | 88,0 | 80,0 | 92,0 |
| | | 150 | 7 | 3 | 50,0 | 50,0 | 70 | 83,3 | 93,3 | 100 | 90 | 93 |
| 2 | Fersper 20 e.k. | 200 | 7 | 3 | 33,3 | 25,0 | 50 | 67 | 68 | 78 | 70 | 80 |
| | | 225 | 8 | 3 | 37,5 | 25,0 | 60 | 83,3 | 75 | 90 | 80 | 83 |
| | | 250 | 8 | 3 | 38,0 | 50,0 | 60 | 67 | 83,3 | 78 | 80 | 92 |
| 3 | Assipermentrin 100 e.k. | 60 | 7 | 3 | 38,0 | 25,0 | 60 | 67 | 75 | 78 | 80 | 83 |
| | | 80 | 8 | 3 | 38, 0 | 50,0 | 60 | 83,3 | 75 | 78 | 70 | 83 |
| | | 100 | 8 | 2 | 50,0 | 50,0 | 70 | 67 | 75 | 89 | 70 | 92 |
| 4 | Etalon 2,5%-li Desis | 100 | 7 | 3 | 25,0 | 25,0 | 50 | 68 | 68 | 89 | 70 | 83 |
| 5 | Nəzarət dərmansız | - | 7 | 2 | - | - | - | - | - | - | - | - |

Preparatların məsarif normaları üzrə çiləmələrin aparılması I - nəsildə 12 iyun, II - nəsildə isə 10 iyul tarixində həyata keçirilmişdir. Dərmanlamanın 5-10 -15-20 -ci günləri ərzində müşahidələr aparılmış, sınaq təcrübə işlərinin nəticələri cədvəl 4.12 - də verilmişdir.

Cədvəldən göründüyü kimi, sınağı aparılmış preparatların müxtəlif məsarif normalarının yüksək bioloji səmərəliliyə malik olmaları müəyyən edilmişdir. Lakin tədqiqatlar göstərir ki, bioinsektisid Rebaunt preparatının təsirindən günəbaxan odlucasının yumurta və tırtıllarının miqdarı dərmanlamanın 15-ci günü minimum səviyyəsində olduğundan tırtıllara qarşı bioloji səmərəliliyi 100%-ə bərabər olmuşdur (cədvəl 2).

| Təcrübənin variantları | Məhlulun qatılığı (100 litr suya qr-la; ml -lə) | Tırtıllara təsiri | | Puplara təsiri (Kəpənəklərin çıxışı) | | Kəpənəklərə təsiri (repraduktivlik) | |
|---|---|---|---|---|---|---|---|
| | | Cəmi (ədədl) | Puplaşanlar ədəd \% | İnkişaflarını başa çatdıranlar ədəd \ % | Kəpənək çıxmadı ədəd \ % | Yumurta qoyanlar, ədəd / % | Steril, ədəd \ % |
| Rebaunt bionsekstis idi | 150 | 100 | 52 (52 %) | 20♂39 (75%)19♀ | 13(25%) | 12♀(63 %) 1♀= 92 yum. | 7♀(37%)) |
| Fersfer 20 e.k. | 250 | 82 | 40 (48,8%) | 18♂32 (80%)14♀ | 8 (20 %) | 10♀(71,4 %) 1♀= 88 yum. | 4♀(28,6%) |
| Assiperme ntrin 100 e. .k. | 100 | 78 | 40 (51,3%) | 18♂34 (85%)16♀ | 6 (15 %) | 10♀(62,5 %) 1♀= 87,8 yum. | 6♀(37,5%) |
| Desis 2,5 % -li etalon | 100 | 80 | 42 (52,5%) | 20♂36 (85,7%)16♀ | 6(14,3%) | 11♀(68,75%) 1♀= 94 yum. | 5♀(31,2%) |
| Nəzarət | - | 24 | 20 (83,3%) | 11♂20 (100%)9♀ | 0 | 9♀(100 %) 1♀=247,2yum . | 0 |

Preparatın bioloji səmərəliliyinin müəyyən edilməsi üzrə aparılan tədqiqatlar Fersper 20 e. k preparatının 100 litr suya 250 ml, Assipermetrin 100 e.k. insektisidinin isə 100 litr suya 100 ml məsarif normalarının yalnız dərmanlamaların 20-ci günlərində zərərvericinin yumurta və tırtıllarının azalmasında 89-92% bioloji səmərəliliyə malik olmaları dəqiqləşdirilmişdir.

Etalon olaraq istifadə edilmiş 2,5 % -li Desis e. k. preparatnın 100 litr suya 100 ml məsarif normasında istifadə edilməklə zərərvericiyə qarşı aparılan çiləmələrdə yumurta və tırtıllara qarşı dərmanlamanın 15-20 günlərində bioloji səmərəlilik 70-89%-ə bərabər olmuşdur.

Aparılan sınaq təcrübə işlərində belə qənaətə gəlmək olar ki, günəbaxan əkinlərində günəbaxan odlucasına qarşı mübarizədə ekoloji cəhətdən təhlükəsiz olan bioinsektisid Rebount preparatının 100 litr suya 150 qr. məsarif normasında istifadə olunması məqsədə uyğundur.

Tədqiqatlar zamanı laboratoriya şəraitində mövcud preparatların günəbaxan odlucasının bəzi biofizioloji göstəricilərinə təsirini öyrənmək üçün çoxlu sayda II-III yaş mərhələsində olan tırtıllara müxtəlif qatılıqlı məhlullarla çiləmə üsulu ilə təsir edərək sonrakı inkişaf mərhələləri izlənilmişdir. Alınmış nəticələr cədvəl 4.13-də öz əksini tapır. Cədvəldən göründüyü kimi preparatların təsirindən tırtılların yalnız 48-52%-i öz inkişaflarını tam başa çatdıraraq puplaşmaya gedirlər. Qalanları isə inkişaflarını başa çatdırmadan məhv olurlar.

Rebaunt bionsektisidi ilə təsir etdikdə pup mərhələsinə çatmış 52 fərddən yalnız 39-dan (75%) kəpənəklər uçmuşdur. Uçmuş kəpənəklərin 20-si erkək, 19-u isə dişi fərd olmuşdur. Pupların 13-ü (25%) tam formalaşmadığı üçün onlardan kəpənəklər uçmamışdır. Kəpənəklər mayalandıqdan sonra 19 dişi fərd üzərində aparılan müşahidələr göstərdi ki, kəpənəklərin 37%-i (7 ədəd) steril vəziyyətdə 2-3 gün yaşadıqdan sonra məhv olmuşlar. 63%-i (12 kəpənək) isə yaşadıqları 4-5 gün ərzində cəmi 1104 yumurta qoymuşlar, yəni hər dişi fərd orta hesabla 22 yumurta qoya bilmişdir. Yəni nəzarət variantına nisbətən qoyulmuş yumurtaların sayı təxminən 2,7 dəfə az olmuşdur. Fersper 20 e. k. və Assipermentrin preparatlarının təsiri zamanı da tırtılların tam inkişafı mütənasib olaraq 48,8% və 51,3% olmuşdur. Kəpənəklərin çıxışı 80%, 85% olsa da, onların 28,6% və 37,5%-i steril olmuşdur. Mayalanmadan sonra yumurta qoyan kəpənəklərin sayı hər 2 variantda 10 dişi fərd olmuşdur. Bu kəpənəklərin yumurta qoyması müşahidə olunsa da, onların miqdarı əvvəlki variantda olduğu kimi nəzarətə nisbətən çox az, yəni hər kəpənəyə orta hesabla 87- 88 yumurta qeydə alınmışdır ki, bu da gözlənildiyindən 2,8 dəfə azdır.

**Nəticə**

Günəbaxan odlucasına qarşı mübarizənin iyun ayının II yarısı (I nəslin yumurta və tırtılına qarşı), avqustun II ongünlüyündə (II nəslə qarşı) və sentyabrın axırı, oktyabrın əvvəllərində aparılması

**Tədqiqat**

Lay sularının təmizlənməsi və yenidən istifadəsi müasir dövrün ətraf mühit və su ehtiyatlarının qorunması sahəsində qarşıya qoyduğu əsas çağırışlardan biridir. Karbohidrogen yataqlarında hasilat prosesi zamanı böyük həcmdə lay suları çıxarılır ki, bu suların tərkibi çirkləndirici maddələrlə zəngindir (Əliyev, Kazımov, Rəhimov, 2008; Umetbayev, Murzlyakov, Volochkov, 2000). Həm ekoloji risklərin azaldılması, həm də təbii resursların səmərəli istifadəsi baxımından bu suların təmizlənməsi və yenidən dövriyyəyə daxil edilməsi vacibdir. Müasir texnologiyalar, xüsusən də membran texnologiyaları, qabaqcıl oksidləşmə metodları və nanomaterialların tətbiqi, lay sularının effektiv təmizlənməsi üçün geniş imkanlar yaradır. Bu yanaşmalar yalnız çirkləndiricilərin təsirini minimuma endirmir, eyni zamanda təmizlənmiş suların təkrar istifadəsini mümkün edir, beləliklə, sənaye proseslərinin daha dayanıqlı və iqtisadi baxımdan səmərəli olmasına şərait yaradır (Skorodievskiy, Shurygin, 2008; Pazin, Tkachev, Pastukhova, 2003). Lay sularının təmizlənməsi və yenidən istifadəsi sahəsində innovativ həllərin tətbiqi, həm ekoloji, həm də iqtisadi məqsədlərə nail olmaq üçün strateji əhəmiyyət daşıyır. Lay sularının təmizlənməsi prosesində ənənəvi metodlarla yanaşı, müasir texnologiyaların tətbiqi getdikcə daha geniş miqyasda həyata keçirilir. Ənənəvi mexaniki, kimyəvi və bioloji üsullar müəyyən nəticələr versə də, onların səmərəliliyi bəzi hallarda məhdud olur. Buna görə də, müasir yanaşmalar daha effektiv və ekoloji baxımdan üstün həllər təqdim edir. Membran texnologiyaları, xüsusən nanofiltrasiya və tərs osmoz sistemləri, lay sularında həll olmuş duzların və digər çirkləndiricilərin ayrılmasında yüksək nəticələr verir. Bu texnologiyalar suların yüksək keyfiyyətdə təmizlənməsini təmin edir və onların sənaye və texniki məqsədlər üçün yenidən istifadəsinə imkan yaradır (Hüseynov, Kazımov, 2010). Bununla yanaşı, qabaqcıl oksidləşmə prosesləri, məsələn, ozonasiya, Fenton reaksiyası və UV şüalanması, üzvi çirkləndiricilərin və toksik maddələrin tamamilə parçalanmasını təmin edir. Nanomaterialların tətbiqi lay sularının təmizlənməsində yeni perspektivlər açır.

Lay suların tərkibindən kimyəvi elementlərdən, üzvi və biogen maddələrin çıxarılması eyni zamanda bir neçə vacıb texnoloji, ekoloji və iqtisadi məsələlərin həllində ciddi dönüş yarada bilər:

1.Təmizlənmiş lay sularının təkrarən laylara vurulması ilə neftqazçıxarmanın əsas problemi olan lay təzyiqinin saxlanması və hasilatın stabilləşdirilməsi məsələsinin çözülməsinə nail olmaq;

2.Mövcud normalara üyğun təmizlənmiş lay suyunun suvarmanın təmin edilməsinə yönəltmək;

3.Geniş çeşidli kimyəvi elementlərin və maddələrin əldə olunması hesabına daxili və xarici tələbatları ödəmək və külli səmərə əldə etmək.

**Nəticə**

1. Lay sularının təmizlənməsi texnologiyaları və onların effektivliyi, çirkləndiricilər və onların təmizlənmə metodları, təmizlənmə ilə bağlı problemlər və həll yolları, təmizlənmə metodlarının effektivliyi, xərcləri və xüsusiyyətləri, təmizlənmiş lay sularının istifadə sahələri, təmizləmə tələbləri və ekoloji faydaları barədə təhlil aparılmış və nəticələr çıxarılmışdır.

2. Lay sularının tərkibində olan dəyərli kimyəvi elementlər, üzvi və biogen maddələr barədə məlumatlar sistemləşdirilmiş və onların bir qisminin ayrılması texnologiyaları qeyd olunmuşdur.

3. Lay sularının təmizlənməsi, dəyərli kimyəvi elementlər, üzvi və biogen maddələrin əldə olunması məqsədilə çoxmərhələli proqramın işlənməsi və zaman itirmədən fəaliyyətə başlanması qeyd olunmuşdur.

**Ədəbiyyat**

1. Bandaletova, A.A., Gavrilov, A.Y., Galin, E.V. (2021). *Izvlechenie litiya iz poputnykh vod na primere Orenburgskogo NGKM*. Nauchno-Tekhnicheskii Tsentr «Gazprom neftI» (OOO «Gazpromneft' NTTS») https://doi.org/10.51890/2587-7399-2021-6-1-29-32.
2. Əliyev, Y.M., Kazımov, Ş.P., Rəhimov, C.Ə. və b. (2008). *Lay sularının axınının təcrid edilmə üsulu*. Patent №J20080089. Azərbaycan Respublikası.
3. Hüseynov, F.Ə., Kazımov, Ş.P. (2010). *Karbohidrogen yataqlarının lay suları və işlənmənin texniki-iqtisadi göstəriciləri*. NQETLİ-nin nəşriyyatı.

4. Xasayev, A.M., Bağırov, M.K., Kazımov, Ş.P. və b. (2000). *Layın quyudibi zonasının bərkidilməsi üçün tamponaj məhlulu*. Patent №J20000197. Azərbaycan Respublikası.
5. Pazin, A.M., Tkachev, A.E., Pastukhova, N.N. (2003). *Sostav dlya izolyatsii plastovykh vod. R.Zh. Gornoye delo*. Patent Rossii №2213214.
6. Skorodievskiy, V.G., Shurygin, M.N. i dr. (2008). Resheniye problemy ogranicheniya vodopritokov v skvazhinakh s podoshvennym zaleganiyem vody. *Neftyanoye khozyaystvo*, (3), 82-85.
7. Shapovalova, E.A. (2021). Bezreagentnyi sposob izvlecheniya ioda iz plastovykh vod. *Peredovye tekhnologii i materialy budushchego: sbornik statei IV Mezhdunarodnoi nauchno-tekhnicheskoi konferentsii «Minskie nauchnye chteniya-2021»*, 9 dekabrya, BGTU, T. 1, c. 352-356.
8. Salavatov, T.Ş., Əliyev, Y.M., Kazımov, Ş.P. və b. (2010). Quyularda su axının təcrid edilməsi üsullarının səmərəliliyinə dair. *ANT Jurnalı*, (6), səh.20-25.
9. Umetbayev, V.G., Murzlyakov, V.F., Volochkov, N.S. (2000). *Kapital'nyy remont skvazhin. Izolyatsionnyye raboty*. RIC ANK «Bashneft».
10. https://patents.google.com/patent/RU2107021C1/ru.
11. https://www.anl.az/down/meqale/az_neft_teser/2019/06-07/04(meqale).pdf
12. https://www.researchgate.net/publication/376085876_CHARACTERISTICS_OF_THE_AGGREGATION_KINETICS_PROPERTIES_OF_FIBROIN_SOLUTION

Daxil oldu: 11.02.2025
Qəbul edildi: 15.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/249-252

**Elşən Sultanov**
Azərbaycan Dövlət Dəniz Akademiyası
texnika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0002-0002-7038
elshen_sultanov@mail.ru
**Ruslan Əlicanov**
Azərbaycan Dövlət Dəniz Akademiyası
doktorant
https://orcid.org/0009-0007-4117-2994
ralicanov@mail.ru

# Gəmilərdə hidrogen energetikasından istifadə imkanlarının araşdırılması

## Xülasə

Məqalədə hidrogen enerjisindən istifadə imkanları araşdırılır. Qlobal iqlim dəyişiklikləri və ətraf mühitin çirklənməsi enerji sektorunda əsaslı dəyişiklikləri zəruri edir. Dəniz nəqliyyatı da bu sahədə inkişafdan geri qalmır. Gəmiçilik şirkətləri və sahibləri gəmiqayırma zavodları tərəfindən tikilən gəmilərdə ekoloji cəhətdən təmiz olan yaşıl enerji mənbələrinin tətbiqi barədə həll yolları axtarmağa başlayırlar. Bu həll yollarından biri kimi hidrogen enerji texnologiyalarının tətbiqi ilə gəmiçilikdə ekoloji cəhətdən təmiz enerjinin alınması və ətraf mühitin çirklənməsinin qarşısının alınmasıdır. Hidrogenin enerjisinin gəmilərdə tətbiqi, ətraf mühitin mühafizəsi və enerji səmərəliliyi baxımından zaman keçdikdə daha çox maraq doğurur.

Gəmilərdə həmin texnologiyanın tətbiqi yanacaq sərfini azaltmağa və karbon qazı emissiyasını azaltmağa imkan verəcəkdir. Həmçinin, məqalədə hidrogen enerjisinin hazırki vəziyyəti haqqında məlumatlar verilməklə yanaşı, onların gəmilərdə tətbiqindən və üstünlüklərindən də bəhs olunur.

***Açar sözlər:*** *gəmi, hidrogen enerjisi, energetika, generator, karbon emissiyası*

**Elshan Sultanov**
Azerbaijan State Marine Academy
PhD in Engineering
https://orcid.org/0009-0002-0002-7038
elshen_sultanov@mail.ru
**Ruslan Alijanov**
Azerbaijan State Marine Academy
PhD student
https://orcid.org/0009-0007-4117-2994
*ralicanov@mail.ru*

# Exploring the Possibilities of Using Hydrogen Energy on Ships

## Abstract

The article examines the possibilities of using hydrogen energy. Global climate change and environmental pollution necessitate fundamental changes in the energy sector. Maritime transport is also not lagging behind in this area. Shipping companies and owners are beginning to look for solutions to the application of environmentally friendly green energy sources in ships built by shipyards. One of these solutions is the application of hydrogen energy technologies to obtain environmentally friendly energy in shipping and prevent environmental pollution. The application of hydrogen energy in ships is becoming more and more interesting over time in terms of environmental protection and energy efficiency.

 

The application of this technology in ships will allow reducing fuel consumption and carbon dioxide emissions. The article also provides information on the current state of hydrogen energy, as well as discusses its application and advantages in ships.

***Keywords:*** *ship, hydrogen energy, energy, generator, carbon emissions*

## Giriş

Qlobal iqlim dəyişiklikləri və ətraf mühitin çirklənməsi enerji sektorunda əsaslı dəyişiklikləri zəruri edir. Dəniz nəqliyyatı da bu sahədə inkişafdan geri qalmır.

Hidrogenin enerjisinin gəmilərdə tətbiqi, ətraf mühitin mühafizəsi və enerji səmərəliliyi baxımından zaman keçdikdə daha çox maraq doğurur (Andreas, 2008; Salameh, Abdelkareem, Olabi, Sayed, Al-Chaderchi, Rezk, 2021).

Bu mövzu ilə bağlı əsas məqamlar aşağıdakılardır:

1. Hidrogen enerjisinin üstünlükləri:

- Ətraf mühitə zərərin olmaması: yanma nəticəsində yalnız buxar əmələ gəlir və karbon emissiyası sıfıra yaxın olur.
- Alternativ enerji ilə istehsal oluna bilir: yaşıl hidrogen alternativ enerji ilə istehsal olunduqda karbon qazı tamamilə neytral olur.
- Enerji sıxlığı: gəmilərdə uzaq səfərlər üçün sərfəlidir.

2. Tətbiq olunduğu sahələr

- Sərnişin və yük gəmilərində: qısa və orta məsafəli səfərlər üçün uyğundur.
- Batareya-hidrogen hibrid sistemləri: hidrogen enerjisində elektrik batareyalarından istifadə imkanları.
- Köməkçi enerji mənbəyi kimi: gəmilərdə ənənəvi enerji sistemlərinə köməkçi kimi də tətbiq oluna bilər.

**Tədqiqat**

Gəmilərdə hidrogen istehsalı**.** Gəmilərdə hidrogen enerjisinin istehsalının ən geniş yayılmlş üsulu elektrolizdir. Elektroliz üsulu suyu cərəyan ilə parçalayaraq hidrogen istehsal edir (Bent, 2019).



$$2H_2O \rightarrow 2H_2 + O_2$$

Gəmilərdə elektroliz üçün lazım olan enerji alternatif enerji mənbələrindən alınır.

Gəmilərdə elektroliz üsulu vasitəsilə sudan hidrogen qazının alınması texnoloji cəhətdən ən asan üsuldur. Bunun üçün Hoffinan aparatı adlanan elektroliz vannasına su doldurulur və iki ədəd elektrod daxil edilir. Kənar cərəyan mənbəyi vasitəsilə elektrodlardan birinə müsbət, digərinə isə mənfi gərginlik verilir. Dövrədən axan cərəyan hesabına su molekullan müsbət yüklü hidrogen və mənfi yüklü hidroksil ionuna parçalanır. Sonra yaranmış ionlar əks işarəli elektrodlara doğru hərəkət etməyə başlayır (Elena, 2018).

Müsbət yüklü hidrogen ionu katoddan elektron alaraq, neytral atom halında havaya qalxır. Mənfi yüklü hidroksil ionu anoda elektron verərək, su və oksigen atomuna çevrilir və katod ətrafında oksigen ayrılır. Suyun sabit cərəyanın təsirilə parçalanma reaksiyasını aşağıdakı kimi təsvir etmək olar (Godfreye, 2012).




***Şəkil 1.*** Elektroliz prosesi

*Gəmilərdə hidrogenin saxlanması və elektroenergetik sistemlərdə tətbiqi. Gəmilərdə hidrogen*

enerjisi ətraf mühitə zəzər verməyən, davamlı və yüksək səmərəliliyə malik enerjidir (Salamov, 2018).

Lakin hidrogen enerjisinin gəmilərdə tətbiqinin əsas vacib məqamlarından biri də hidrogenin gəmidə təhlükəsiz və effektiv saxlanmasıdır. Gəmilərdə hidrogenin saxlanması üçün aşağıdakı əsas üsullar vardır:

1. Yüksək təziqli qaz halında:

- Gəmidə hidrogen 350-700 bar təzyiqində silindirik tanklarda saxlanılır.
- Gəmidə istifadə texnologiyası nisbətən sadədir və tez doldurula bilir.
- Gəmilərdə hidrogen enerjisinin saxlanılmasının mənfi cəhəti tankların ağır və həcimli olması, partlayış riskinin olmasıdır.

2. Maye halında:

- Gəmidə hidrogen, aşağı temperaturada (-253°C) mayeləşdirilərək saxlanılır.
- Gəmidə bu üsulun üstünlüyü enerji sıxlı çox olduğu üçün az yer tutmasıdır.
- Gəmidə bu üsulun tətbiqinin mənfi cəhəti isə soyutma sisteminin mürəkkəb olması və yer tutumunun çox olmasıdır.

Gəmilərdə hidrogenin saxlanılması zamanı aşağıdakı təhlükəsizlik tədbirləri mütləqdir.

- Qaz sızmalarının müəyyən olunması üçün xüsusi sensorlar quraşdırılır.
- Ventilyasiya sistemləri vasitəsilə qazın toplanmasının qarşısının alınması.
- Heyətin yanğından mühafizə sistemləri barəsində təlimdən keçməsi.
- Hidrogen tanklarının gəmilərdə az riskli sahələrdə məsələn, göyərtədə və ya yaşayış sahəsindən kənarda yerləşdirilməsi.

Hidrogen təmiz yanan yanacaq növüdür. Hidrogenin yanması zamanı yanan məhsul kimi yalnız buxarı əmələ gəlir və bu proses zamanı istilik və elektrik enerjisinin istehsalı baş verir. Hidrogen elektrik enerjisinin həm istehsalı həm də saxlanılması üçün ən effektiv vasitədir. Gəmilərdə elektrik enerjisinin saxlanılması üçün ən geniş istifadə olunan vasitə akkumlyator batareyalarıdır (Sultanov, 2021; Jimenez, Kim, 2022). Lakin onların bir sıra çatışmazlıqları mövcuddur. Bunlara istehsal xərclərini, istismar müddətini və s. misal göstərmək olar. Bununla yanaşı istismar müddəti bitmiş akkumlyator batareyyalarının utilizasiya prosesi çox baha başa gəlir. Yuxanda qeyd etdiyimiz kimi gəmilərdə hidrogen istehsalı üçün ən səmərəli üsul elektroliz üsuludur. Buna səbəb yüksək elektrik sərfiyyatıdır. Lakin elektrolizi alternativ enerji mənbələrindən alınan elektrik enerjisi ilə etdikdə daha çox səmərə əldə olunacaq. Buna misal olaraq günəş və ya külək elektrik stansiyalannda istehsal olunan elektrik enejisi vasitəsi ilə elektroliz edərək hidrogen istehsal edib bu hidrogeni depolayaraq daha sonra elektrik enerjisinin alınmasında istifadə etmək olar (Azərbaycan, 2030; Varcal, 2019).




***Şəkil 2.*** *Elektrik enerjisin hidrogen ilə akumlyasiyası*

Hazırda bir sıra şirkətlər hidrogen enerjisi ilə işləyən generatorların sınağını həyata keçirmişdir.

Hydroville adlı gəmidə təzyiqli qaz forması istifadə edilir. Energy observer isə həm istehsal edir, həm də hidrogeni maye halında saxlaya bilir. Həmçinin, Norveçdə və Yaponiyada bəzi sərnişin və yük gəmilərində artıq metal hidrid texnologiyası sınaq mərhələsindədir (Fattouh, 2019; Jack, 2022).




***Şəkil 3.*** Hidrogen generatoru

## Nəticə

Aparılmış təhlillərdən məlum olmuşdur ki, gəmilərdə hidrogen enerjisindən istifadə karbon emissiyalarını azaltmaq və ətraf mühiti qorumaq üçün böyük potensiala malikdir. Həmçinin, hidrogen enerjisinin gəmilərdə istifadə olunması ekoloji cəhətdən təmiz enerji istehsalının artmasına və qismən karbonsuz (yaşıl) gəmiçiliyə nail olmağa kömək edəcəkdir. Hidrogen enerjisi texnologiyalarının inkişaf etdirilməsi fonunda təmiz enerji istehsalının artması bu enerjidən gəmilərdə istifadəni mümkün edir.

## Ədəbiyyat

1. Andreas, Z., Andreas, B., Louis, S. (2008). *Hydrogen as a Future Energy Carrier*. Wiley.
2. *Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər sənədi.* https:president.az/az/articles/view/50474.
3. Bent, S. (2019). *Hydrogen and Fuel Cells: Emerging Technologies and Applications*. Academic.
4. Elena, P., (2018). *Hydrogen Energy: Economic and Social Challenges.*
5. Fattouh, R., Poudineh R., (2019). The rise of renewables and energy transition: what adaptation strategy exists for oil companies and oil-exporting countries? *Energy Transit*. vol. 3, pp. 45-58. DOI: 10.1007/s41825-019-00013-x. 6.
6. Godfrey, B. (2012). *Renewable Energy: Power for a Sustainable Future.*
7. Jack, B. (2022*). Energy. GHG Consultant, Overview of decarbonization pathways for the oil and gas and petrochemical industries.*
8. Jimenez, V.J., Kim, H. (2022). Minima review of ship energy efficiency research and directions towards emission reduction in the maritime industry. *Journal of Cleaner Production*, 366:132888.
9. Salamov, O.M., Atamoğlanova, Q.M. (2018). Ənənəvi və qeyri-ənənəvi yanacaq növlərindən istifadənin perspektivləri və müqayisəli analizi. *AzTU-nun Elmi əsərlər toplusu*. №4.
10. Salameh, T., Abdelkareem, M., Olabi, A., Sayed, E., Al-Chaderchi, M., Rezk, H. (2021). Integrated standalone hybrid solar pv, fuel cell and diesel generator power system for battery or supercapacitor storage systems in khorfakkan, united arab emirates. *International Journal of Hydrogen Energy*, vol. 46, no.8, pp. 6014-6027.
11. Sultanov, E.F., İsmayılov, S.S. (2021). Gəmilərdə alternativ enerji mənbələrindən istifadə imkanlarının araşdırılması. *ADDA Elmi əsərlər*. №2, s. 151-157.
12. Varcal, S. (2019). Energy revolutions take time. *World Energy*. Vol. 44, pp. 10-14.

Daxil oldu: 06.02.2025
Qəbul edildi: 18.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/253-257

**Jamil Aliyev**
Azerbaijan State Oil and Industry University
Master student
https://orcid.org/0009-0002-6409-1856
jamilaliyev42@gmail.com

# A Conceptual Framework for Adaptive Ci/Cd Converyors Optimization Via Deep Reinforcement Learning

## Abstract

Continuous Integration and Continuous Deployment (CI/CD) pipelines are essential for modern software delivery, yet their optimization presents ongoing challenges due to dynamic conditions and inherent complexity. Static configurations struggle to adapt efficiently to variations in code changes, resource availability, and testing needs. This paper proposes a conceptual framework utilizing Deep Reinforcement Learning (DRL) to enable adaptive orchestration of CI/CD pipeline stages. We articulate the conveyors optimization problem as a sequential decision-making process amenable to RL techniques. A DRL agent, under this framework, would learn optimal policies for dynamic task scheduling, resource allocation, and predictive test selection by interacting with the conveyors environment, guided by a reward function balancing efficiency and quality. The proposed approach aims to overcome the limitations of static and simple heuristic methods by leveraging the learning capabilities of DRL to continuously refine pipeline execution strategies based on observed states and outcomes. This research posits that such adaptive, learning-based systems represent a promising direction for significantly enhancing the performance and responsiveness of software delivery pipelines.

***Keywords:*** *continuous integration, uninterrupted delivery, CI/CD optimization, deep reinforcement learning, software engineering, DevOps, conveyor crchestration, conceptual framework*

**Cəmil Əliyev**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
https://orcid.org/0009-0002-6409-1856
jamilaliyev42@gmail.com

# Dərin möhkəmləndirici öyrənmə vasitəsilə adaptiv ci/cd konveyerlərinin optimallaşdırılması üçün konseptual freymvork

## Xülasə

Fasiləsiz İnteqrasiya və Fasiləsiz Çatdırılma (CI/CD) konveyerləri müasir proqram təminatının çatdırılması üçün vacibdir, lakin onların optimallaşdırılması dinamik şərtlər və daxili mürəkkəbliyə görə davamlı çətinliklər yaradır. Statik konfiqurasiyalar kod dəyişikliklərindəki variasiyalara, resurs mövcudluğuna və test ehtiyaclarına effektiv şəkildə adaptasiya olmaqda çətinlik çəkir. Bu məqalə, CI/CD konveyer mərhələlərinin adaptiv orkestrasiyasını təmin etmək üçün Dərin Möhkəmləndirici Öyrənmədən (DRL) istifadə edən bir konseptual freymvork təklif edir. Biz konveyer optimallaşdırılması problemini RL (Möhkəmləndirici Öyrənmə) texnikalarına uyğun olan ardıcıl qərar qəbuletmə prosesi kimi təqdim edirik. Bu freymvork daxilində bir DRL agenti, effektivlik və keyfiyyəti balanslaşdıran bir mükafat funksiyası ilə idarə olunaraq, konveyer mühiti ilə qarşılıqlı əlaqədə olmaqla dinamik tapşırıqların planlaşdırılması, resursların bölüşdürülməsi və proqnozlaşdırıcı test seçimi üçün optimal siyasətlər öyrənəcəkdir.

Təklif olunan yanaşma, müşahidə edilən vəziyyətlərə və nəticələrə əsaslanaraq konveyer icra strategiyalarını davamlı olaraq təkmilləşdirmək üçün DRL-nin öyrənmə qabiliyyətlərindən istifadə edərək statik və sadə evristik metodların məhdudiyyətlərini aradan qaldırmağı hədəfləyir. Bu tədqiqat iddia edir ki, belə adaptiv, öyrənmə əsaslı sistemlər proqram təminatının çatdırılma konveyerlərinin performansını və cavabdehliyini əhəmiyyətli dərəcədə artırmaq üçün perspektivli bir istiqamət təmsil edir.

***Açar sözlər:*** *fasiləsiz inteqrasiya, fasiləsiz çatdırılma, CI/CD optimallaşdırılması, dərin möhkəmləndirici öyrənmə, proqram mühəndisliyi, DevOps, Konveyer Orkestrasiyası, konseptual freymvork*

## Introduction

The capacity for rapid and reliable software delivery constitutes a significant advantage in today's technology-driven markets. Continuous Integration and Continuous Deployment (CI/CD) pipelines serve as the backbone for this capability, automating critical steps from code commit to production deployment (Humble, Farley, 2010). However, the increasing scale of software systems and development teams often leads to CI/CD pipelines that are themselves complex systems, susceptible to inefficiencies, bottlenecks, and substantial operational overhead (Shahin, Babar, Zhu, 2017). Persistent challenges include managing long build and test durations, optimizing the use of computational resources, and intelligently adapting testing strategies to the specific context of each change.

Conventional optimization strategies frequently depend on manual adjustments, static pipeline definitions, or predefined heuristic rules (Rahman, Zulkernine, 2019). While offering some benefits, these approaches inherently lack the agility to respond effectively to the fluid nature of software development environments. Factors such as the diverse characteristics of code commits, fluctuating infrastructure loads, and evolving perceptions of risk associated with changes are difficult to accommodate within static paradigms. This often results in a suboptimal trade-off between resource expenditure, feedback latency, and the thoroughness of quality assurance processes.

Deep Reinforcement Learning (DRL), a rapidly advancing field within artificial intelligence, provides powerful tools for deriving optimal control policies in complex and dynamic settings (Sutton, Barto, 2018). DRL agents possess the ability to learn effective strategies through trial-and-error interaction, continually adapting their behavior to maximize a defined reward signal. We propose that applying DRL principles to the orchestration of CI/CD pipelines holds significant potential for performance enhancement. This paper outlines a conceptual framework for such an application, where a DRL agent would learn to make intelligent, context-sensitive decisions regarding pipeline execution. The primary objective of this framework is to enable adaptive optimization that minimizes pipeline latency and resource utilization while upholding necessary software quality standards.

**Research**

Proposed DRL Framework for CI/CD Optimization. Efforts to optimize CI/CD workflows have explored various avenues. Foundational techniques include task parallelization and build caching improvements (Kerzazi, Adams, 2015). Static analysis of pipeline configurations aims to identify structural optimization opportunities. More advanced methods encompass heuristic-driven test case prioritization and selection, attempting to execute impactful tests earlier or omit redundant tests based on code change analysis (Elbaum, Malishevsky, Rothermel, 2002), (Marijan, Gotlieb, 2017). Test Impact Analysis (TIA) specifically seeks to identify the test subset relevant to particular code modifications, potentially reducing test execution time (Orso, Rothermel, 2014).

Despite their utility, these methods often operate under fixed assumptions or rules that may not fully capture the dynamic interplay of factors influencing pipeline performance. Machine learning techniques, such as supervised learning for predicting build outcomes or test failures (Machalica, et al., 2019), have emerged but typically do not directly yield optimal control policies for pipeline execution.

Reinforcement learning offers a distinct approach focused on learning optimal actions through environmental interaction. While RL has demonstrated success in domains like complex game environments (Mnih, et al., 2015) and robotic control (Levine, et al., 2016), its application to comprehensive CI/CD orchestration remains largely conceptual. Some explorations might exist for specific sub-problems like resource scaling using simpler RL algorithms (Chowdhury, Rao, 2018), but a holistic framework employing modern DRL for simultaneous optimization of scheduling, resource management, and intelligent test selection represents an area ripe for investigation. Our proposed framework conceptualizes the pipeline as a Markov Decision Process (MDP), leveraging DRL's capacity to handle high-dimensional state inputs and learn sophisticated, adaptive control policies.

We conceptualize the CI/CD pipeline optimization task as an MDP, suitable for applying DRL techniques. This requires defining the state space, action space, and reward function structure. The objective is for a DRL agent to learn an optimal policy, $\pi(a|s)$, maximizing the expected long-term reward.

The state representation, *s*, is envisioned to encapsulate the necessary context for informed decision-making at relevant points within the pipeline. This state would ideally include information about the incoming code commit (e.g., nature and scope of changes, historical data related to modified components), the current execution status of the pipeline (e.g., active stage, completed tasks, queued tasks), the availability and load of computational resources (e.g., worker nodes, CPU/memory utilization), and potentially historical performance data from similar pipeline executions. A rich state representation is crucial for enabling context-aware adaptation.

The action space, *a*, would encompass the set of decisions the DRL agent could make to influence pipeline execution. Potential actions include selecting the next task or batch of tasks for execution, allocating specific types or quantities of resources to tasks, dynamically choosing a subset of tests based on perceived risk and relevance derived from the state, and adjusting the level of parallelism for applicable stages like testing. The nature of these actions (discrete or continuous) would guide the selection of an appropriate DRL algorithm.

The design of the reward function, *r*, is paramount as it steers the agent's learning towards desired pipeline behaviors. A well-designed reward function would likely incorporate negative rewards proportional to pipeline stage duration and computational resource consumption, thereby incentivizing efficiency. Critically, significant penalties would be associated with quality regressions, such as critical test failures or simulated post-deployment issues potentially linked to overly aggressive test skipping. This ensures the agent learns to balance speed and cost savings against the imperative of maintaining software quality and reliability.

Suitable DRL algorithms, such as Deep Q-Networks (DQN) for discrete actions or policy gradient methods like Proximal Policy Optimization (PPO) (Schulman, Wolski, Dhariwal, Radford, Klimov, 2017) for potentially continuous actions (e.g., resource quantities), could be employed. The agent would learn its policy through interaction with a representation of the CI/CD environment. This interaction could occur within a high-fidelity simulation environment modeled after real-world pipelines or, cautiously, within a sandboxed version of a live pipeline environment over time. Simulation offers a safe and efficient means for initial training and exploration before any potential deployment.

The proposed DRL framework offers a potentially transformative approach to CI/CD optimization. By moving beyond static configurations and predefined heuristics, a DRL agent could introduce a level of adaptiveness previously unattainable. The theoretical advantages stem from the agent's ability to learn complex correlations between the state (code changes, resource status, history) and optimal actions (scheduling, resource allocation, test selection).

Anticipated benefits include significantly reduced average pipeline cycle times, leading to faster developer feedback and increased deployment frequency. Dynamic resource allocation based on real-time needs and predictions could lead to substantial reductions in computational costs, particularly in cloud environments. Crucially, by incorporating quality metrics into the reward function, the framework is designed to achieve these efficiencies without compromising the integrity of the

software validation process. The agent could learn nuanced risk assessments, running comprehensive tests for high-risk changes while safely optimizing tests for minor, low-risk modifications.

However, realizing this potential involves overcoming significant challenges. Developing a sufficiently accurate simulation environment or safely implementing online learning in a production pipeline requires considerable effort. The design of the state representation must capture relevant information without becoming intractably large. Crafting an effective reward function that accurately reflects organizational priorities regarding speed, cost, and risk is non-trivial and may require iterative refinement.

The 'cold start' problem, where a new agent lacks experience, needs mitigation strategies, potentially involving pre-training on historical data or using simpler policies initially. The computational cost of training sophisticated DRL agents can be substantial. Furthermore, the inherent 'black box' nature of deep learning models can make the agent's decision-making process difficult to interpret, potentially hindering trust and adoption. Addressing explainability is an important consideration for practical deployment.

Future research directions stemming from this framework are numerous. Empirical validation through rigorous simulation studies and pilot deployments in real-world settings is essential. Comparative studies of different DRL algorithms for this specific application domain would be valuable. Exploring hierarchical RL, where different agents manage different pipeline aspects, or multi-agent RL for coordinating multiple pipelines, could address scalability. Integrating more advanced predictive models directly into the state or reward mechanism holds promise. Techniques for transfer learning could accelerate agent training across different projects or pipeline evolutions. Research into interpretable AI methods tailored to DRL in this context would also be highly beneficial.

## Conclusion

This paper has outlined a conceptual framework for leveraging Deep Reinforcement Learning to achieve adaptive optimization of CI/CD pipelines. By formulating pipeline orchestration as a sequential decision-making problem within an MDP structure, we propose that a DRL agent can learn dynamic policies for task scheduling, resource allocation, and intelligent test selection. This approach holds the potential to significantly improve upon traditional static and heuristic methods by continuously adapting to the changing context of software development.

The anticipated outcomes include reduced pipeline latency, optimized resource utilization, and maintained quality assurance standards, ultimately contributing to more efficient and responsive software delivery processes. While practical implementation presents challenges related to simulation, reward design, training, and interpretability, the theoretical advantages offered by DRL's adaptive learning capabilities suggest this is a highly promising avenue for future research and development in DevOps automation and software engineering practices. Further investigation and empirical validation are warranted to fully explore and realize the potential of intelligent, adaptive CI/CD pipelines.

## References

1. Chowdhury, S., & Rao, A. (2018). Reinforcement Learning based Dynamic Resource Allocation for Cloud Native CI/CD Pipelines. *arXiv preprint arXiv:1811.01858*.
2. Elbaum, S., Malishevsky, A. G., & Rothermel, G. (2002). Test case prioritization: A family of empirical studies. *IEEE Transactions on Software Engineering*, 28(2), 159-182.
3. Humble, J., & Farley, D. (2010). *Continuous Delivery: Reliable Software Releases through Build, Test, and Deployment Automation*. Addison-Wesley Professional.
4. Kerzazi, N., & Adams, B. (2015). Large-Scale Analysis of Build Systems. *Proceedings of the 31st IEEE International Conference on Software Maintenance and Evolution (ICSME)*.
5. Levine, S., et al. (2016). End-to-end training of deep visuomotor policies. *Journal of Machine Learning Research*, 17(39), 1-40.

6. Machalica, M., et al. (2019). Predicting Build Failures at Facebook. *Proceedings of the 41st International Conference on Software Engineering: Software Engineering in Practice (ICSE-SEIP)*.
7. Marijan, D., & Gotlieb, A. (2017). Software Test Case Prioritization and Selection: A Survey. *Information and Software Technology*, 89, 1-19.
8. Mnih, V., et al. (2015). Human-level control through deep reinforcement learning. *Nature*, 518(7540), 529-533.
9. Orso, A., & Rothermel, G. (2014). Software testing: A research assessment. *ACM Computing Surveys (CSUR)*, 46(4), 1-47.
10. Rahman, M. M., & Zulkernine, M. (2019). Challenges and Opportunities in Optimizing CI/CD Pipelines: A Systematic Literature Review. *Proceedings of the IEEE International Conference on Software Maintenance and Evolution (ICSME)*.
11. Schulman, J., Wolski, F., Dhariwal, P., Radford, A., & Klimov, O. (2017). Proximal Policy Optimization Algorithms. *arXiv preprint arXiv:1707.06347*.
12. Shahin, M., Ali Babar, M., & Zhu, L. (2017). Continuous Integration, Delivery and Deployment: A Systematic Review on Approaches, Tools, Challenges and Practices. *IEEE Access*, 5, 3909-3943.
13. Sutton, R. S., & Barto, A. G. (2018). *Reinforcement Learning: An Introduction*. MIT Press.

Received: 06.02.2025
Accepted: 19.05.2025

DOI: https://doi.org/10.36719/2789-6919/45/258-261

**Mirzə Talıbov**
Azərbaycan Texnologiya Universiteti
magistrant
https://orcid.org/0009-0001-4692-0481
mirzetalibov7@gmail.com

# Kompüter şəbəkələrində informasiya təhlükəsizliyi mexanizmlərinin işlənməsi və tətbiq edilməsi

## Xülasə

Tədqiqatın aktuallığı. Müasir dövrdə rəqəmsallaşmanın dinamik inkişafı fonunda kompüter şəbəkələri həm fərdi istifadəçilərin, həm də iri təşkilatların gündəlik fəaliyyətində mühüm rol oynayır. Elektron idarəetmə sistemləri, onlayn maliyyə əməliyyatları, bulud texnologiyaları, rəqəmsal ticarət, məsafədən idarə olunan biznes və təhsil modellərinin geniş tətbiqi informasiya resurslarının təhlükəsiz, etibarlı və əlçatan şəkildə mübadiləsini zəruri edir. Tədqiqatın məqsədi. Araşdırmanın əsas məqsədi müasir kompüter şəbəkələrində informasiya təhlükəsizliyi ilə bağlı aktual risk və təhdidləri müəyyənləşdirmək, bu təhdidlərin qarşısını almaq üçün təsirli müdafiə üsullarını işləyib hazırlamaq və onların real mühitdə tətbiq imkanlarını təhlil etməkdən ibarətdir. Tədqiqatda istifadə olunan metodlar. Tədqiqatın məqsəd və vəzifələrinə uyğun olaraq araşdırmada analitik yanaşmalar, simulyasiya modelləri, statistik təhlillər və ümumi analiz metodları tətbiq olunmuşdur. Tədqiqatın informasiya bazası. Tədqiqat zamanı yerli və xarici mütəxəssislərin elmi araşdırmalarından, Azərbaycan Respublikası Statistika Komitəsinin rəsmi məlumatlarından, eləcə də xarici mənbələrdən toplanmış statistik göstəricilərdən istifadə olunmuşdur. Tədqiqatın məhdudiyyətləri. Tədqiqatın əsas məhdudiyyəti kifayət qədər resursların əldə olunmaması ilə bağlıdır.

Tədqiqatın elmi yeniliyi və praktiki nəticələri. Tədqiqatın elmi yeniliyi ondan ibarətdir ki, müasir kompüter şəbəkələrində tətbiq olunan informasiya təhlükəsizliyi mexanizmləri kompleks şəkildə araşdırılmış, onların funksional imkanları ilə yanaşı performansa təsiri də sistemli şəkildə təhlil edilmişdir. Mövcud yanaşmalardan fərqli olaraq, bu tədqiqatda təhlükəsizlik tədbirlərinin yalnız texniki səmərəliliyi deyil, həm də real şəbəkə şəraitində şəbəkə keçirmə qabiliyyətinə, gecikmə müddətinə və resurs sərfiyyatına təsiri müqayisəli şəkildə qiymətləndirilmişdir. Nəticələrin istifadə oluna biləcəyi sahələr. Tədqiqatın praktiki əhəmiyyəti ondan ibarətdir ki, real şəbəkə şəraitində kompüter şəbəkələrində informasiya təhlükəsizliyinin təmin olunması üçün istifadə edilən müxtəlif müdafiə mexanizmlərinin səmərəli seçimi, uyğunlaşdırılması və tətbiqi üzrə tövsiyələr hazırlanmışdır.

***Açar sözlər:*** *texnologiya, kompüter, informasiya, təhlükəsizlik, şəbəkə*

**Mirza Talibov**
Azerbaijan Technological University
Master student
https://orcid.org/0009-0001-4692-0481
mirzetalibov7@gmail.com

# Processing and Application of Informatıon Security Mechanisms in Computer Networks

## Abstract

Relevance of the research. In the modern era of rapidly growing digitalization, computer networks play a crucial role in the activities of all groups, from individual users to large organizations. The widespread use of services such as e-government systems, online banking, cloud technologies, e-commerce, remote business, and education makes the secure, reliable, and efficient exchange of information resources essential.

 

Objective of the research. The main goal of the research is to investigate existing risks and threats to information security in modern computer networks, to develop effective security mechanisms to counter these threats, and to assess the possibilities of applying these mechanisms in practical environments.

Using research methods. In accordance with the objectives and tasks of the research, analytical, simulation, statistical, and analytical methods were employed.

Information base of the research. Scientific works of local and foreign researchers and economists, official data from the Statistics Committee of the Republic of Azerbaijan, and statistical data obtained from foreign sources were used.

Limitations of the research. The main limitation lies in the insufficient availability of resources.

Scientific novelty and practical results of the research. The scientific novelty of the research lies in the comprehensive examination of information security mechanisms used in modern computer networks, with a systematic analysis not only of their functional capabilities but also of their impact on performance. Unlike existing approaches, this research comparatively evaluates the impact of security measures not only on technical effectiveness but also on network throughput, latency, and resource consumption in real network conditions.

Areas of practical application of the results. The practical significance of the research lies in the development of recommendations for the efficient selection, adaptation, and implementation of various mechanisms to ensure information security in computer networks under real network conditions.

***Keywords:*** *technology, computer, information, security, network*

## Giriş

Rəqəmsallaşmanın sürətlə inkişaf etdiyi müasir dövrdə kompüter şəbəkələri istər fərdi istifadəçilər, istərsə də iri müəssisələrin gündəlik fəaliyyətində əvəzolunmaz yer tutur. Elektron hökumət, onlayn maliyyə xidmətləri, bulud əsaslı platformalar, e-ticarət, məsafədən idarə olunan biznes və təhsil kimi sahələrdə bu texnologiyaların geniş tətbiqi, informasiya resurslarının etibarlı, təhlükəsiz və rahat şəkildə paylaşılmasını zəruri edir. Nəticə etibarilə, informasiya təhlükəsizliyi texnoloji infrastrukturun əsas elementlərindən birinə çevrilmişdir.

Eyni zamanda, kibertəhlükələrin – zərərli proqramlar, DDoS hücumları, məlumat sızmaları və daxildən gələn təhdidlərin – artan miqyasda yayılması sübut edir ki, ənənəvi müdafiə metodları artıq mövcud risklərə cavab verməkdə yetərli deyil (Barrenechea, Jenkins, 2014). Bu səbəbdən, informasiya təhlükəsizliyinin təmin edilməsi üçün yeni mexanizmlərin hazırlanması və tətbiqi yalnız texniki sahədə deyil, həm də sosial-iqtisadi baxımdan əhəmiyyətli bir tədqiqat istiqaməti kimi çıxış edir.

İnformasiya texnologiyalarının sürətlə inkişaf etdiyi müasir dövrdə kompüter şəbəkələri gündəlik həyatın və iş fəaliyyətinin ayrılmaz bir hissəsinə çevrilmişdir (Galubitskaya, Zhigul'skaya, 2000). Ancaq bu inkişafla yanaşı, informasiya təhlükəsizliyi ilə bağlı risklər də artmış və onların idarə olunması mühüm bir məsələyə dönüşmüşdür. Kompyuter şəbəkələrində informasiya təhlükəsizliyi təhdidləri əsasən, məlumatların sızması, icazəsiz girişlər, zərərli proqram hücumları, şəbəkə zəiflikləri və kibertəhlükələr ilə bağlıdır. Bu təhdidlər həm fərdi istifadəçilər, həm də hökumət orqanları və özəl sektor təşkilatları üçün ciddi risklər yaradır. İnformasiya təhlükəsizliyinə qarşı hücumların nəticələri yalnız maliyyə itkiləri ilə məhdudlaşmır, həmçinin şirkətlərin və təşkilatların nüfuzunun zədələnməsi, məxfi məlumatların ifşası və kritik sistemlərin təhlükə altına düşməsi ilə də nəticələnə bilər (Qasımov, 2007, s.192).

İnformasiya təhlükəsizliyinin idarə edilməsi, texnoloji mühitlərin dəyişməsi ilə zamanla inkişaf etmiş və təşkilatların fəaliyyətlərinin vacib bir hissəsinə çevrilmişdir. Bu inkişaf üç əsas mərhələdən keçmişdir. İlk iki mərhələdə əsasən təhlükəsizliyin texniki və təşkilati yönləri üzərində dayanılıb, üçüncü mərhələdə isə informasiya təhlükəsizliyi korporativ idarəetmə və strateji qərarlarda mühüm bir element kimi qəbul edilməyə başlanmışdır (Mozanlı, 2005, s.160).

Xüsusilə, 2000-ci ildən sonra ortaya çıxan üçüncü mərhələ, informasiya təhlükəsizliyi anlayışına yeni perspektivlər gətirərək texniki standartlar, beynəlxalq sertifikatlaşdırma, standartlaşdırma, informasiya təhlükəsizliyi mədəniyyətinin qurulması və sistemlərin davamlı olaraq təhlil edilməsi kimi prinsipləri daxil etmişdir. Bu dövr göstərdi ki, informasiya təhlükəsizliyi yalnız texniki

tədbirlərlə məhdudlaşmır, həm də təşkilatların strateji məqsədləri və iş prosesləri ilə sıx əlaqəlidir (Aslanbakan, 2016, s.148).

Kriptoqrafiya qədim dövrlərdən başlayaraq məlumatları qorumaq və gizlətmək məqsədilə istifadə olunan mühüm bir elmdir. İnformasiya təhlükəsizliyinin əsas prinsipləri olan məxfilik, bütövlük və autentifikasiya ilə sıx əlaqəli olan bu sahə, texnologiyanın inkişafı ilə daha geniş və mürəkkəb sahələrdə tətbiq edilməyə başlanmışdır. Xüsusilə, internet və rəqəmsal texnologiyaların yayılması ilə kriptoqrafiya, məlumatların təhlükəsiz mübadiləsini təmin etmək, müəllif hüquqlarını qorumaq və icazəsiz girişin qarşısını almaq üçün əsas vasitəyə çevrilmişdir. Kriptoqrafik yanaşmalar, riyazi modellərə və mürəkkəb alqoritmlərə əsaslanan müxtəlif metodları əhatə edir, və bu sahədə riyaziyyat, kompüter elmləri, elektronika və optika kimi elmlərdən geniş istifadə olunur.

İnformasiya texnologiyalarının sürətlə inkişafı və rəqəmsal transformasiya prosesi nəticəsində kompüter şəbəkələri bizim gündəlik həyatımızın və fəaliyyətimizin vacib bir hissəsinə çevrilmişdir. Bu şəbəkələr vasitəsilə məlumatlar ötürülür, saxlanılır və işlənilir. Lakin, informasiya texnologiyalarının geniş istifadəsi ilə birgə kibertəhlükəsizlik riskləri də artmışdır. Məlumatların qorunması, icazəsiz girişlərin qarşısının alınması və sistemlərin sabit şəkildə işləməsinin təmin edilməsi, informasiya təhlükəsizliyi sahəsində ən vacib məsələlərdən biridir. Kompüter şəbəkələrində informasiya təhlükəsizliyi anlayışı, məlumatların bütövlüyü, düzgünlüyü və təhlükəsizliyinin təmin olunmasına yönəlmiş tədbirlər və mexanizmlərin məcmusudur. Bu sahədə tətbiq olunan metodlar arasında şifrələmə alqoritmləri, autentifikasiya və identifikasiya sistemləri, firewall texnologiyaları, antivirus və casus proqram təminatına qarşı həllər mövcuddur (Abdulragimov, Kagramanzade, 2002).

Kriptoqrafiya, məlumatları qorumaq üçün şifrələmə üsullarını araşdıran sahə, kriptoanaliz isə bu şifrələmə əməliyyatlarını pozmağa çalışan sahədir. Hər iki istiqaməti birləşdirən elm sahəsinə kriptoqrafiya adı verilir. Bu sahə əsasən riyaziyyat, kompüter elmləri və rabitə texnologiyaları ilə əlaqəlidir və informasiya təhlükəsizliyinin təmin edilməsində mühüm rol oynayır (E-Government in European Union, 2018). Kriptoqrafiyanın başlanğıcda yalnız dövlət, diplomatik və hərbi sahələrdə tətbiq olunduğu və bağlanmış bir elm sahəsi olaraq inkişaf etdiyi qeyd edilir. Lakin 1960-cı illərin sonlarından etibarən, bankçılıq və kommersiya sahələrində istifadəyə maraq artmışdır. Bu dəyişiklik açıq tədqiqatların yaranmasına və kriptoqrafiya sahəsində yeni yanaşmaların inkişafına yol açmışdır. 1970-ci illərdə baş verən iki mühüm hadisə, kriptoqrafiyanın sürətli inkişafını təmin etmişdir (Əlizadə, Musayev, Əliyev, 2016).

İnformasiya texnologiyalarının inkişafı ilə yanaşı, məlumatların təhlükəsiz şəkildə ötürülməsi və qorunması müasir kibertəhlükəsizlik sahəsinin əsas prioritetlərindən birinə çevrilmişdir (Varakin, 2001). Təhlükəsizlik protokolları, məlumatların ötürülməsi zamanı məxfilik, bütövlük və autentifikasiyanın təmin olunmasına xidmət edən texnologiyalardır. Bu protokollar hücumlardan, icazəsiz girişlərdən və məlumatların sızmasından qorunmaq üçün tətbiq edilir. Bu sahədə ən geniş istifadə olunan təhlükəsizlik protokollarına aşağıdakılar daxildir: IPSec (İnternet Protokolu Təhlükəsizliyi) – Şəbəkə səviyyəsində məlumatların şifrələnməsi və autentifikasiyasını təmin edən bir protokoldur. VPN (Virtual Özəl Şəbəkə) texnologiyaları isə geniş şəkildə istifadə edilir (Chadwick, 2006).

Müasir informasiya cəmiyyətində kompyuter şəbəkələri, həyatın bütün sahələrində əlaqə qurmaq və məlumat mübadiləsi aparmaq üçün əsas vasitə olmuşdur. Texnologiyanın sürətli inkişafı və rəqəmsallaşmanın artması ilə, fərdi istifadəçilərdən tutmuş iri təşkilatlar və dövlət qurumlarına qədər hər bir şəxsin gündəlik fəaliyyəti kompüter şəbəkələri üzərindən həyata keçirilir. Bu şəbəkələr, insanlara bir-biri ilə əlaqə qurmaq, məlumatları mübadilə etmək, çoxsaylı prosesləri uzaqdan idarə etmək və avtomatlaşdırmaq imkanı verir (Kolachalam, 2002).

## Nəticə

Müasir dövrdə, informasiya təhlükəsizliyi mexanizmlərinin inkişafı və onların effektiv şəkildə tətbiqi kompüter şəbəkələrinin təhlükəsiz və fasiləsiz işləməsi üçün vacib və qaçılmaz bir tələbdədir. Rəqəmsallaşmanın sürətlə irəliləməsi və kibertəhlükələrin gündən-günə artması ilə ənənəvi təhlükəsizlik metodları artıq kifayət etmir. Buna görə də, təhlükəsizlik sahəsində kompleks, elastik və qabaqlayıcı yanaşmaların tətbiqi daha da önəmli hala gəlmişdir. Tədqiqatın nəticələri olaraq aşağıdakı əsas məqamlar qeyd olunmuşdur: Texniki təhlükəsizlik mexanizmləri – şifrələmə, firewall,

IDS/IPS, SIEM, VPN, MFA və s. şəbəkə mühitində mövcud olan real təhdidlərə qarşı təsirli müdafiə təmin edir (European Union, 2017).

Bu sahənin əsas məqsədi informasiya sistemlərini həm daxili, həm də xarici təhlükələrdən qorumaq, icazəsiz müdaxilələrin qarşısını almaq, zərərli fəaliyyətləri müəyyən etmək və potensial riskləri idarə etməkdir. Bu bölmədə informasiya təhlükəsizliyi anlayışına ümumi yanaşma verilir, onun əsas mahiyyəti, prinsipləri, kateqoriyaları, mövcud təhdid növləri və onlardan qorunma üsulları açıqlanır. Eyni zamanda, müasir dövrdə informasiya təhlükəsizliyinin əhəmiyyətinin artması, bu sahədə qarşılaşılan problemlər və onların aradan qaldırılması yolları da araşdırılır.

Şəbəkə təhlükəsizliyində tətbiq olunan vasitələr – şifrələmə üsulları, firewall sistemləri, IDS/IPS texnologiyaları, identifikasiya və autentifikasiya metodları, eləcə də təhdidlərin aşkarlanması platformaları – müxtəlif təhlükə səviyyələrinə qarşı mübarizə aparmaq və sistemlərin təhlükəsizliyini təmin etmək məqsədi daşıyır. Bu fəsildə kompüter şəbəkələrində istifadə edilən əsas təhlükəsizlik alətləri geniş şəkildə araşdırılır, onların funksional imkanları, texniki çətinlikləri və sistem performansına olan təsirləri təhlil edilir. Bundan əlavə, müasir təhlükəsizlik yanaşmaları, bulud əsaslı texnologiyalar və risk əsaslı müdafiə modelləri də bu fəsildə tədqiqat predmeti kimi təqdim olunur.

VPN texnologiyaları, autentifikasiya üsulları, IDS/IPS sistemləri və digər oxşar vasitələrin həm real, həm də simulyasiya olunmuş şəbəkə mühitlərində fəaliyyət mexanizmləri və sistemin ümumi performansına təsirləri araşdırılır. Təhlil prosesində əsas diqqət gecikmə vaxtı, ötürmə sürəti, resursların istifadəsi və cavab müddəti kimi texniki göstəricilərə yönəlir. Bununla yanaşı, təhlükəsizliklə məhsuldarlıq arasında optimal tarazlığın təmin olunması, müasir təhlükəsizlik həllərinin elastik və genişlənə bilən arxitekturalarda tətbiqi, eləcə də təşkilatlar üçün faydalı və tətbiq edilə bilən tövsiyələrin hazırlanması bu fəsildə önəmli müzakirə mövzuları sırasındadır.

## Ədəbiyyat

1. Aslanbakan, E. (2016). *Bilgi güvenliği ve uygulamalı hacking yöntemleri*. Pusula.
2. Abdulragimov, K.F., Kagramanzade, G.A. (2002). O tekhnologii IPTelefoniya. *"Uchenye zapiski AZTU",* № 3.
3. Alizade, M.N., Musaev G.R., Aliev E.B. (2016), *Upravlenie sovremennymi informatsionnymi sistemami.* MSV.
4. Akhundov, B.M. (2000). *Osobennosti razvitiya svyazi v Azerbaidzhane*. Chashyogly.
5. Arcaris, C., Sood, R. (2013). *User Survey Analysis: IT Spending Priorities in Government, Worldwide, 2013*. Gartner, Inc.
6. Barrenechea M. J., Jenkins T. (2014), *E-Government or Out of Government*. First Printing.
7. Best practices in eGovernment: on a knife-edge between success and failure. (2008). European Journal of ePractice.
8. Chadwick A. (2006). *Internet Politics: States, Citizens and New Communication Technologies.* Oxford Univ.
9. *Department of Economic and Social Affairs (UNDESA).* (2018). United Nations.
10. *E-Government in European Union*. (2018).
11. European Union. (2017). Government Benchmark 2017: Taking stock of user-centric design and delivery of digital public services in Europe. *Final background report*. Volume 2.
12. Galubitskaya, E.A., Zhigul'skaya, G.M. (2000). *Ehkonomika svyazi.* Radio i svyaz.
13. Kolachalam, S. (2002). *An Overview of E-Government*. University of Bologna.
14. Qasımov, V.Ə. (2007). *İnformasiya təhlükəsizliyi: kompüter cinayətkarlığı və kiberterrorçuluq*. Elm.
15. Mozanlı, İ.A. (2005). *Söz azadlığı və informasiya təhlükəsizliyi: milli və beynəlxalq təminat*. UniPrint.
16. Varakin L.E. (2001). *Global'noe informatsionnoe obshchestvo: kriterii razvitiya i sotsial'no-ehkonomicheskie aspekty*. MAK.

Daxil oldu: 11.02.2025
Qəbul edildi: 21.05.2025

